*Bu kitab “**Mikayıl Müşfiq.** Həyat sevgisi”* (*Bakı, Yazıçı, 1988*) *və “**Mikayıl Müşfiq.** Əsərləri. 3 cilddə”* (*Bakı, Səda, 2004*) *nəşrləri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni, redaktoru və müqəddimənin müəllifi: **Gülhüseyn Hüseynoğlu**

**894.361 - dc 21**
**AZE**
**Mikayıl Müşfiq. Seçilmiş əsərləri.** Bakı, “Şərq-Qərb”, 2004, 352 səh.

...Əgər Mikayıl Müşfiq olmasaydı, yeni dövrün Azərbaycan ədəbiyyatı bütöv olmayacaqdı. Əgər Müşfiq olmasaydı, bu ədəbiyyatda onun yeri güllə yarası kimi boş və ağrılı olacaqdı.

Müşfiqi bütün nəsillərə sevdirən və adını yaşarı edən onun ürəkdən gələn səmimiyyət dolu poeziyasının xalq ruhu ilə bağlılığı, doğma Azərbaycanımızı böyük məhəbbətlə tərənnüm etməsi, qəlbləri ehtizaza gətirməsidir. Şairin gözəl hiss, axıcılıq və məna zərifliyi ilə zəngin, dilə-dodağa yatan, tez də yadda qalan şeirlərinin çoxu nəğmədən seçilmir.

Müşfiq ədəbiyyat tariximizdə də, xalqımızın yaddaşında da, hamımızın qəlbində də otuz yaşlı çılğın, romantik, xəyallar dünyasında qanadlanan bir gənc kimi qalacaq. Ömrümüzün hər çağında alovlu şairin büllur kimi saf, axıcı misralarını xatırlayacaq, nəğmələrini dinləyəcəyik, amma içəri dünyamızda daima onun tükürpədici harayını da eşidəcəyik...

Unudulmaz şairimizin seçmə əsərlərindən ibarət olan bu kitabda müxtəlif illərin şeirləri, poemaları, eləcə də uşaqlar üçün şeir və mənzum nağılları toplanmışdır.

**ISBN 9952-418-15-6**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# MÜŞFİQ ƏNƏNƏSİ YAŞAYIR

Mikayıl Müşfiqi bütün nəsillərin müasiri edən, həmişə sevdirən onun ürəkdən gəlmiş, səmimiyyətlə dolu poeziyasının xalq ruhu ilə bağlılığı, Azərbaycanımızı böyük məhəbbətlə tərənnüm edib sevdirməsi, vətəndaşlığı, cazibə qüvvəsilə oxucuların qəlbini ehtizaza gətirməsidir. Səmimiyyətlə dolu poeziyası barədə şair özü müasirlərinə müraciətlə yazıb:

Yazmaram ürəyim sizi anmasa,
Sizin eşqinizlə alovlanmasa;
Burdaca el durub məndən sordu ki:
Gözdən yaş çıxarmı ürək yanmasa?

Qönçə açılarmı, bahar olmasa?
Şölə titrəyərmi, ruzgar olmasa?
Bu nəğmə ruhumdan qoparmı bilməm,
Mənə ilham verən dostlar olmasa?

Söz yox, ürəkdən yazdığındandır ki, ürəklərdə yaşayır Müşfiq. Axı bu onun bir şair kimi ən böyük arzusu idi:

Hər kəs bilir həyatın sonu ölümdür,
Ah bu qəmli dəyişmə yaman zülümdür.
Şerim! Bu gülünc oyun bəllidir yarın,
bizi də bəklər,
Sən də öl mənim kimi, fəqət məzarın
olsun ürəklər!

Vətəndaş şairdi, cəsarətliydi, uzaqgörəndi Müşfiq. Milli musiqi alətlərimizdən olan tarın konservatoriyada tədris olunması qadağan ediləndə, "İnqilab və mədəniyyət" jurnalı özünün 1929-cu il ikinci nömrəsindəki "Tar konservatoriyadan çıxarıldı" sərlövhəli xəbərində: "Azərbaycan Dövlət Konservatoriyasını qüvvətləndirmək məqsədilə AXMK bir çox qərar qəbul etmişdir. Bu qərarlara görə məcburi dərs kursu olan tarın öyrənilməsi konservatoriyanın bütün dərəcələrində tədris planlarından götürülür və konservatoriya yanında olan Şərq orkestrosu ləğv olunur" yazanda Müşfiq sinəsini qabağa verdi: məşhur "Tar" şerini xalqına bəxş elədi, tarın şöhrətini bir az da qaldırdı:

Oxu, tar, oxu tar!..
Səsindən ən lətif şeirlər dinləyim.
Oxu, tar, bir qadar...
Nəğməni su kimi alışan ruhuma çiləyim.
Oxu, tar!

Səni kim unutar?
Ey geniş kütləmin acısı, şərbəti –
Alovlu sənəti.

“Tar” şeri vətəndaş şairin uzaqgörənliyini göstərməklə bərabər, həm də sənətkar cəsarətini numayiş etdirən əsərdir:

Çoxları üzünə durdular,
Könlünü qırdılar.
...Üstündən bir qara yel kimi əsdilər,
Səsini kəsdilər.
Daşlandı çəkənlər nazını,
Beləcə qırdılar aşığın sazını.

Müşfiq 20-ci illərin axırı, 30-cu illərin əvvəlində klassiklərimizə etinasızlığı görəndə qələmə sarıldı, “Yeni il” şerində dahi lirik haqqında ürək sözlərini bəyan elədi:

Yazalım, özümüzü öyməyəlim,
Füzuliyə dəyməyəlim.

Axı Müşfiq əsl varis kimi şifahi xalq ədəbiyyatımızı dərindən sevmiş, klassik ədəbiyyatımıza böyük məhəbbət bəsləmiş, bunların yaxşı ənənələrindən həmişə öyrənməyin, yeni şəraitdə onları davam və inkişaf etdirməyin ən ardıcıl tərəfdarlarından olmuşdur.

Müasirini özünü dərk edən, mühitinin hadisələrindən baş çıxaran, “xalqilə titrəyən, xalqilə gülən...” görmək istəyən Müşfiq “Alqış varlığını duyan insana!” misrasını heç də təsadüfi yaratmamışdı. Özünü dərk edən insanın əzəli, əbədi, nəcib sifətlərindən biri əməyə məhəbbətdir. Məhz əməyə bağlılıq insanı torpağı layiqilə dərk etməyə, ona səcdə etməyə gətirib çıxarır. Şairə görə əmək insana güc verir. İnsan gücü ilə yaşayışını asanlaşdırır, gözəlləşdirir. “Özündən alışan, özündən yanan, – hər sabah hamıdan erkən oyanan, iş başına qoşan” insanları şair bəxtiyar hesab edir.

Milli musiqi alətlərimizin göz bəbəyi kimi qorunması və əmək mövzuları ilə yanaşı, M. Müşfiq insanın böyüklüyü, maarif, müəllim nüfuzu, səfil-sərgərdan həyat keçirən uşaqların himayəyə alınması, məktəblərə cəlb olunması, qayğıkeşlik, qaynar gənclik və onun düzgün tərbiyə olunması, vətən və onun tanınmasında, yüksəlməsində iz qoyan şəxsiyyətlərin ucalığı, vətəndaşlığı, sənət və sənətkar, həyat eşqi, təkliyin acı aqibəti, təmiz, saf məhəbbəti, ülviliyi və s. məsələlər haqqında da yazmış, tutarlı poetik sözünü demişdir.

Günlərim keçməyir ancaq əməklə,
Xəyalım göyləri seyr eyləməklə
Buludlar ömrümün karvanı olur,
Fikrim o karvanın sarvanı olur.

Sanıram ulduzlar həmvətənimdir,
Demək, yer də mənim, göy də mənimdir,
Hüzurumla cahan nə bəxtiyardır.

Axırıncı misraya diqqət yetirək: insan yox, cahan insanın hüzurunda olmaqla özünü bəxtiyar saymalıdır. Bu, Müşfiq poeziyasında insana verilən qiymətin ən böyük təzahürü deyil də bəs nədir?

Füzuli yüksəldi
əsrinin fövqünə
Sığmadı dəhası
Bağdadın üfüqünə.

***

O güldü-ağladı, ağladı-güldü,
Gülüşü hıçqırdı, fəryadı güldü.
Onun pərvazına pərvaz çatarmı?
Güclü avazına avaz çatarmı?

***

Altındaydı sözün səmənd atları,
Çapanda titrərdi göyün qatları.
O ki söz atından tərpəndi düşdü,
Sanki şerimizin bir bəndi düşdü.

Bu misralar torpağımızın, mədəniyyətimizin, dilimizin inkişafında, tanınmasında müəyyən izləri, payları olan dahi sənətkarlarımız Füzuli, Sabir, Cəfər Cabbarlı kimi şəxsiyyətləri qabarıq şəkildə nəzərimizdə canlandırır, onları bir az da sevdirir.

Yaxud onun Kefli İskəndərin dili ilə Cəlil Məmmədquluzadə yaradıcılığının şah damarını necə də oxucular qarşısında nümayiş etdirdiyinə diqqət yetirək:

"Ölüb – a!" – deyərək qışqırır cahan,
Qalxmaz Fərhad kişi ağır yuxudan...
Ac başım, dinc başım, səbr, təvəkkül,
Çırpınmaq bilməyən xəstə bir könül...
Qaranlıq qəlbimiz günəşə həsrət,
Qurulmuş dirilik baxt üzərində,
Basmış ruhumuzu kəsalət bizim,
Vurur nəbzimizdə ətalət bizim.

Ədəbiyyatın, sənətin bitib-tükənməyən, tükənməyəcək, əzəli və əbədi mövzusunda, sənətkarların bütün zamanlarda, dönə-dönə müraciət etdikləri bəşəri mövzuda, məhəbbət mövzusunda Müşfiq də yazıb-yaratmışdır. Onun bu əsərlərində məhəbbətin sehri, ucalığı, sevdanın "sərin atəş"liliyi, ümid

qapılarına dikilən baxışlar, sevən gəncin ürəyini dərindən tutub qoparan sevgilisinin gül əllərindən ərkyana giley-güzarı, şikayəti, "hicran ümidinə" qalmaq, hicrandan nicat gözləmək, qısqanclığın qəlbi yaxıb-yandırması, qəlbdə fırtınalar qoparması, məhəbbətin neçə-neçə çaları, rəngi, acısı, şirini öz ifadəsini tapmamışdırmı?! Emosional, musiqili, şairanə ifadəsini! "Bir də baxsan mənə" şerində belə bir bənd var:

Baxışın qəlbimi incitmişdir,
Bu baxışdan, bu duruşdan əl çək.
Bir də baxsan mənə, iş bitmişdir;
Bir də baxsan mənə, fikrim dönəcək.

Az qala sevən gəncə demək istəyirsən: çox özündən demə, fikrin dönməyəcək, hələ sevdiyinin baxışı, duruşu sənin qəlbini çox incidəcək, sən də dözəcək, dözəcəksən. Başqa əlacın yoxdur. Axı sən sevirsən. Sevirsən!

Qısqanclıq haqqında çox yazılıb, yazılır və yazılacaq. Müşfiqin lirik qəhrəmanı da sevdiyini qısqanır. Yaman qısqanır. Kimə? Nəyə görə? "Yenə o bağ olaydı!" şerinə müraciət etsəniz bunu görərsiniz:

Yenə o bağ olaydı, yenə o qumlu sahil,
Sular ötəydi dil-dil.
Saçın kimi qıvrılan dalğalara dolaydım,
Dalıb ilham alaydım.
Əndamını həvəslə qucaqlarkən dalğalar,
Qəlbimdə qasırğalar,
Fırtınalar coşaydı, qısqanclıqlar
doğaydı,
Məni hirsim boğaydı;
Cumub alaydım səni dalğaların əlindən,
Yapışaydım belindən;
Xəyalımız üzəydi sevda dənizlərində,
Ləpələr üzərində
İlhamımın yelkəni zərrin saçın olaydı,
Sular xırçın olaydı.

Necə də təbiidir, səmimidir, insanidir, ürəkdən gələndir bu sözlər. Ürəkdən gəldiyi üçün də təsir edir, birbaşa ürəklərə gedir. Ayrı cür mümkün də deyil.

Gözəl təbii mənzərələr, lirik peyzaj yaratmaq ustasıdır Müşfiq.

Ulduzlar ətrafa nur səpələr,
Bir bölük uşaqdır şən ləpələr
Onların əlində top kimi ay.
Sevgilim, başında ağ kəlağay
Sahilə gəl,
Seyr elə gəl.

“Dəvət” şerindən götürülən bu parçada hər şey göz qabağında deyilmi? Hələ buradakı istiarəyə (ləpələrin uşaqlara oxşadılması), bənzətməyə (ayın topa oxşadılması) diqqət edin. On dörd gecəlik ayın (topa oxşadıldığı üçün bizdə bu təsəvvür yaranır) ziyası altında titrəşən şən ləpələr (burada da həm bədii təyin, həm də istiarə var, çünki insana xas keyfiyyət – şənlənmək ləpələrə aid edilib), sahilə gələn ağ kəlağayılı sevgili, onu ürəyi çırpına-çırpına gözləyən lirik qəhrəman... Necə də yadda qalan, zövqü oxşayan, ruha qida verən lövhə.

Bu kiçik şeir parçasında həm də onu görürük ki, şairin poeziyası bədii təsvir vasitələri ilə necə zəngindir. Bu zənginliyi görmək xatirinə bir misal da gətirim:

Yuxusuz bir beyin – susuz bir bulaq,
Çalğısız əyləncə – tüstüsüz ocaq;
Yelkənsiz bir gəmi – ruhsuz bir cəsəd.
Budur azadlığa yabançı millət!

“Azadlıq dastanı” poemasından götürülən bu dörd misrada, əvvəla, ustalıqla yaradılmış altı bədii təyin var; ikincisi, üç tutarlı bənzətmə diqqəti cəlb edir; üçüncüsü və ən tutarlısı: yuxusuz beyinlə susuz bulaq, çalğısız əyləncəylə tüstüsüz ocaq, yelkənsiz gəmiylə ruhsuz cəsəd azadlığa yabançı olan azadlıq uğrunda mübarizə aparmayan millətlə yanaşı qoyulur, dördüncü bənzətmə meydana çıxır və bütün bunlar şair fikrinin daha qüvvətli çıxmasında müstəsna əhəmiyyət kəsb edir.

Müşfiq yeni poetik formalar yaratmaq cəhətində də öz qələm yoldaşlarından seçilən, fərqlənən şairlərimizdəndir. Qeyd edim ki, narahat bir sənətkar olan Müşfiq onu məşğul edən, düşündürən, nifrət və məhəbbətinə, kədər və sevincinə səbəb olan məsələlərin ecazkar ifadəsi üçün həmişə çırpınmış, rəngarəng mövzulu, məzmunlu poeziyasında əlverişli poetik formaların da olmasına çalışmış, bu sahədəki axtarışını heç vaxt dayandırmamışdır.

Ənənənin rolunu çox düzgün başa düşən, novatorluğu layiqincə qiymətləndirən şair istər şifahi xalq şerinin, istərsə də klassik şerin poetik formalarına həmişə həssaslıqla yanaşmış, bunların çoxunu: qoşma, gəraylı, bayatı, oxşama, rübai, məsnəvi, üçlük, dördlük (mürəbbe), beşlik (müxəmməs), altılıq (müsəddəs), yeddilik (müsəbbe), səkkizlik (müsəmmən), tərcibənd, tərkibbənd, müstəzad və s. poeziyasında işlətmişdir. Şairin Qərb şeirinin poetik forması olan sonetə biganə qalmadığını, sonetlər yazdığını və yeri düşdükcə özünün də yeni poetik formalar yaratdığını qeyd etsəm müəllifin bu sahəyə nə qədər böyük əhəmiyyət verdiyi aydınlaşır.

Şair özünəməxsus bir formada yazdığı “Tərtərhes nəğmələri” və “Mingəçevir həsrəti” əsərlərində üçlükdən ibarət 15 misralıq bənd yaratmışdır ki, burada birinci üçlüyün iki misrası öz aralarında qafiyələnir, üçüncü misra isə

o biri üçlüklərin üçüncü misraları ilə həmqafiyə olur. "Tərtərhes nəğmələri" əsərində bir bəndi gözdən keçirək:

Hər yamacda bir tamaşa,
Könlüm uçur dağa-daşa
Seyr etdikcə təbiəti.
Dağ başında duman gözəl,
Bu qaralan orman gözəl,
Könlümdədir məhəbbəti.
Kim der sənə yaman, dünya,
Sən gözəlsən aman, dünya,
Ey günəşin əmanəti!
Keçmişin göz yağmurundan
Ürəyinin çamurundan
Seçməliyiz şikayəti.
Ey əzəldən yığın-yığın,
Ölən, qalan insanlığın
İlk cənnəti, son cənnəti!

Şairin poeziyası vəzn cəhətindən də maraqlıdır. O, demək olar ki, heca vəzninin bütün bölgülərində (üç hecalıdan tutmuş iyirmi hecalıya qədər), əruz vəzninin əsasən, həzəc və rəməl bəhrlərində əsərlər, eləcə də sərbəst şeirlər yazmışdır.

... Tar"ı və eləcə də "Zəfər səsləri", "Gecə çeşməsi" şeirlərini tam heca vəznində yazılmış şeirlər kimi götürmək olmur. Bu şeirlər heca vəzninin hər ritm vahidi üç təqtidən ibarət formasında olsalar da, tam heca deyillər, zahiri görünüşünə, misralarda hecaların qeyri-bərabərliyinə görə bu şeirlər sərbəstə oxşasalar da, sərbəst də deyillər. Bəs onda bu şeirlər hansı vəzndə yazılmışdır? Bu, Müşfiq icadıdır, heca ilə sərbəsti yaxınlaşdıran bir vəzndir. Müşfiq vəznidir və bu vəznin poeziya tariximizdə yeganə nümunələrini Müşfiq yaratmışdır. Ona qədər nə heca vəznində, nə də sərbəstdə yazılan əsərlər arasında belə nümunələrə təsadüf olunmamışdır. Elə düşünürəm ki, bundan sonra Müşfiq poeziyasının və eləcə də Azərbaycan ... şerinin vəznlərindən danışılarkən heca vəzni, əruz vəzni, sərbəst vəzn istilahları ilə yanaşı, Müşfiq vəzni istilahını da işlətmək lazım gələcəkdir"...

Sözü məharətlə yerində işlədəndir, sözə hakimdir Müşfiq.

Atamız dünyadan eh dedi getdi,
Tez sönən ömrünə meh dedi getdi.
Gül əkdi, vay dərdi cahan bağından,
Tökdüyü yaşlara şeh dedi getdi.

Mənalı səslərinlə şerim, incələş
bir kaman kimi!

Gecəm belə keçdi, səhərim gəlsin!
Dadıma sanballı sözlərim gəlsin!

Poeziyasında aforistik ifadələr kimi səslənən elə sanballı, elə mənalı misralar, beytlər var ki, bunların daşıdığı poetik fikir oxucular tərəfindən razılıq hissilə, sevinclə, ürəklərindən xəbər verirmiş kimi dərhal qəbul olunur. Məharətlə yaradılmış belə aforistik misraları, beytləri oxuyanda bədii sözün qüdrətinə, kəsərinə, təsirinə bir daha inanırsan.

Həyat həm gülməkdir, həm ağlamaqdır.

***

Zaman bir dərədir axıb dolanır,
Bəzən durulursa, bəzən bulanır.

***

Heyf, ömür qısa, arzu genişdir,
Kim bu qayğı ilə titrəməmişdir?

***

Bədbəxt bu dünyada tək yaşayandır.

***

Həyat ondan küsənləri incidər.

***

Cahan ki solmayan bir bağça-bağdır,
Burda rəvamıdır gülmədən ölmək!
Yazıq o şəxsə ki qaraqabaqdır,
Nə qədər yaraşır insana gülmək!

"Sənin gülüşlərin" şerinin bu sonuncu bəndinin axırıncı beyti xalq arasında artıq zərb-məsəl kimi işlənməkdədir.

Poeziyası dedikcə musiqilidir, ahəngdardır, emosionaldır Müşfiqin:

Yağış yağır, rəqs eyləyir gur damlalar,
Sıra-sıra, inci-inci nur damlalar.
Göydə iki qara bulud çatılaraq,
İldırımlar şaqqıldayır şaraq-şaraq,
Quşlar uçur yuvasına fırıl-fırıl,
Şırıldayır navalçalar şırıl-şırıl.

Mikayıl Müşfiq bir sənətkar olaraq daima öz sənətini inkişaf etdirmək üçün çırpınmış, özündən narazı qalmış, poetik duyğularının, böyük arzularının ifadəsi üçün münasib, uyğun bədii təsvir vasitələri tapmağa çalışmış, yeni forma axtarışlarını bir an belə olsun dayandırmamışdır. "Sabir üçün" şerində o, ürəkdən gələn səmimiyyətlə nə gözəl demişdir:

Neyləyim ki, fikrim kimi qəşəng olsun nəğmələrim?
Parlaq bahar səmasilə həmrəng olsun nəğmələrim?
Sevinclərlə uğuldayan bir zəng olsun nəğmələrim?
Bir işıqlı, bir ətirli çələng olsun nəğmələrim?

Əlbəttə, şairin özünə müraciətən dediyi bu sözləri onun sənət əhli qarşısında qoyduğu tələb kimi də başa düşmək olar. Müşfiq söz yox, düşündürücü poetik suallarının cavabını yalnız gecəli-gündüzlü işləməkdə, "bir kəlmə bulmaqçın əzaba, zəhmətə qatlaşmaqda", "sanballı sözləri dadına" çağırmaqla tapmış, bədii yaradıcılıqda istedadla bərabər gərgin əməyin də böyük rolunu qiymətləndirməyi unutmamışdır. Zəhmətsevər şair özünə nə rəva bilmişdisə, bunu qələm yoldaşlarına da məsləhət görmüş, onları sənət aləmində xarüqələr yaratmağa səsləmişdir:

Ey bizim dünyanın söz deyənləri,
Ruhun dodağına tutun neyləri.
Bir nəğmə çalın ki, heyrətdə qalsın
Bütün dövrlərin müğənniləri.

Müşfiq belə bir şair olmuşdu və belə bir şair olaraq da qalır. Axı o, yalnız cismən aramızda yoxdur, poeziyası isə yaşayır, öz işini görür, poetik təsirini göstərir. Bəli, müasir Azərbaycan poeziyasını Müşfiqsiz təsəvvür etmək mümkün deyildir. Bu, şairin sağlığında da belə idi, indi də belədir və belə də olacaqdır.

Bu gün şerimizin ümumi vəziyyətindən, yaxud ayrı-ayrı şairlərin yaradıcılığındakı bu və ya digər nöqsandan danışılarkən haqlı olaraq M.Müşfiq şeri əsl poeziya nümunəsi kimi örnək göstərilir. Şairin qələm yoldaşı Rəsul Rza 1978-ci ildə yazırdı: "Müşfiq yaradıcılığından danışarkən bugünlü şerimizin bir sıra aktual məsələləri haqqında bəzi fikirlər söyləmək lazım gəlir.

Təbiətə aludəlik, təbiət mənzərələrinin əbədi gözəlliklərini təkrar-təkrar vəsf etmək, standart sevgi motivləri, sızıltılar, intim məhəbbət macəraları bugünlü poeziyamızın kəsərliliyini, vətəndaşlıq pafosunu azaldır, ayrı-ayrı gənclərimizin yaradıcılıq yönünü arzu olunmayan bir yola çəkir.

Belə fikir yarana bilər ki, mən təbiət təsviri, sevgi, ülfət məsələlərindən uzaqlaşmağı təbliğ edirəm. Yox, yüz dəfə yox. Müşfiqin şerinə diqqət edin. Bu şeirdə təbiət mənzərələri, ülfət motivləri yoxdurmu? Var, ancaq necə? Belə şeirlərin çoxunda yeni duyum, orijinal, təzə söz var:

Fikrim, hissim, xəyalım o qədər yüksəldi ki,
Mənə elə gəldi ki,
Bizlərdən əvvəl nə göy, nə yer, nə torpaq olmuş...

– deyə Müşfiq onu əhatə edən aləm, təbiət, varlıq haqqında elə yazmışdır ki, bu sətirlər yalnız var olan aləm haqqında deyil, onun ümumi dəyəri, bəşəri mənası haqqında düşünməyə yol açır.

Bu poetik deyim Müşfiqə aiddir, onundur, ona məxsusdur.

Təbiət mənzərəsini qələmə alırsan, sevgidən, məhəbbətdən yazırsansa, öz yolunu tap, özünəməxsusluğun görünsün". Haqlı idi xalq şairi Rəsul Rza.

Müşfiqin nümunə göstərilməsi, ondan öyrənməyə çağırış mətbuatımızda tez-tez səslənir. Bu da, söz yox, bir daha onu göstərir ki, Müşfiq ənənəsi yaşayır, yeni-yeni gələn ədəbi nəsillərə bir örnək olur. Qırxıncı illərin ikinci yarısında ədəbiyyata gələn ədəbi nəslin nümayəndəsi Əliağa Kürçaylı şairin 70 illiyi qeyd olunarkən necə də ürəkdən gələn səmimiyyətlə, vurğunluqla Müşfiqə, onun həmişəyaşar poeziyasına münasibətini bildirmişdi:

"Qalsaydı, indi onun yetmiş yaşı tamam olurdu. Lakin kimsə onu yetmiş yaşında təsəvvür edə bilməz. Dahilərin dahiliyinə inanırıq, ancaq bir zaman uşaq və gənc olduğuna inana bilmirik. İnana bilmirik ki, Şandor Petefi, Lermontov və Yesenin saçı-saqqalı ağarmış qoca kişiyə çevrilə bilərdilər. Axı biz A.Eynşteynin və L.N.Tolstoyun, Füzulinin və Sabirin də nə zamansa sütül bir cavan olduqlarına inanmırıq, daha doğrusu, bunu təsəvvür belə edə bilmirik. Dahilərin dahiliyi, böyüklərin böyüklüyü, yaşından asılı olmayaraq, şöhrət zirvəsinə çatdığı anda həkk olunub qalır, təsəvvürlərin aydın ekranında əbədiyyətə köçürülür.

Qərinələr keçəcək, bir-birini əvəz edən nəsillər poeziya ümmanına baş vurarkən onunla rastlaşacaq, saçları gecənin gözündən qara, gözləri işıq gölü cavan dahini elə bu yaşda görəcək, poeziyasındakı yaşlılara məxsus müdrikliyi, heyrətlə, təəccüblə dərk edəndə deyəcəklər: "Bu yaşda bu təb, bu ilham, bu dərinlik? Görünür, o zamanlar insanlar qocalmırmış, elə beləcə cavan olurmuşlar, ömürlərinin axırına qədər..."

Həqiqi poeziyaya zaval yoxdur. O yaşayır, həmişə də yaşayacaq.

***Gülhüseyn Hüseynoğlu***

## ÖLKƏM

Dünyamızı seyr etdim min dürlü həvəslərlə,
Gördüm coşuyor dillər pək nəşəli səslərlə,
Baxdım doludur yarlar şən qəlbili kəslərlə,
Pək şad olaraq güldüm abad olan ölkəmdə.
Qəmlərdən, ələmlərdən azad olan ölkəmdə.

Baxdım ki, duman görməz yüksəkləri billuri,
İnsanları matəmsiz, istəkləri billuri,
Dağlar, ovalar gülşən, hər bir yeri billuri,
Hər şey gülüyor gördüm, pək şad olan ölkəmdə.
Qəmlərdən, ələmlərdən azad olan ölkəmdə.

Qış getdi ölümlərlə, ölkəmdə bahar vardır,
Bağlarda gözəlliklər, şən qəhqəhələr vardır,
Sevdalı könüllərdə sevdikləri yar vardır,
Daim sevişirlər, bax, məzdad olan ölkəmdə.
Qəmlərdən, ələmlərdən azad olan ölkəmdə.

Vicdanları pək şəffaf, insanları nurani,
Müşfiq, bilə bildinmi, aləmdə şu dövranı?!
Qaplar yarın artıq sağ dünyaları ürfanı.
Hər yer güləcək, nura mötad olan ölkəmdə.
Qəmlərdən, ələmlərdən azad olan ölkəmdə.

## ANA

Ana dedim, ürəyimə yanar odlar saçıldı,
Ana dedim, bir ürpəriş hasil oldu canımda,
Ana dedim, qarşımda bir gözəl səhnə açıldı,
Ana dedim, fəqət onu görməz oldum yanımda.

Ana, ana!.. Bu kəlmənin vurğunuyam əzəldən,
Onu gözəl anlatamaz düşündüyüm satırlar.
Ana olmaz bizə hər bir “yavrum” deyən gözəldən,
Çünki onun xilqətində ayrıca bir füsun var.

Başqa aləm yaşamadım böylə gözəl biçimdə,
Onu kimsə gözəlliyin cilvəsində yaratmış;
Ana, ana... çiçəkli bir fidandır ki, içimdə
Ta əzəldən kök salaraq, ürəyimdə boy atmış.

O fidanı bəzi vaqıt istiyorum çəkərək,
Qoparayım ürəyimdən, fəqət onda varlığım
Sızıldarkən, sanki bir səs qopub incə və titrək
Bir lisanla söylüyor ki: – Mənə dəymə, yazığım!

Çünki səni mən bəslədim, mən böyütdüm, oxşadım,
Söylədiyin sözlər ki var beşiyinin üstündə
Oxuduğum türkülərin kölgəsidir, övladım!
Mənə məxsus vərəqlər var hər kitabda, hər dində.

Nə doğru söz yazıqlar ki, görməmişəm onu mən,
Diyorlar ki, Müşfiq, xəstə bir tifildin, ananı
Baban kimi soyuq əllər qucağına çəkərkən,
Yalnız acı fəğanların titrədirdi hər yanı.

İndi mənə hər kəs: – Anan, baban varmı? – söyləsə,
Diyorum ki, – qapılmadan bir xülyaya, bir hissə –
Olan olmuş, keçən keçmiş, indi məni yaşadan
Bir müqəddəs, bir səmimi əməlim var, tapdığım.

İnandığım bir qiblə var, o da hər gün, hər zaman
Yorulmayan qollarımla, düşünərək yapdığım
Bir aləmdir, bir aləm ki, səmaları qıpqızıl,
Yüksəkləri, alçaqları, fəzaları qıpqızıl!

## SEVGİLƏR

Sevgi vardır ki, dodaqlarda açar güllərini,
Sevgi vardır ki, bir az qar kimi, ruzgar kimidir.
Sevgi vardır oxudur qəlbidə bülbüllərini,
Böylə bir sevgi mənim ruhumu oxşar kimidir.

Sevgi vardır ki, uzaqdan bizə parlaq görünür,
Ona yaxlaşmayalım, çünki o zülmətlə dolu.
Sevgi vardır ki, düşər yerlərə daim sürünür,
Öylə bir sevgi də min dürlü xəyalətlə dolu.

Sevgi vardır ki, bahardan bizə güllər gətirir
İçi zəqqum və zəhər, qoxlama, qəlbin qanayar.
Sevgi vardır üzü xoş, daxili bir qorxulu yar.

Sevgi vardır bizə çox dadlı əməllər gətirir,
Fəqət həpsində qaranlıq gecələr kölgəsi var.
Sevgilərdə qarışıq bilməcələr kölgəsi var.

## DÜDÜK SƏDALARI

Səhərlər uyar-uymaz üfüqlər bir xoş rəngə,
Tıxanır qulağımız sinirli bir ahəngə,
O zaman xəyalımız düdüklər coşmuş sanır.

Bir çılğın ürpərişlə bu hayqıran düduklər,
Boynumuza həyatın ağır yükünü yüklər,
Nəhayət hər tərəfdə gediş-gəliş başlanır.

Toplaşır əməkçilər iş başına həvəslə,
– Üfüqlər bürünürkən fəcirdən bir kömləyə, –
Düdüklərin əmrini yerinə yetirməyə.

– Çağırınız bizləri kəsilməyən nəfəslə
Düdüklər! Yorulmadan çağırınız bizləri,
Təqib edəcəyiz bir hərəkətlə sizləri.

Ey hər düdük ruhundan ruha axan sədalar,
Ürəklərdə şən əmək şamı yaxan sədalar,
Sizinlə makinanın düyünləri açılır.

Boruların ağzından qaçıb uzaqlaşınca,
Sürətli dalğalarla siz bizə yaxlaşınca,
İçimizə həyatın cilvələri saçılır.

Düdüklərin müsəlsəl uzun çağırışları,
Havada bu görünməz səslərin yarışları
Sayəsində çözülür sükunətin bağları.

Bəzən təbəssümlərlə cilvələr bulursunuz,
Bəzən tutqun gözlərin şahidi olursunuz
Ey düdük sədaları! Ey düdük sədaları!

## XALI

İşçi qız, toxuduğun o divar xalısında
Heyran oldum ürəkdən işlədiyin sənətə,
Bir gözəllik əsəri verdin bəşəriyyətə.

Böyüklüyün çoxuna məchul ikən əvvəllər,
Vurduğun naxışların, qız, ən bahalısında
Meydana çıxdı bu gün səndəki böyük hünər.

Qabarlanan o incə, o nazik barmaqların
Birinin təəssüflə cəlb etsə nəzərini,
Alqışlar tutacaqdır o baxışın yerini.

İnan ki, qonaqların önünə çıxsa yarın,
Xalında rəngi-ruhu solmayan o ulduzlar,
Həm sənin, həm ölkənin göylərini yaldızlar.

Sən ey Şərqin əməkçi qızı, çırpın, qanadlan!
Bürüyəcək şöhrətin bu sənət meydanını,
Ola bilməz çəkdiyin zəhməti gözdən salan.

Birsən sənət yolunda candan keçən ərlərlə,
Meydana buraxdığın böylə şah əsərlərlə
Ucaldırsan ölkəmin şöhrətini, şanını.

## ÜSYANA BAŞLA

Əsrlərcə şərqlilərə kəsildin acı,
Sən ey vəhşi, sən ey azğın imperyalizm!
Gəl Çindəki üsyanlara baxma qıyqacı,
Düşün, bu gün onlarda var böyük bir əzm.

Qızıl Kanton orduları alovlu bir dağ
Kimi salmış varlığına atəş, zəlzələ,
Şanxay qalsın, Nankinə də etdin əlvida,
İnqilabın zərbəsilə gələrək dilə.

İndi coşqun bir dənizdir hər işçi Çində,
Çəkil geri, qorxutamaz kimsəyi qüvvən,
Sən get hərbin yollarını Kantondan öyrən!

Deyirlər ki, Nankin yanır alov içində,
Yarın sönər zalımların tökdüyü yaşla.
Salam sənə, Çin işçisi, üsyana başla!

## DÜŞÜNCƏ

Günəş ipək tellərinin sarımtraq rəngini
Səhər çağı dalğa-dalğa hər tərəfə yayırkən
Gətirirəm xəyalıma bir al bayraq rəngini.

Düşünərək derəm, bu da, əvət bir sabah erkən
Bir dünyanın göylərində günəş kimi hər səhər
Parlayaraq ölkələrə sərpəcəkdir şəfəqlər.

Kiçik quşlar cəh-cəh vurub qonurkən ağaclara
Hər bir nəğmə qardaşlaşmaq səsləridir sanıram.
Şən gecələr ay işığı düşürkən yamaclara
Şuraların ellərdəki kölgəsini anıram.

Dilbər sular dalğasına dənizlərdə, göllərdə
Oxuyaram yeni həyat sevdasilə çırpınan,
Əskiliyə üsyan edən könülləri hər zaman.

Yorğun-arğın karvanilə səhralarda, çöllərdə
Bəzi gecə yarı yolda qalanları dinlədim,
– Hankı şeydir yolçulara nicat verən? – söylədim.

Birağızdan dedilər ki, dan yeri, dan ulduzu!
Sordum, bundan gözəli yoxmu parlayanların?
Dalğalandı qarşımda o vaqıt bu diyarın
Al bayrağa sığınmış könül açan ulduzu.

## HƏSRƏTLİ QARI

Kürdüstan dağları döşündə bir yol,
Bir yol ki, upuzun, bir yol ki, qıvrıq,
Zümrüd ətəklərlə qapalı sağ, sol.

Ayrıcında yolun bir qarı durmuş,
Alnı düşüncəli, qolları sarqıq,
Yetim baxışlarla boynunu burmuş.

Baxır nəvazişlə ulu dağlara,
Özündən ixtiyar, mutlu dağlara,
Çulğamış üzünü sirli bir hüzn.

Varlıq xəbərsizdir onun halından,
Günəşsə ağ saçlı bürclər dalından
Əl atıb, üzünü açır gündüzün.

Bilinməz qəlbinin daşıdıqları,
Yolçəkən gözlərlə bu məhzun qarı
Doğrudan görəsən kimləri gözlər?

Ey yolçu, ey çoban, ey havalı quş!
Sizi bəkləməkdən artıq yorulmuş
O qaynayan, axan diqqətli gözlər.

İştə bir araba gəlir uzaqdan
Müsəlsəl, qarışıq gurultularla.
Bir tunc əksi-səda qarşıkı dağdan
Söyləyir: “Qarını, durma, xəbərlə!”

Yerində diksinib ixtiyar qadın
Titrəyir, əsərək yarpaq vücudu.
Almaqçın üstünü bir köhnə yadın,
Bir fayton qarının önündə durdu.

Faytonda oturmuş yorğun nəfərlər
Bizim kənd və qəza işçiləridi.
Söydilər: – Ana! Nə var, nə xəbər?
Qadın yolçulara ruhunu gərdi.

Qovmaq istər kimi tutqun fikrini,
Bir kirpik çalaraq, başını silkdi.
Yolçular süzüncə biri-birini,
Qadın gözlərini onlara dikdi...

Könül dəftərini vərəqləyincə
Saçıldı boşluğa xalis incilər.
Başından keçəni incədən-incə
Açdı yolçulara, dedi müxtəsər:

– Ay bala! On iki il bundan qabaq bir
İmansız ayrılıq mana qurdu dam.
Fələk dedikləri daşürəkli pir
Parlaq gündüzümü eylədi axşam.

O zaman bir oğlum ayrıldı məndən,
Oxumaq istəyib getdi Tiflisə,
Sanki ruhum uzaq düşdü bədəndən,
Qapıldı varlığım bir acı hissə.

Dedim: – Getmə, bala, hənuz uşaqsın,
Dünyanın işini bilən tapılmaz;
İstərmisən göylər başımda çaqsın?
İnsan olan bəndə hissə qapılmaz.

Beş sənə oxudun, kifayət edər,
Umudum sənədir, vaz keç səfərdən.
Mənə kim baxacaq? Olma dərbədər.
Nə qədər yalvarıb-yaxardımsa mən

Zərrəcə sözlərim etmədi təsir
Oğlumun döyünən ürəkciyinə.
– Doğrudan analıq bir şey deyildir, –
Cavan xatırına dəyməyib yenə,

Titrəyə-titrəyə söylədim: – Oğul!..
Get, artıq, səfərin uğurlu olsun!
Tanrı niyazını eyləsin qəbul,
Yolun al yanaqlı güllərlə dolsun!

Mən onu canımdan artıq sevərdim,
Bir an düşərdisə gözümdən iraq.
Artardı həsrətim, artardı dərdim,
Hər zərrədən onu edərdim soraq.

Can bağımda qüdsi bir ağac əkdim,
Nədənsə dadmadım bir şey barından.
Mən onu gözləmiş, gözləyəcəkdim
Yayın istisindən, qışın qarından.

Buraxdı Tiflisi, sonra, deyirlər,
Bir başqa dəryada yelkən açdı o.
Bir yavru quş kimi düşdü dərbədər,
Bilməm baş götürüb hara qaçdı o?

Bu ucsuz-bucaqsız ellərə sordum,
Sordum dənizlərə, coşdu dalğalar.
Salxım-salxım əsən yellərə sordum,
Gəzdirdim dərdimi diyarbadiyar.

İçimdə qüssədən bir xəzinə var,
Könlüm bir adadır qəm dəryasında.
Açmasam dərdimi, kim bilir nə var
Ömrümün qaranlıq macərasında?

Könlüm dayanmadı, falçıya getdim,
Çəkdi dırnağıma qərib bir şəkil;
O şəklə bir qədər tamaşa etdim,
Qarşımda bir xəyal olundu hasil.

Əvət, dırnağımda gördüm oğlumu,
Həp eyni paltarda, eyni biçimdə.
Derkən falçı mana: – Övladın bumu?
Bir ilan qıvrıldı sanki içimdə.

– Şahsuvar, Şahsuvar! – deyib ağladım,
İçimdə sızladı bir yanıq kaman.
Darğın sular kimi coşub çağladım,
Gözümdən od çıxdı, başımdan duman.

Şahsuvardan bir az kiçik oğlumu
Əsgəran davası aldı əlimdən.
O gündən ixtiyar, xəstə könlümü
Dünyaya xoş baxan görməmişəm mən.

Sonra dava düşdü, çevrildi dünya;
Bunu məndən gözəl siz bilirsiniz.
Dəyişdi kökündən dağ, dəniz, qaya,
Dəyişdi hər qədəm, dəyişdi hər iz.

Biz qonşumuz olan ermənilərlə
Yaşardıq bir yerdə canciyər kibi.
Kim tapdı davaya bilməm vəsilə,
Bilməm "böyüklər"in nəydi mətləbi?!

Dağıldı ölkələr, talandı ellər,
Sonalar oylağı tarımar oldu.
Qəm tərənnüm etdi sevdalı dillər,
Ellərin şənliyi xakisar oldu.

Bizim halımıza tutuldu göylər,
Buludlar belini büküb ağladı.
Qəlbimi yatağan duyğular kəsər
Zehnimdə gəzdikcə keçmişin yadı.

Hər duman bir ahdı, hər səs hıçqırıq
O zaman ruhumuz gəlirkən dilə.
İndi yeddi sənə oldu ki, artıq
Qəlbimiz döyünür öz qaydasilə.

İndi, ey bu yoldan ötən yolçular!
Axı, burda mənim kimim, nəyim var?
İndi mən bu halda neyləyim, ey dost?
Qoy sizə dərdimi söyləyim, ey dost!

Derlər, Şahsuvarım gəlmiş yaxında,
Xoş günə çıxarmış onu ayrılıq.
Hər kəs öz keyfində, öz damağında,
Yerimdən oynadır məni ayrılıq.

Derlər, Şahsuvarım bir böyük kimi
İşləyir Bakının mədənlərində.
Mənsə hicranını ağır yük kimi
Çəkirəm ömrümün "rəhgüzərində".

Hər gələndən onu soraqlayırkən
İxtiyar canımdan bezgin çağımda.
Keçən günlərimi varaqlayırkən
Gülməyim də gəlir, ağlamağım da.

İndi bu göydəki buludlar kimi,
Qarşınızdan ötən bir ruzgar kimi
O dilbər çay kimi burdan keçərkən,
Salamlar aparın oğluma məndən.

Söyləyin: yolunu sənin gözləyir
Həsrətli gözlərlə dərdli bir qarı.
Həp səni gözləyir, səni özləyir
Qəlbinin qərarsız çırpınışları!

Yolçular dedilər: – Qulaqlarımız
Yaxşı xəbərlərə açıqdır, ana!
Sifarişlərini yerli-yerində
Gedib çatdırarıq, yəqin, oğluna.

Dinləyib qarını incədən-incə,
Azacıq bir zaman söhbət etdilər...
Aradan bir xəfif ruzgar əsincə
Getdilər, yolçular varıb getdilər.

– Yolçu yolda gərək! – deyə, atlara
Dəydi ilan kimi iti qamçılar.
Təkərlər torpağı cırmaqlayınca,
Gözlərdən itmişdi bizim ixtiyar.

İxtiyar gözlərdən itmişdi, ancaq
Yolçular da varıb getmişdi. Ancaq,
– Leyla, Leyla! – deyə ətrafa pəsdən
Bir çoban türküsü yayılmadaydı...

Sanki ilham alıb varlıq bu səsdən,
Canlılar qəşş edib bayılmadaydı,
Cansızlar uyqudan ayılmadaydı,
ayılmadaydı!..

## DİLƏNÇİ

Sərt, soyuq bir qış gecəsi... Səma bəyaz, yer bəyaz,
Uğuldayan küləklərlə sarsılmada soqaqlar.
Hər kimin ki, qanadı var çovğun olsa darılmaz,
Fəqət yenə bu soyuqdan qısılmada soqaqlar.

Gələn də var, gedən də var, mən də varam bu gecə,
Təbiətin dəhşətləri titrədiyor ətrafı.
Bir bucaqda yorğun titrək əllərilə kəmənçə
Çalan zəif bir ixtiyar inlədiyor ətrafı.

Yanında bir yavrusu var, yorulmadan çalıyor.
Kamançanın simlərindən qopan yanıq havalar
İncəldikcə, hər kəs ondan acı bir həzz alıyor.

Yellər dəxi vəlvələli ötüyorkən bu yoldan,
Yavaş-yavaş səslərini dəyişdirib bir qadar,
Onlar dəxi uzaqlarda, ağlıyorlar könüldən.

– Ey ixtiyar, sən ey zalım, məzlum dolu illərin
Ürəklərə kədər saçan, ələm verən töhfəsi!
Acı dolu, əzab dolu, zülüm dolu illərin
Mərhəmətsiz fırçalarla qaralanmış lövhəsi!

Sənin artıq vaxtın ötmüş,
Səni dövran səfil etmiş.
Fəqət onu, o sevimli qızcığazı,
Olma razı,
Qış dondursun, günəş yaxsın.
Burax onun əllərini,
Burax onun hörülməmiş tellərini.
Qoy buraxsın
Oxuduğu yanıq, xəstə havaları.
Burax, barı
Çağlıyorkən yurdumuzda yaşayışın selləri,
Bəlkə öpsün gözlərini səadətin yelləri.

## TORPAQ VƏ TRAKTOR

Qranit damarları ey çəlik qanlı torpaq,
Paltarı sərt dəmirdən əli qalxanlı torpaq,
Nə der sinəndə meydan sulayan, hayqıran div?

Der ki, mənim varlığım uyuşub yatan deyil,
Dişləri tez oynayan xış deyil, kotan deyil,
Köksünü bıçaqlayan, qollarını qıran div!

Gəl yeni cəlladını – bu nəri dinlə, torpaq,
Onun çıxardığı gur səsləri dinlə, torpaq.
Ayaq iti, baş yekə, saçlar buluddan siyah...

Möhtəşəm gövdəsilə keçərkən üzərindən,
Neçə neştər iz qaldı qartlaşan içərindən,
Bizim div çınlatarkən qulaqlarında qah-qah?..

## TOZANAQ

Yenə toz... aman, bu toz buludları nə istər
Bilməm səndən, ey Bakı, sən ey atəş diyarı!
Sən birdən dirçəlib, birdən boy atan şəhər,
Üzərindən qovsana bu iynəli ruzgarı!

Neçin soqaqlarından yolçular ötən zaman
Saçlarını oxşamaz lətif əsən küləklər?
Neçin yanıq çöllərin bitirməmiş bir fidan?
Neçin sinəni öpməz gözü yaşlı çiçəklər?

O dilbərin... qaşları altındakı güllər, ah,
Rəvamıdır bulansın zəhərli tozlarınla?

O bir yaz səhərindən daha şux olan nigah[1]
Rəvamıdır sıxılsın hər acı ruzgarınla?

Buna səbəb mənmiyəm, yoxsa keçmişin oğlu?
Yoxsa səni bu hala salmış qoca təbiət?
Bu söz düzmü, doğrumu, bu əsrin mətin oğlu
Diyor: – Xayır, deyildir məndən uca təbiət!

Hər şey bu bir cüt qolun əsiriykən, niçin də
Bu günahı üstünə atalım təbiətin?!
İstəsəydi daima gül yarpaqlar içində
Bəsləyərdi cismini o keçmiş cəmiyyətin.

Fəqət onlar yanmadı, əkmədilər bir ağac,
Bir bağ salmadılar heç qum dolu çöllərində;
Bir yetimin halını andıran bu ehtiyac
Təmin olunur ancaq bu günün əllərində.

Tozlanmış, bir vərəmli kitab oxutdurmasın
Hər tozanaq sinəndə yaşayan bu gənc elə.
İstəməm, o küləklər pəncərəmi vurmasın
Sapsarı bir kölgənin qubarlı əllərilə!

Mən istərəm dörd yanın ormanlarla qapansın,
Nəfəs alıb verəsən göy yarpaqlar içində.
Mən istərəm gənc oğlun, mən istərəm gənc qızın
Gəzdikcə zövqə dalsın kölgə bağlar içində.

O zaman Vaqif kimi, şaqrayan Nədim kibi
Sayrıyaraq həvəslə kim eyləməz tərənnüm?
Onda hansı şairin hasil olmaz mətləbi
Ağaclıqlarda ellər eylədikcə təkəllüm?[2]

Onda iki tərəfdən mənə təsir edərsən,
Onda iki eşq ilə qəlbimi titrədərsən.

[1] *Nigah* – baxış
[2] *Təkəllüm* – müsahibə

Onda sinəndə bitmiş dalğalı otlarından,
Vərəqlərlə oxşanan qaynar zavodlarından
Alıb doyunca ilham,

Mən hər səhər, hər axşam,
Bağırarkən şerimi mən bar-bar üfüqlərə
Onda göy saçlarını oxşayan dadlı yellər,
Deyil dəmir qanadlı, ipək qanadlı yellər
Bəstələyib şerimi, qaçarlar üfüqlərə.

## GÜLÜŞLƏR

Gülüş vardır səslərinə tunc əkslər yapdırır,
Gülüş vardır könülləri ruzgarlara qapdırır.
Bəzi tikər könüllərdə alovlardan bir məbəd,
İllər boyu atəşinə insanlığı tapdırır.

Bürünərək çoxu ipək füsunlu bir çarşafa
Saçır büllur təbəssümlər, əyləncələr ətrafa.
O pərdəyi parçalasaq can atarız nəhayət
Və başlarız göz yaşları aləmini təvafa.

Gülüş vardır dodaqaltı, gülüş vardır müstəhzi,
Zəncirləyər uçanları halqalandıqca bəzi,
Bəzi sıcaq görüşlərə doğru yollar göstərir.

Fəqət onun gülüşləri bir qönçəyə yaslanan
Rəngsiz parlaq jalələrdən nümunədir, hər zaman
Gənc ömrümə yüksəlməkçin qanad verir, can verir.

## BİR LÖVHƏ

İştə səksən yaşında beli bükük bir qadın
Aylar, illər bilmədən qırmış qolun, qanadın.
Zaman çəkmiş canına gözlərinin nurunu,
Ömrü almış əlindən qəlbinin sürurunu.

Vücudunun son bahar yarpağından fərqi yox,
Dodağında bir gülüş, bir qaynayan şərqi yox.
Çöhrəsində pərişan buludların var əksi,
Əllərində sərinlik – bir məzar hədiyyəsi.
Əmmiş uzun illərin baharını, qışını,
Məclislərin bulunmuş nəşəsində, qəmində.
Bürümüş ən nəhayət kölgələr baxışını,
İndi gəzər xəyalı məzarlıq aləmində.
O yenə yaşamaqdan bıqmamış, usanmamış,
O yorğun, o ziyasız, o qüvvəsiz, o qamış
Vücudilə yenə də ömür sürmək istiyor,
"Ah nə olur bir az da gözlərim görsə!.." diyor.
Ey hənuz gəncliyinin dəmlərini yaşıyan,
Qəlbində gur dalğalı çağlayanlar daşıyan,
O səksən yaşlı qadın yaşamaq istiyorkən
Bilməm niçin həyatdan uzaqlaşmadasın sən?

## ƏYYAŞ

Ruzgar... çovqun, qar, ətraf əsim-əsim əsmədə,
Başlar köküsdə... lakin soqaqda bir qaraltı
Gərinib bükülmədə, şaxta onu kəsmədə,
Buzdan bir cam kəsilmiş ayaqlarının altı.

Durmadan söylənmədə o kəndi-kəndisilə
Alnının çuxurunda parlıyor iki məşəl.
Sağdan, soldan küləklər vurub üzünə sillə
Yıxmaq istiyor onu şəffaf dəmirdən bir əl.

Yox sözlərində məna, canında yox ixtiyar,
Qollar, bacaqlar həpsi qarışmış bir-birinə,
Əlvida etmiş ona şəxsiyyət, izzət, vüqar,
Düşmüş uğursuz, acı bir adətin girinə.

Sağ əlində bir şişə, sol cibində bir şişə,
Hankı böyük bir səbəb onu bu hala salmış?

Çəkmiş hankı bir əməl biçarəni bu işə,
Hankı təsadüfdən o, bu yaman günə qalmış?

Alnında bir bəyaz qəm, – bir dilənçi günündə –
Üzü günəşdən qızıl, içi qarlardan ağdır.
O, şimdi durdu yüksək bir binanın önündə,
Keçmişini yaşatmış bu evə baxdı... baxdı...

Qılınc kimi kəsici şaxtanın şiddətilə
İştə çürük bir ağac cansız uzandı yerə.
İçində bəslədiyi müvəbbəd qüdrətilə
Bir quşsa qanad açdı ağ çadralı göylərə.

Buram-buram qıvrılıb həmlə edincə ruzgar,
Bu əyyaş qaldırımdan üzüstə yerə düşdü.
Qəlbində son döyüntü, səsində xırıltılar
Bəyaz tənli daşlarla qucaqlaşdı, öpüşdü.

Əvət həyat dənilən bu döyüş meydanından
Basılmamış çıxacaq kimin varsa qanatı.
Əvət, kim şübhə etsə, qüvvətindən, canından
Ac soqaqlar əlində boğulacaq həyatı.

Kimdir bu ilan kimi sürünüb ölən adam,
Çökmüş kaşanələrin bacarıqsız oğlumu?
Nərdə onu yaşadan dünkü parlaq ehtişam,
Onu öldürən kəndi sinifinin yolumu?

## NİGAR

Eşq olsun o titrək baxışlarında
Açan çiçəklərə, açan güllərə.
Eşq olsun bu coşqun gənc yaşlarında
Açdığın səmimi şirin dillərə.
Sənsən şeri mənə ilham edən, yar,
And olsun tapdığın varlığa, Nigar!

Mən səni gördükcə böylə sərazad
Yorğun qanadlarım çırpınmaq istər.
Gəl keçən dəmləri etməyəlim yad.
Çalış varlığını aləmə göstər!
Sevincin üzündə olsun aşikar,
Gülsün bəslədiyin əməllər, Nigar!

Uf, andım keçmişi, yarıldı bağrım,
Çökdü gözlərimə süslü bir xəyal.
Qarışdı hafizəm, qazandıqlarım
Oldu bir uçurum, bir dərin məlal.
Gördüm qadınlığı möhnət əsiri,
Köləlik əsiri, minnət əsiri.

Çevirdim üzümü bu günə baxdım,
Könlümə bir bahar nəşəsi doldu.
Ey Şərqin gözəli, üzünə baxdım,
Qəlbimə bir çocuq həvəsi doldu.
Gördüm qadınlığı kitab əsiri,
Ülviyyət əsiri, rübab əsiri.

Bu gün gülümsədi əsirlər boyu
Bir bulud ardında qaralmış üzün.
Bu gün buraxaraq çəhli, uyquyu,
Səsləndi qəlbində canlanan hüzün.
Sən atdın çarşafı, dərdin azaldı,
Bürünmək uğursuz keçmişə qaldı.

Deyirlər sarılıb diləklərinə,
Zəhmətə məftunsan, bir aşıq kimi.
Əmək bağçasının çiçəklərinə
Əllərin dolaşır sarmaşıq kimi.
Bəzən süzülərək gözlər, o gözlər
Yol çəkib uzaqdan nə xəyal özlər?

Doğrudur, şerimin ürəyində, yar,
Çırpınır hüznlü xəfif bir qanat.
Ey div addımlarilə yüksələn diyar,

Fikrini xalqımın zövqilə parlat!
Çünki mən deyiləm yalınız müqəssir,
Məni dərdə salmış o köhnə əsr.

Qələm coşdu, sözüm qaldı ürəkdə;
Odur ki, şerimin dəyəri yoxdur.
Oxuyan gülərək söyləyəcək də
"Müşfiqdə şairlik əsəri yoxdur!"
Xoş gündür çıxalım üz-üzə, Nigar!
Sən nə söyləyirsən bu sözə, Nigar?

## GÜLNAZ

Yeni on dörd yaşa girmişdi bu yaz
Sarışın, nəşəli, xırçın Gülnaz.
O gəzinmişdi əzəldən başaçıq,
Yoxdu ruhunda sönüklük, varlıq.
Sadə quşlar kimi pərvasızdı,
Yerə sığmaz uçağan bir qızdı.
İbtidai savad almış bu sənə,
Say vurulmazdı sıcaq nəşəsinə...

Aradan keçmədi bir öylə zaman
Bu dönüş Gülnazı sarsıtdı haman.
Səslənib evdə uğursuz bir zəng,
Sardı ətrafı uzaq bir ahəng.
Elçilər gəldi təbəssüm edərək,
Dedilər: – "Ceyranı" lazım görmək;
Çünki bizlərdə onun ovçusu var.
Müxtəsər, elçi gələn arvadlar
Gördülər xoşladılar qızcığazı,
Baxdılar Gülnaza min kərrə azı.
Bilmədən öylə nişanlandı ərə,
Tutulub qaldı tükənməz kədərə.

Aradan keçdi nəhayət iki il,
İl deyil, hər biri bir dağ təki il.

Gülnaz artıq böyümüş pək məğrur...
Üz-gözündən saçılır şeir, qurur.
Dedi bir gün Gülnaz: – Yaxşı, ana,
Eybi yox mən ki, nişanlandım ona.

Söyləyirlər ki, onun yox savadı,
Bir yığıncaqda çəkilməzmiş adı.
Bir də çox köhnə fikir sahibidir,
Əski, pək əski adamlar kibidir.
Məktəbə getməyə qoymaz ki, məni;
Annə, bilməm ki, kim aldatdı səni.
Bu yamandır ki, eşitməzkən adın,
Məni sən gör kimə qoşdun, caladın!

Annəsi:

Bax, qızım, bax, olan olmuş, keçmiş;
Bax, qızım, yaxşı deyil məncə bu iş.
Doğru, yoxdur savadı, var parası;
Olma gəl annənə, yavrum, ası.
Gəl, quzum, sözlərimə bir qulaq as,
Çıxma yoldan, çox ayıbdır, Gülnaz!
Sənə göndərmiş ipək bir çarşaf,
Öylə çarşaf ki, camalın kimi saf.
Dur da bir sal başına, nazlı bacım,
Qalmasın bəlkə bu könlümdə acım!

Gecə səssizdi gülümsərdi qəmər;
Yoxdu heç şeydə siyahlıqdan əsər.
Vardı gözlərdə, könüllərdə gülüş,
Dadlı bir çarədir hər dərdə gülüş.
Yırtaraq ay gecənin örtüyünü,
Məhv qılmışdı o zülmət yükünü.
Hər tərəf parlaq, üfüqlər ləkəsiz,
Yoxdu göylərdə buludlardan iz.
Bu nəsihətdən olan şən Gülnaz
Qəmli "ilul" kimi tutqundu bir az.
Azacıq hər tərəfi sardı sükut,
İndi Gülnaz mütəhəyyir, məbhut

Düşünürkən, coşaraq qızdı baqın,
Oldu sellər kimi darğın, daşqın,
Dedi: – Annəm, bu qeydsiz hərəkət,
Bilmədən yapdığın, adsız hərəkət,
Nə üçündür, nə deməkdir, göstər!
Bu nəsihət mənə aidmi məgər!
Get zibilliklərə at çarşafını,
Mənə qandırma uğursuz lafını.
Mən nə çarşaf, nə də bir ər tanıram,
Yalnız ən tazə əməllər tanıram.
Məqsədimdir oxumaq, öyrənmək,
Əməlim daim uçub yüksəlmək.
Yox, bulandırma o sözlərlə məni,
Süzmə, dur, şübhəli gözlərlə məni!
Annə, keçmiş o nəsihət vaxtı,
Çünki gəlmiş yeni söhbət vaxtı.
Hünərin varsa bu gündən söylə,
Məni aldatma çürük fikrinlə!
Əsrimin mən gözaçıq yavrusuyum,
Başqadır indi xəyalım, arzum.
Oktyabr mənə vermiş qüvvət,
Bir qızıl duyğu və bir ülviyyət
Ki, onun sayəsi altında mənə
Yeni insan gücü gəlmiş, annə!
Xəbərin yox, annə, mən komsomolum,
Tutduğun yoldan uzaqdır bu yolum.
Bu yolun yolçusuyam mən, annə,
Nə deyirsən bu işə sən, annə?
Bax, yarın dərsimi ikmal edərək,
Şövq ilə getməliyəm kəndə, bu pək,
Pək müqəddəs əməlimdir, məncə...
Bax, gərək kəndlərimiz ürfancə
Açaraq şəhpər ucalsın fələkə.
Məni sən anlamıyırsan bəlkə...
“Bəsləmişdir məni qoynunda bu gün”,
“Bu günün hökmünü öyrən və düşün”.

Bitirib sözlərin artıq Gülnaz,
Annəsin süzdü dərindən o bir az,
dedi:
İstəyirsən yenə azacıq danışım.
Dedi aninəsi:
Bu sözündən, bala, çıxmaz ki, başım!

## RADİO

Gizli-gizli havanın raylarından aşaraq,
Düşüncə vadisindən qaçıb uzaqlaşaraq,
Qohum-qardaş bilməyib hər kəsə yaxlaşaraq

Hər yerdən xəbər verir
Allo, allo səsləri.
Əcəb cilvə göstərir
Allo, allo səsləri.

Qıvrım qamçılar vurub dağlara, dənizlərə,
Bir xəbərlə yaxlaşıb uzaqlardan bizlərə,
Yolçuları toplayır bir yığnağa, bir yerə

Hər gün söhbət eyləyən
Allo, allo səsləri.
Hər şeyi tez bəlləyən
Allo, allo səsləri.

Ellər ayrı, ellərdə yaşayanlar da ayrı,
Xəbərsizkən çox işdən ölkələrin müxbiri,
Birləşib sayənizdə həp könül iqlimləri,

Çiçəklənir, allanır
Allo, allo səsləri.
Nəşələnir, hallanır
Allo, allo səsləri.

Nə yellər uğultusu, nə vulkanlar nərəsi,
Nə xəyalı divlərin köpüklü yayqarası,
Qışqırıb bağırsanız kəsilmədən arası

Qiyamət eylərsiniz
Allo, allo səsləri.
Siz başqa bir nərsiniz
Allo, allo səsləri.

Səsinizə tay olmaz sizin keçdi-keçdidə,
Hər yerdə aş orda baş, olmuşsunuz get-gedə,
Bir torpağın, bir evin bütün sərgüzəşti də

İçinizdə saqlıdır
Allo, allo səsləri.
Doğrudan maraqlıdır
Allo, allo səsləri.

## PEDTEXNİKUM

Ömrüm səfalətlərin dərin çuxurlarında
Ölgün vərəqlər kimi sürünən bir zamanda,
Dərs alıb bir çırpınan qartal qanadlı quşdan,
Çəkdin, çıxartdın məni yıxıldığım yoxuşdan.

O vaqıt bir çocuqdum, soqaqlardı məskənim,
Başdan-başa həyatım bir silinməz ləkəydi.
Kimsə bilməzdi sonum nə olacaqdır mənim,
Keçdiyim yollar bütün qazıqdı, təhlükəydi.

Toz-torpağın altımda buraxdığı izləri
Görənlər, sağalmayan bir yaradır, sanırdı.
Quruyordu get-gedə ömrümün dənizləri,
Bir qaynaq həsrətilə gözlərim bulanırdı.

Nazi-nemət içində bəslənən bəxtiyarlar
Sanki diyorlardı ki, yazıq, nəhayətin nə?
Qart daşları güldürən bu köhnə zəngin diyar
Hər baxışda ruhuma saplıyordı bir iynə.

Fəqət böylə qalmadı, bir ana şəfqətilə
Sən bu yetim varlığı qucaqladın, bəslədin.
Yeri-göyü titrədən bir şimşək qüvvətilə
Məni bir dağ başından harayladın, səslədin.

Kim bilir ki, sayəndə qaç zavallı dərbədər
Xilas olmuş saydığım bu məchul acılardan,
Sən, ey ürfan ocağı, sən olmasaydın əgər,
İnsan olurdumu bu gördüyün bəxtiyardan?

Söyləyiniz, kimdir o, bir sıra arxasında,
Qarşısında bir kağız, sağ əlində bir qələm,
Xəyal dənizlərinin köpüklü dalğasında
Açan bəyaz gülləri dərmək istəyən adam?

Kimdir o dalğın çocuq, saçları pəncəsində,
Bir saat ayrılmıyor can sıxan düşüncədən?
Neçin nitqi kəsilmiş, qüvvət yoxdur səsində:
Bir böhran içində o, qıvrılıyor ya nədən?

O mənim, əvət mənim, əvət, ilk xəyallarım,
Çılpaq təsəvvürlərim bu bağçada göyərdi,
Bu bağçada çiçəklər açdı o dörd baharım,
Bu şənlik mənə yüksək insan namini verdi.

Ömrüm səfalətlərin dərin çuxurlarında
Solğun vərəqlər kimi sürünən bir zamanda,
Dərs alıb bir çırpınan qartal qanadlı quşdan,
Çəkdin, çıxartdın məni yıxıldığım yoxuşdan!..

## DAĞLAR

Siz ki bir-birinizdən ayrılmayan əşdiniz,
Sinənizə ayrılıq dağı çəkildi, dağlar!
Aya, hankı cəlladın pəncəsinə keçdiniz,
Niçin böylə qəddiniz sındı, büküldü, dağlar?

Sizin ki, üzünüzdən qaralırdı çox işıq,
Üstünüzdən ötməyə yol bulmazdı bir aşıq.
Qaynaqlara edərkən gədikləri çarpaşıq
Bu gün çəlik bağrınız nədən söküldü, dağlar?

Nallarını küheylan atların qırardınız,
Önünüz əngin dərə, uçurumdu ardınız.
Çayların gur səsilə, üfqə hayqırardınız,
Sizin öncə halınız belə deyildi, dağlar!

Ruzgarları yararkən köksünüz parça-parça,
Ayrı qalırdı quşlar sıradan haftalarca,
Alnınızı buludlar oxşarkən bəxtiyarca,
Dik başınız önümdə nədən əyildi, dağdar?

Üst-üstdən o zaman ki, bıçaqlandı qəlbiniz,
Çaylar sapdı yolundan, narə yandı qəlbiniz,
Barıt dumanlarilə saçaqlandı qəlbiniz,
Axırda bir mum kimi söndü, töküldü, dağlar!

İnsan oğlu – əzəldən o sinə dağlayandı,
Yoxsa onun xəncəri köksünüzə dayandı?!
Başınıza kül oldu, könlünüz oda yandı,
Onda ki, yerinizdə raylar çəkildi, dağlar!

## MƏDƏNİ HÜCUM

Xəzandır, xəzandır...
Təbiət kişnəyir yüyənsiz at kibi.
Təbiət varlığı əlində oynadır,
Ruzgarlar qudurmuş, səmalar əsəbi...

Qanadı olanlar köksünü gərəcək
Aləmi titrədən bu fəslin zülmünə.
Odur, bax, zavallı bir yarpaq, bir çiçək
Sürünür torpaqda ölərək. – Kimə nə!..

Təbiət bizləri döyüşə çağırmış,
Bu meydan istiyor qüvvətli pəhlivan.
Xəzandır, xəzandır, önümüz qarlı qış,
İnsan da zərərli çıxarmı bu yoldan?

O bulud, o şimşək, o ruzgar, o vulkan
Diyor ki: – Mənimlə, haydı, çıx döyüşə!
O tufan söylüyor: – Gəl, bu sən, bu meydan!
Bu gərdiş bənzəməz başqa bir gərdişə.

Mədəni hücuma başladıq odur ki,
Bizimlə keçmişdə olmalı ayrılıq.
Bu günün səsləri çınlayıb diyor ki:
– Üzümdə olmasın kölgəlik, sayrılıq.

Hücum et duyduğun varlığa, yoxluğa!
Hücum et sökülmüş şəfəqlər yurduna!
Başında oynayan o duyğu, o dalğa
Girişsin sahilə, baxmadan ardına.

Kənardan gülərkən alovgöz bir mayaq,
Bu daşğın sulardan bizlərə nə qorxu?
Qoy coşsun dalğalar, sən çalma əl-ayaq,
Həyatda mübariz bir ərə nə qorxu!

Qanadın dalğalı, saçların köpüklü,
Çırmala qolunu, düşərək meydana.
Deyirlər qəlbində bir vulkan gömülü,
Şir kimi nərə çək, səda sal cahana!

Ər oğlu ər kimi atılsan meydana,
Hər dodaq namına bəstələr bir şeir.
Ölməkçin doğmadıq, gəlmədik cahana,
Ölməkçin yaşamaq – bu sadə bir işdir.

Biz doğduq biləlim güllərin dilini,
Dağların, daşların, ellərin dilini.

Olalım hər ufaq zərrəyə aşina,
Mənimsə, ey könül, nə çıxsa qarşına!

Bax, bəşər uçduqca hey uçmaq istəmiş,
Göyləri pəncələr yarın o, bəlkə də,
Hər məchul qapını o açmaq istəmiş,
Bir gizli sirr duymuş hər dərin kölgədə.

Qalmasın könüllər, baxışlar buludlu;
Arqadaş, gün kimi açılsın bənizin.
"Geyimlər dəyişdi", sevəlim bu yolu;
Hökumət, əmr eylə, ürəklər dəyişsin.

Onsuz da genişlik mədəni hücumda...
Bütün xalq bu yolda etməli iştirak.
Nərəmiz salınca aləmə səs-səda,
Göylərin yaxası olmalı çaki-çak.

Qalmasın bu yerdə keçmişin kölgəsi,
Gecənin yerində sökərkən al şafaq.
Bu hücum çağırsın hücuma hər kəsi,
Bu günçün türkülər söyləsin hər dodaq!

Dəyişib batini məscidin, kilsanın,
Kürsüdə oxunsun əsrimin xütbəsi.
Çatlasın ürəyi Musanın, İsanın,
Əhmədin, buddanın tıxansın nəfəsi!

Öyləcə papaq da, öyləcə çadra da
Atılsın, onlara edəlim əlvida.
Ən uzaq dənizdə, ən məchul qarada
Yapılsın bu hücum, çınlasın bu səda!

Hücum et kitaba, hücum et dəftərə!
Çalğıçı, gecikmə, nəğməni sən də çal!
Çal, havan yayılsın yerlərə, göylərə,
Çünki bu əsrimiz istiyor qalmaqal!

## BİR GÖRÜNÜŞ

Çıxmışam bir dağa, qarşımda Bakı
Qaynayır, çünki deyil ruha ılıq.
Çınlar hər yanda dərin bir səs-küy,
Duyulur hər küçədən bir çığlıq.

Hara baxsan, görəcəksən itilik,
Yaşayış çalxalanır, bir su kibi.
Üzlər almazlı, baxışlarsa çəlik,
Nəşədir getdiyi yoldan tələbi.

Dün bu yerlərdəki karvan yerini
Ediyor yolçu tramvaylar əvəz;
Boğuyor ölgün azan səslərini
O ağızdan iti radyodakı səs.

Bir tərəfdən göyə qalxan hər ev
Gülüyor boynubükük külbələrə.
Sən də, şair, bu uçan aləmi sev!
Nəşəli gözlərini dikmə yerə!

Raylar üstündə gəzən atlara baq,
Sən də onlar kimi çap, dönmə geri!
Dala baxmaqda nə var? Çırpınaraq
Hər ufaq damla diyor: – Qoş iləri!

Hələ qarşımda Xəzər çalxalanır,
Qıl nəzər, gör nə köpüklənməsi var!
Dalğalar sanki bəyaz quşlardır,
Dəniz üstündə qanadlanmışlar.

Üfqün altında xəfif bir yelkən,
Ah, bu, bir incə xəyaldır, bir əməl,
Bir vapor səslənərək titrərkən
Qamçılar beynimi bir duyğulu əl.

Çıxmışam bir dağa, qarşımda Bakı
Qaynayır, çünki deyil ruha ilıq.
Çınlar hər yanda çəlik bir səs-küy,
Duyulur hər küçədən bir çığlıq.

## KÜLƏKLƏR

Hər səhər, hər axşam, hər axşam, hər səhər
Çox zaman sərsəri küləklər bixəbər
Bir yaxın dost kimi qapımı döyərlər,
Küləklər, küləklər, bəstəkar küləklər,
Dünyanı dolaşan bəxtiyar küləklər!

Bəziniz qorxulu, bəziniz qorxusuz,
Bəziniz duyğulu, bəziniz duyğusuz,
Bəziniz uyqulu, bəziniz uyqusuz,
Küləklər, küləklər, ey sərin küləklər,
Sizdə var qoxusu hər yerin, küləklər!

Ey çılğın küləklər, nəşəniz daşarkən,
Bağların şehindən mey sorub coşarkən,
Nalqıran dağları atlayıb aşarkən,
Məni də alınız, uçayım dağlara,
Könlümdə nə varsa, açayım dağlara!

Gurlayın, ilhamım, sənətim gurlasın!
Fırtınam, qasırğam, qüdrətim gurlasın!
Şimşəyim parlasın, zülmətim gurlasın!
Ey məni sərazad bəsləyən küləklər,
Bir dağın başından səsləyən küləklər!

## AY QIZ

Sən də alıb ələ bir qızıl rübab,
İncə tellərini səsləndir, ay qız.
Döşündən ellərə bağla bir kitab,
Susqun dodaqları dilləndir, ay qız!

Qalmasın sözlərin qəlbində gizli,
Mən görmək istəməm çöhrəni sisli.
Ol arslan ürəkli, şəfəq bənizli,
Gülərək, yurdunu şənləndir, ay qız!

O qara günlərin getsin gəlməsin,
Bir daha keçmişin üzü gülməsin.
Ümidi səndədir məncə hər kəsin,
İndidən ruhunu telləndir, ay qız!

## TELEFON SÖHBƏTİ

Sən məndən uzaqsan, mən səndən uzaq,
Uzaqdır sevimli gözlərin mənə.
Yaxındır telefon sayəsində bax,
Ürəkdən saçılan sözlərin mənə.
Neçin ruhlanmasın bu yeni şair,
Çapar gözləməyir canan elindən,
Çılğın arzuları eşqinə dair
Mərhəmət ummayır səba yelindən.

Əvət, böylə qalmaz yarın bu ölkə,
Telfonda fikrimi açarkən sənə,
Həsrətlə baxdığım üzün də bəlkə
Uzaqdan uzağa görünər mənə.
Məhəbbətin dərin, xəyalın dərin,
Nə çıxar sözlərə könlümü versəm?!
Əslinə varmaqçın bu söhbətlərin,
Nolur gözlərini telfonda görsəm?!

Məni inandırmaz yoxsa bu sözlər,
Az iş gəlməmişdir qərib başıma.
İstərəm ürəyin aynası gözlər
Açıb həqiqəti qoysun qarşıma.
Əvət, böylə qalmaz yarın bu ölkə,
Telfonda fikrimi açarkən sənə,
Həsrətlə baxdığım üzün də bəlkə
Uzaqdan-uzağa görünər mənə.

## TELEQRAF TELLƏRİ

Bilinməz bu geniş çöllərdə nə bəklər
Yan–yana düzülmüş bu şeytan dirəklər!
Bunların çiyninə durmadan hey yüklər
Dərdini gizlicə teleqraf telləri,
Hər sabah, hər gecə teleqraf telləri.

Uzanan yolları gödəldən, qısaldan,
Yorulan yolçunun başını ucaldan,
Çırpınan qəlblərin dərdini azaldan,
Yolların yolçusu teleqraf telləri,
Ellərin elçisi teleqraf telləri.

Görmədən çıxdığı yoxuşda qəhirlər,
Sizinlə bir yerə toplanır şəhirlər.
Ürəkdən dalğalar, arzudan nəhirlər
Daşırkən içiniz, teleqraf telləri,
Gəliniz, keçiniz, teleqraf telləri.

Döndükcə mövsümlər, döndükcə sənələr,
Çıxdıqca ortadan fəsadlar, fitnələr,
Yayılar cahana möhtəşəm bir xəbər
Ki, dünya oyanmış, teleqraf telləri,
Al rəngə boyanmış, teleqraf telləri.

## ÇARXLARIM

Nə qollar yada salsın ənginlərin quşunu,
Nə əllər, nə ayaqlar həyatın yoxuşunu
Çıxamazdı bu çapqın
Çarxlar bulunmasaydı,
Makinaya əskidən
Rəğbət olunmasaydı.
Bunlarsız aşmaq olmaz qısıq dar gədikləri,
Nalqıran yoxuşları, sıldırımlı dikləri.
Fırlandıqca tel kimi
Görünən çarxım, dolan!
Qıvrılıb bir sel kimi
Gərinən çarxım, dolan!

Biz sizin sayənizdə şahiqələr atladıq,
Cahanın qafasında bomba kimi partladıq,
Bəklənən saatları
Doladıq əlimizə,
Hakim olduq nəhayət
Yerə, göyə, dənizə.
İşçilər dəzgahının dururkən baş ucunda,
Dəzgahının nəbzini yoxlarkən ovucunda.
Səbirsizliklə belə
Qıvrılan sizmisiniz?!
Şəffaf küləklər kimi
Burulan sizmisiniz?!
Daş kömür, nöyüt-flan, təmamən bitmiş buraq,
Burax, əsirgəsin də bizdən bunları topraq.
Mən səni canlatmağa
Yeni yollar bulurum,
Yeni oynaq qanadlar,
Yeni qollar bulurum.
Güc, qüvvət toplayırkən ləpələr ləpələrdən,
Doğrulub dərələrdən, atlayıb təpələrdən
Halınıza yanaraq,
Sizi cansız buraxmam.
Bir an, bir qırpım belə
Həyəcansız buraxmam.
Bax, sizin sayənizdə ucalmaqda məmləkət,
Zavoddakı traktor, torpaqdakı bərəkət.
Siz yerləri, göyləri
Dolaşan çarxmısınız?!
Düşmənlə hər addımda
Dalaşan çarxmısınız?!

## YADIMA DÜŞDÜ

Keçən günlərimi vərəqləyirkən
Sevdalı dillərin yadıma düşdü.
Xəyalın qarşımda canlandı, birdən
Göyərçin əllərin yadıma düşdü.

Deyildir eşq odu məni yandıran,
Ruhumun şəhrini işıqlandıran.
Pozğun şəfəqləri mənə andıran
Ziyalı tellərin yadıma düşdü.

O gün də bir gündü, ey üzü dönmüş,
Sandım içində bir qaplan döyünmüş.
Bir anda köpürmüş, bir anda sönmüş
Xırçın əməllərin yadıma düşdü.

## QOŞMA

Qadın, gözlərinin oynaq xəyalı
Dönüyor qarşımda yenə cin kimi,
Baxdıqca ruhumun qaynar məlalı
Sənin qəhqəhəli sevincin kimi.

Səndən əsrin kimi şəfqət uzaqmış,
Ruhuna zülmətin selləri aqmış.
Laçın gözlərindən odur ki, sarqmış
Ürəyim bir yavru göyərçin kimi.

Ovçuluq əsrimi əsrin, ey qadın?!
Söylə övladısan hanki səyyadın?
Sən gözlərinləmi yoxsa ovladın
Göyərçin qəlbimi bir laçın kimi.

## GƏZDİYİM YERLƏR

Əsrlərdən bəri, illərdən bəri
Dərdinə qaldığım yerdir bu yerlər.
Biliyor saçları qızıl bir pəri
Qurbanı olduğum yerdir bu yerlər!

Bu gözəl aləmi gəzdikcə dağ-dağ,
Oldum sevincinə, qəminə ortaq.
Ey söyüdlü dərə, ey dumanlı dağ,
Səfaya daldığım yerdir bu yerlər!

Qapıldım bu yerdə əyləncələrə,
Anlamış hər irmaq, bilmiş hər dərə,
Ya dalıb diqqətlə düşüncələrə,
Ya ilham aldığım yerdir bu yerlər!

## EŞQİM

Anasız, babasız Ofelya kimi
Saçları pərişan bir qızdır eşqim.
Qəlbimin buludlu səmalarında
Titrəyən bir qərib ulduzdur eşqim!

Olmadan aşikar doğduğu yerdən,
Böyük tanrı kimi düşmüş nəzərdən,
Çöhrəsi gülməyən xərabələrdən
Daha qəmli, daha ıssızdır eşqim!

Həyata baxmamış gülümsər kimi,
Hər bir hadisədən bixəbər kimi.
Yad əllərdə qalan yetimlər kimi,
Başı bəlalıdır, yalnızdır eşqim.

## GECƏ DÜŞÜNCƏSİ

Xoşladığım bir gecə, yerlər, göylər işıqlı,
Ay bir sərxoş göz kimi, ulduzlar yaraşıqlı.
Bunları seyr edərkən
Bir az fikrə gedərkən
Fikrim, hissim, xəyalım o qədər yüksəldi ki,
Mənə öylə gəldi ki,
Bizlərdən əvvəl nə yer, nə göy, nə həyat olmuş,
Nə bu ucsuz-bucaqsız gözəl kainat olmuş...

Gecə sakit... düşüncəm sakit deyildir fəqət,
Gözlərimin önündə canlandı hər həqiqət.
Xəyalım ənginlərə o qədər yüksəldi ki,
Mənə öylə gəldi ki,
İlk dəfədir kainat –

Dünyanı sellərində çalxayan bizim həyat
Sağda, solda döyüşmüş,
Sonra yoluna düşmüş.
Nə dayanmaq vaxtıdır, gözəl dostum, sən də gəl!
Seyr edəlim qol-qola bu zümrüd çəməndə gəl!
Göy üzünə bircə bax, hər ulduz bir sarı gül,
Yarı qönçə, yarı gül.
Səni gördüm, xəyalım o qədər yüksəldi ki,
Mənə öylə gəldi ki,
Bizə bu nazlı aləm görünərdi qaranlıq,
Gözəl çarpışmasaydıq, gözəl yaşamasaydıq.
Xoşladığım bir gecə, yerlər, göylər işıqlı,
Ay bir sərxoş göz kimi, ulduzlar yaraşıqlı.
Bunları seyr edərkən,
Bir az fikrə gedərkən,
Fikrim, hissim, xəyalım o qədər yüksəldi ki,
Mənə öylə gəldi ki,
Bizlərdən əvvəl nə yer, nə göy, nə həyat olmuş,
Nə bu ucsuz-bucaqsız gözəl kainat olmuş...

## DAŞ QARTAL

İllərcə dayandın arxan divarda,
Hər gələn yolçuya dəhşətlə baqdın,
Gözündə bir oldu qış da, bahar da,
Qəlblərdə bir acı uçuşla sarqdın.

Üfüqdən üfüqə çaldığın qanad
Hər yerə qaranlıq bir kölgə saldı,
Pəncəndə qırıldı bir yığın qanad,
Qorxundan, uçanlar sükuta daldı.

Nə ruzgar, nə boran, nə qar, nə tipi[1]
O sərt ürəyinə etmədi təsir.
Bir yüksək divarda durdun "dağ" kimi
Ömründə iztirab bilmədin nədir.

[1] *Tipi* – boran

Çulğadı süzdüyün qaldırımları
Bir yığın səfalət, bir yığın acı.
Çaxarkən hirsinin ildırımları,
Dəydi umuzlara ölüm qırbacı.

Gözlərin sancılmış ellərə tək-tək,
Əlində ölkələr bir oyuncaqdı.
Kinli ürəklərdə bəslənən şimşək
Başında partladı, gözündə çaqdı.

Əvət, qaynağında aman bulmayan
Zavallı insanlar üzünə durdu.
Dərələr, təpələr eylədi üsyan,
Bağrına zəhərli bir güllə vurdu.

Bizim dünyamızın hakim işçisi
Daldı öksüzlərin ahü zarına,
Dərdə düşənlərin olub bəkçisi,
Son verdi uğursuz uçuşlarına.

Dönüb bir tufana, tutdu yolunu,
Sarsıtdı aləmi onun buyruğu.
Qırdı şəhpərini, kəsdi qolunu
Sağlam bir işçinin iti yumruğu!

## YENİ GƏNC

Mən çəlik ürəkli bir yeni gəncim,
Dildən-dilə düşmüş hekayətim var.
Həyat nəşəsilə titrəyir içim,
Parlaq gələcəyim, nəhayətim var.

Bir parça atəşim, bir parça yanğın,
Qəlbim örnəyidir yanar bir dağın.
Qarşımda duramaz nə sel, nə daşqın,
Təbiətlə mənim zərafətim var.

Sevgim mübarizə, sevgilim həyat,
Yəhərlənmiş mana qanadlı bir at.
Gör nə deyir sizə çaldığım qanat:
Hələ bundan sonra qiyamətim var.

## VAPOR VƏ FIRTINA

Ey canavar ağzının köpüyü dalğalardan,
Bir yelkəni görüncə ayrılıyor kənardan
Halqa-halqa dişləri qıcırdayan, fırtına!

Odur, bildiyin əjdər uzaqlaşdı limandan,
Sanki dünyaya sığmaz bir dağ aşdı limandan,
Zorun varsa aclığa tablaş, dayan, fırtına!

Yem olamaz deyirlər bu gələn əjdər sana,
Yaxınlaşdıqca boydan yüksələn əjdər sana,
Bir qartal uçdu sanki qarlı dağlar başından.

Qabar-qabar sinəni yaxlaşdı, dümdüz etdi,
Bir yürüşdə çevirdi astarını üz etdi,
Keçərkən dikəltdiyi yarlı dağlar başından.

Sürətlə fırlanınca onun təkərlikləri,
Bəyaz çiçəklər açdı əndamının hər yeri,
Dəmir qanadlarilə burnuna vurdu, vurdu.

Açdı sandığı, tökdü pambığı dalğa-dalğa,
Gücün sınandı, aybın açıldı ortalığa,
Bağrın yarıldı bizim əjdər edincə du...du.

## RƏNANIN ÖLÜMÜ

– Qolçomaq oğlu qudurğan Şahbaz
Kimilərdən bizə yoldaş olmaz!
Onların səsləri yoxdu hətta, –
Dedi Rəna coşaraq iclasda.

Onun hər kəlməsi bir gülləydi,
Qolçomaq pəncərədən diş bilədi.
Qolçomaq nizə qədər boydan uca,
Bərəlib gözləri pək şeytanca,
Dinliyor, iclası durmuş pusuda,
Qəlbi yelkən kimi bir vəhşi suda
Rəqs edib sallanıyor, qıvranıyor,
İçi zülmətlə tutuşmuş yanıyor.

Gecə səssizdi, gülümsərdi Qəmər,
Yoxdu varlıqda siyahlıqdan əsər.
Vardı gözlərdə, könüllərdə gülüş,
Tatlı bir çarədir hər dərdə gülüş.
Yırtaraq ay gecənin örtüyünü,
Parçalatmışdı qaranlıq yükünü.

İndi Rəna evə dönməkdə idi,
Ansızın çiyninə bir əl dəydi.
Qız, görürkən bu zaman qolçomağı
Titrəyib əsdi bütün əl-ayağı.
Oldu çən gözləri qaynar-qaynar,
Qopdu ruhunda sıcaq fırtınalar.

Baxdı birdən ona şaşqın-şaşqın
Dedi kimsin, nəçisin, gəlmə yaxın!
Qolçomaq söylədi: – Rəna, dinlə,
Sənin eşqinlə, sənin dərdinlə
Gördüyün, bildiyin oğlum Şahbaz
Gecə-gündüz ediyor razü niyaz.
Səni gördükdə nəzər qılmaqda...
Bir çalınmış kimi qıvrılmaqda.
Dünki iclasda fəqət, söylə, nədən
Qoymadın firqəyə girsin onu sən?

Qorxudan öncə yarılmışkən ödü
Bir dəlirmiş kimi Rəna döndü,
Hayqırıb söylədi: – Çıx get, abdal!

Şu böyük əmri küləklər dal-dal
Ötərək, səslənərək gəzdirdi.
Bir səda ancaq uzaqdan derdi
Nazlı Rəna qarışırkən gecəyə:
– Aybı yox, bir də çıxarsın küçəyə.

Sabah erkən uyuyor göy sakit,
Külbələr sakit, üfüqlər rakit.
Qolçomaq lakin özündən çıxmış,
Dəlidir sanki izindən çıxmış.
Ansızın vurdu çürük beyninə qan,
Qızışıb aldı sınıq bir yatağan.
Çıxdı evdən, bu çıxış məncə bəla...
Sabah erkən uyuyor göy hala...

Uyuyor indi bizim Rəna da
Kimsə bilməz ki, şirin röyada
Ona kimdir eyi rəhbərlik edən,
Bixəbərdir qopacaq vəhşətdən.
Gizli bir səs qapıdan yüksəldi,
Canavar kölgəli bir şey gəldi.
Duyğusuz qolçomağın kölgəsi bu...
Sanki Rənaya diyorlardı uyu.
Uyu ey sevgili, azyaşlı gözəl,
Qəmə kirpikli, qələm qaşlı gözəl,
Uyu ey sinəsi məcra, saçı su,
Uyu nəşənlə, sevincində uyu.
Uyuyur köksünün üstündə bir əl
Yapacaqdır yatağından heykəl.
Başı üstündə bir az titrəyərək
Bağrına qondu siyah bir milçək.
– Uf aman!
Qatil uzaqlaşmışdı.
Gizli bir mənzilə yaxlaşmışdı.
– Uf aman, annə!
– Nə olmuş, Rəna?
Ah, səbəb kimdir axan qanlarına?

Hıçqırıqlar dolaşırkən dağ-dağ
Yerdə cansızdı o solğun yarpaq.
Kəndə səs düşdü, vərəqləndi xəbər,
Toplaşıb gəldi bütün bildiklər
Sataşıb gözlərə birdən yatağan,
Ansızın vurdu sərin başlara qan,
Yatağandan düşünüb anladılar
Qızı öldürmüş o sərsəm, qəddar.
Qızaraq titrədilər, titrədilər.
– Qolçomaq haydı, tutulsun – dedilər,
Bir səda dalğalanıb yüksəldi,
İştə qatil yaxalanmış gəldi.
Dedi ətrafdakı yoxsul təbəqə:
– Yox, cəza verməliyiz qolçomağa.
Yeri-yerdən qınayırlarkən onu,
Seyr edib yapdığı çirkin oyunu
Yalvarırmış kimi sakit durdu,
Düşünüb boynunu səssiz burdu.
Partlayıb işdə cılız bir qurşun
Açdı bir pəncərə alnında onun.
Qolçomaq yerdə sürükləndikdə,
Ölümün sırtına yükləndikdə
Dedi illər aşıran bir qoca pir:
– Qolçomaq köylülərin qatilidir.

## POÇT QUTUSU

İllərdir bu divara sən ey poçta qutusu,
Yorğun bir adam kimi dayamışsın arxanı,
Saqlıdır içərində sirlərin ən quytusu,
Tanımayan bulunmaz sənin açıq yaxanı.

Karvanların uzayan yollarının zülmünə
Canla, başla, ürəklə dəmir köksünü gərdin.
Kiminə nəşə sundun, qəm içirdin kiminə,
Buna həyat, onaysa ölüm pəyamı verdin.

Bəzinin ələmində, bəzinin şaqasında
İştirak eyləmişsin anlamadan, müxtəsər.
Kim bilir ki, o sakit sinənin arxasında
Bir quş kimi döyünmüş neçə-neçə ürəklər.

Xoş gəlir mənə səndən bu aldığım duyğular,
Ey dəmir qutu, fikrim halqalanır önündə.
Sayəndə canlanırkən çılpaq, yetim arzular,
Xəyalımın gölləri dalğalanır önündə.

Sənmi çox oynamışsın könüllərlə, mənmi çox?!
Sənmisən ya mənmiyəm min bir xəbər şahidi?!
Ayrılığa, vüsalə aid səndə nələr yox?
Sən deyilmisən uzun macəralar şahidi?

Sən mənimlə bir qədər razılaşıb izin ver,
İzin ver də yarayım dəmir bağrını az-çox,
Görünsün içərində birikən xəzinələr,
Çünki səni həqqilə anlayan yox, duyan yox.

## HÖRMƏTLİ QƏZETİMİZ[1]

Yadımdadır bu gün belə,
Bir bəxtiyar sevinc ilə
Könlümün ilk bəstəsini,
Ruhumun nəşidəsini
Oxuduğum əziz günlər.
Mənə açdın qoynunda yer,
Çılpaq, yetim duyğularım,
Ümidlərim, arzularım,
Sığındılar dərgahına,
Atıldılar pənahına.
Titrəyirkən, üşüyürkən,

[1] Bu şeri müəllif ilk qələm məhsullarının ən çox nəşr olunduğu “Gənc işçi” qəzetinin onilliyi münasibətilə yazmışdır.

Çırpınaraq tövşüyürkən
Gəncliyimin geniş qəlbi,
Bir şəfqətli ana kibi
İşıq verdi gözlərimə,
Qüvvət saçdın dizlərimə.
Uçmağa yoxkən uyarı
Şerimin süs qanadları
Yalnız səndən qüvvət aldı.
Aman könül! O nə haldı?!
İlk nəşidəm çıxan zaman,
Mən bir çocuq kimi haman
Ətrafa salmışdım nəzər.
Ah o günlər, ah o günlər!..
Deyil mənə, ona, buna,
Mənim kimi bir çoxuna
Qüvvət verib, həycan verib,
Sarsılmayan bir can verib.
Uzun zaman cəmiyyətin
Ən çıxılmaz və ən çətin
Yollarına rəhbər oldun,
Fikrimizə mehvər oldun...
Bizə etdin böyük xidmət,
Bizdən sənə min bir hörmət!

## GÖYGÖL

Mən bu gün Göygölü durğun gördüm,
Göygölün şəklinə vurğun gördüm.
Çırpınan bir quşu, quş çağlardı,
Yeri çiskin dolu dik dağlardı.

Qızıl əsgər sipərindən çıxaraq,
Diri könlümdə qanadlandı maraq.
Buraxıb torpağa torpaqlıları,
Dırmanıb dağlara, çıxdım yuxarı.
İstədim bir yeni dünya bulayım,

Azacıq Göygölə mehman olayım.
Çıxaraq bir dikə, gördüm sonda
Dağların kölgələnən qoynunda
Uyuyor naz ilə Göygöl rahət.
Onda var öylə dərin bir riqqət
Ki, baxanlar ona heyran oluyor,
Qəlbi köksündə xuraman oluyor.
Dörd tərəfdən onu çamlar bir-bir
Sanki zəncirləyib etmişlər əsir.
Sanki dağlar ona olmuş dayə,
Qayalar bağrına salmış sayə.
O fəqət hər şeyə dinməz baxaraq
Duruyor, dağların ardında şafaq
Çırtlayıb, incə qızıl saçlarını,
Saç deyil, od kimi qırbaclarını
Sallayıb köksü dəlik dağlardan.
Oxuyor Göygölə kəskin meydan.
Rəng verib, rəng alıyor Göygöl də,
Buna heyran qalıyor Göygöl də.
Günəşin nuru toxunduqca ona,
Bir alov hizməsi qonduqca ona,
Gözlərindən saçılır almaslar,
Silinir qəlbini tutmuş paslar.
Daşıyor mavi göyərçin bağrı
Onda şimşək kimi od parçaları.
Bir tərəfdən onu sarmış qayalar,
Qayalar Göygölü burnilə yalar.
Göylərin sanki bu Göygöl dibidir.
Halqa üstündəki zümrüd kibidir.
Çamların dalları yelləndikcə,
Yellənib quş kimi dilləndikcə,
Sanki bir sevgili qız qəlbindən
Qopuyor gizli yanıq bir şivən.
Bu yanıq şivəni Göygöl duyuyor,
Uyuyor naz ilə səssiz, uyuyor.
Uyuyor nəşəli bir tazə kimi.
Tül vərəqlər onu yelpazə kimi

Oxşuyorlar, necə bir quş qanadı,
Tor kimi üstünü göy yarpaqlar
Almış ətrafdan onun, baxsanıza!
Ah, bu şeytan nə səbəbdən bu qadar
Bənziyor çadralı bir vəhşi qıza?
Çarşafı incə dumanlardandır,
Baxıyor, sanki adamdan utanır.
Bir lətif ruzgar əsərkən yaxud
Göygölün ruhu olur pək məsud.
Tellənir sinəsinin dalğaları,
Baxıyor göylərə altdan yuxarı.
Vəcdə gəldikcə ipək yarpaqlar
Tökülüb dizlərinə səcdə qılar.
Onda Göygöl yeniliklər buluyor.
Sarı yarpaqlara mədfən oluyor.

Göygölüm, başqa səfa var səndə;
Bulmuşam özgə cahanlar səndə.
Yer yeşil, göy yeşil, ətraf yeşil;
Doğduğum bəldə mənim böylə deyil.
Mən küləklər şəhərindən gəldim
Zəhmətin ümdə yerindən gəldim.
Öylə bir yer ki, onun gülləri yox,
Sayrayan nəşəli bülbülləri yox.
Böylə əngin dərələr yox orada,
Qocaman məşcərələr yox orada.
Orda yox böylə çəmənlərdən əsər.
Orda bülluri bulaqlar nə gəzər!
Orda lakin yeni insanlar var,
Qaynayan qırmızı vulkanlar var.
Açıyor orda alovdan güllər,
Ötüyor orda çəlik bülbüllər.
Meşələr orda buruqlardandır,
Çağlayanlar qara qanlardandır.
Səndə dağlar, dərələr, düzlər gül...
Gecələr gül kimi, gündüzlər gül.
Möhtəşəm dağlarının başları qar,
Dağ qaçar, sanki dumandan qorxar.

Niyə, Göygöl, bu qədər susqunsun?
Razı ol çırpınıyorkən qonsun
Dalğasız sinənə qəlbim azacıq,
Kimə sən vermədəsən, söylə, acıq
Bu gözəlliklə, bu səssizliklə?!
Çağlayanlar kimi gəlməzmi dilə
Azacıq olsa da durğun baxışın,
Dalğalar rənginə vurğun baxışın?
Mən də əvvəlləri çox küskündüm,
Köhnə zəncirləri qırdım, yendim.
Mən nəyim indi? Qızıl bir əsgər,
Açmışam yerdə günəşdən şəhpər.
Qoy dodaqlarda çiçəklənsin adım,
Quş deyilsəmsə də vardır qanadım.

Ey çocuq ruhu qədər şən Göygöl,
Köksü almas kimi rövşən Göygöl!
Ətəyindən əyilib öpdüm mən,
Kim qaçar sevgilisin öpməkdən?
Çənlərin oynağı olmuş başucum,
Göyləri sanki qamarlar ovucum.
Vuruyor qəlbimi bir körpə sevinc,
Sevinərdim dura bilsəydim dinc.
Çünki gəlmiş mənə şadlıq sırası,
Göygölün çünki şirin xatırası
Titrədir qəlbimi həycanlarla,
Der ki, haqqımda şeir az, parla
Sən ki bir parça sümüksüz ətsin,
Bu gözəllik səni qoy titrətsin.
Bir də quşlar, kələbəklər, güllər,
Quytu çamlar və üfüqlər yer-yer
Nazlı qoynunda sənin birləşərək,
Veriyor mövqeyə xoş bir ahəng.
Sana diqqətlə dalarkən nazarım,
Coşdu qəlbimdəki çırpıntılarım.
Sarılıb beynimə rəngin saplar,
Bir yumaq yapdı ki, çox qiymətdar.

Razı ol baxmaq üçün göylərinə,
Kim dalar böylə dərindən dərinə?
Göy dəniz, sanki buludlar sarqıq
Qayalardır ki, düzülmüş sıq-sıq.
Fərqi yox hər qayanın bir gəmidən
Ki, üfüqlərdə açarlar yelkən.
Sonra atbaşlı buludlar gəliyor,
Şahə qalxar kimi həp yüksəliyor.
Kişniyorlar toxunub bir-birinə,
Nə deyim mən bu göyün mehvərinə
Ki, bu köhlənləri yığmış başına.
Hər bulud sonra çatılmış qaşına,
Düşünür, cəzb ediyor ənzari;
Baxaraq mən dəxi altdan yuxari,
Süzərim bunları heyran-heyran.
Bu zaman zehnimi şiddətlə saran
Duyğular toplaşaraq bir araya,
Başlayarlar şığıyıb gurlamaya.
Qəlbimin səsləri səsləndikcə,
Səslənib könlüm həvəsləndikcə,
Şu buludlar – şu qədəhlər kimi, baq,
Şu buludluqlara etdikcə maraq,
İstərim yaslanıb alçaqlara mən,
Mey sunaydım başı dik dağlara mən.

Dinləyin, ey qoca, yüksək dağlar,
Ey bu dağlarda əsən irmaqlar,
Ey yaşıl sinəsi əngin dərələr,
İçi sirlərlə daşan məşcərələr!
Mən baxarkən sizə bilməm uyumaq,
Nazənin duyğularım sanki yumaq
Kimi bir mehvərə səssiz sarılır,
Mənə heç şey bu zaman gəlməz ağır.
Sənətin, bəlkə həyatın yükünü
Daşıyorkən acı küskünlüyünü
Ürəyim bir pula satmış kimidir.
Bu ticarət mənə ləzzət gətirir.

Dediyim sözləri gəl bir də eşit!
Sanma vardır mənim ağzımda kilit.
Sən gözəlsən, buna bir şübhəmi var?
Boş gözəlliklə fəqət aşmaz kar!
Doğrudur, mən sənə qaldım heyran,
Bildim, insanda olurmuş nöqsan.
Mən fəqət bir sinifin şairiyim,
Göyə uçmam da, zəmin şairiyim.
Bizə iş lazım, əvət, iş lazım,
Həp budur məqsədimiz çünki bizim,
Bir də nadirsin, onunçun bu qadar
Sənə məftun oluyor insanlar.
Səndə qalmaz bu təbiət, Göygöl!
Çəkilərsin işə, əlbət, Göygöl!
Biz təbiətlə döyüşməkdə ikən,
Buna biganə görünməzsən sən.
Suların çaxdıraraq şimşəklər,
Dağların bağrına nurlar sərpər.
Saracaq dövrəni rahatlıq evi,
Çünki əsrin şu bəşər adlı divi
Səni pək başqa bir aləm yapacaq,
Çayların bəlkə yolundan sapacaq.
İşləyib çox çəkəcəklər zəhmət,
Edəcəklər bizə onlar xidmət.
Dırmaşıb köksünə raylar bir gün
Şəhrə əlbət olacaqsan üskün.
Bir sabah mavi, yaşıl qoynunda
İncilər parlayacaq boynunda.
O zaman aylara, ulduzlara sən
Gecələr eyləyəcəksənmi pəsənd?
Böylə qalsan əgər, ey Göygöl, inan
Pək təbii, çıxacaqsan yaddan.
Çünki hər zərrə dəyişmək istər,
Yaşamaqçın dəyişiklik göstər!

Ey çocuq ruhu şən Göygöl;
Köksü almas kimi rövşən Göygöl!

Mən də olsaydım əgər bir şair
Səni həqqilə edərdim təsvir.
Mən ki şair deyilim, bir gəncim,
Yanıyor odlu əməllərlə içim.
Doğrudur, indi darılmış nəfəsim,
Tutmamış ölkəmi həqqilə səsim.
Dönərim sellərə, irmaqlara mən,
Çarparım kəndimi dik dağlara mən
Eşidilməzsə əgər avazım,
Yoxsa sınmışmı, qırılmışmı sazım?!
Taxtadan yox, bu ötən sazcığı mən
Yapmışam, dinlə, çəlik köksümdən.
Ürəyimdən hörərək tellərini,
Bəzəyib süsləmişəm hər yerini.
Pək qısıqdır səsimin dalğaları,
Uça bilməm daha bundan yuxarı.
Acizim doğrusu, Göygöl, bax da,
Bu gözəl sazcığı mən çalmaqda.
Yayı lakin bu sazın ölənə qadar
Tutacaq köksümün üstündə qərar.
Gün gələr mən onu dilləndirərim,
Çalarım, varlığı dilləndirərim.
Ürəyim nəşəli, ruhum oynaq,
Sənə, əlbət, gəlirim bir də qonaq!
Seyrə getdikcə yaxından səni mən,
Xeyli dəm ayrılaraq kəndimdən
Gur bulaqlar kimi qaynar, daşarım,
Nəşədən özgə bir aləm yaşarım.
Olarım mən o zaman bir şair
Eyləməkçin səni, Göygöl, təsvir!

## DÖNÜŞ

Mədəni hücumu keçirtdik həyata,
Qalmadı keçmişdən bir nişan, bir əsər.
Minərkən quş kimi çaparaq bir ata,
Bir yola salındı ölkəmiz sərbəsər.

İndi də "sürəkli iş günü" hər kəsi
Ayırır yolundan Əhmədin, İsanın.
İşləyib canlara çarxların nəğməsi,
Uçulur qübbəsi məscidin, kilsanın.

Dövranın günləri, ayları, illəri
Bir başqa mehvərin başına dolanır.
Görüncə bir sıra zərbəçi əlləri
Keçmişin müztərib ürəyi bulanır.

Tutuldu tarixin dolaşıq yolları,
Bağlandı üzünə günəşli qapımız.
Bu köhnə yolçunun bağlandı qolları,
Bir səslə çığırdıq üstünə hamımız:

– Biz yeni tarixin qüvvətli oğluyuq,
Yolumuz başqadır, izimiz başqadır!
Həycanla, həvəslə, tufanla doluyuq,
Fikrimiz getdikcə cahana əl qatır.

## YARIŞ

Hər kəsin əlində beşillik bir plan,
Hər yerdə başlamış diqqətli axtarış.
Hər yerdə başlamış sürətlə yapılan,
Qafalar sındıran dəyərli bir yarış.

Şaxtalar, zavodlar, fabriklər yarışda,
Ocaqlar, dəmirlər, çəliklər yarışda.
Çıxmışdır yarışa qayışlar, təkərlər;
Çıxmışdır yarışa mədənçi, çilingər.

Beyinlər, duyğular, ürəklər yarışda,
Sementli özüllər, dirəklər yarışda.
Sobalar qızışıb, töyşüyür körüklər,
Çağlayır borular, oxuyur düdüklər.

Köylərə sürüylə daşınır traktor,
Obalar kəsb edir möhtəşəm bir dekor.
Kəndlilər təklikdən bədgüman olub da
Gurlayır kolxozda, çaxnaşır klubda.

## ÇATMAQ, ÖTMƏK

İndi biz cahanla çıxmışıq yarışa,
Qoy etsin el-aləm bizləri tamaşa.
Deyirlər Amerka göylərə ucalmış,
Üfüqlər onların önündə alçalmış.
Deyirlər insanla, həyatla bərabər
Nyu-York şəhrində yürüyür səkilər.
Deyirlər göy yerə, yer göyə qatılmış,
Yaşayış fordların qoynuna atılmış
Qoy sürsün atını həvəslə Amerka;
Biz qızıl bir ata minərək bambaşqa
Bir hızla sıçradıq enişdən, yoxuşdan,
Fərqimiz olmadan qanadlı bir quşdan.
O çapdı, biz çapdıq, o getdi, biz getdik,
Az getdik, üz getdik, nəhayət düz getdik!
Dağlardan yel kimi –
Bir daşqın sel kimi
Kamandan sıçrayan bir sivri ox kimi,
Heç nədən, heç şeydən qorxumuz yox kimi
Yüyürdük, yüyürdük, yüyürdük sürətlə.

Qanında günəşlər qaynayan bir kütlə,
Ayrılmaz, çözülməz yoldaşca əməklə,
Bir sinif yolilə, birliklə, köməklə,
Düşməni qoymaqçın büsbütün geridə
Səsimiz gurladı, ötədə, bəridə!

## REKONSTRUKSİYA

Tozu dumana qatdıq, dumanı toza qatdıq,
Ortabab kəndliləri çəkdik kolxoza qatdıq.
Yürüdük, qarşımızda əyildi qarlı dağlar,
Yürüdük, aramızdan silinsin qolçomaqlar.
Yürüdük, arxamızca şaxələndi sementlər,
Dəyişməzmi bu halda bütün temperamentlər?!
Yürüdük avtolarla; elektriklərlə biz,
Yürüdük, sayəmizdə qucaqlaşdı dağ, dəniz,
Yürüdük, üstümüzdən çəkildi hər qaraltı,
Yürüdük, tunellərlə doldu dağların altı.
Yürüdük, küçələrdə hürküşdü çəlik atlar.
Yürüdük, üfüqləri qızartdı plakatlar.
Yürüdük, ənginlərə çəkdik dəmir dirəklər.
Dirəklərdə tutuşdu, yandı qızıl ürəklər.
Yürüdük, çöllər boyu raylar axdı, uzandı,
Türksib yollarında yatan ellər oyandı.
Yürüdük, hər zərrəmiz oldu bizim avtomat,
Bu yürüşə Amerka özü belə qaldı mat!

## ƏLLƏR

Könlüm ova çıxarkən gənclik iqlimlərində,
Əllərimdə sıxıldı bir qaç nazlı göyərçin.
Öylə bir şəfqət hissi oyatdılar ki, məndə
O quşların halına sızladım için-için.

Oxşadıqca oxşadım, incitmədim onları,
Yumşaq qanadlarında buraxmadım bir ləkə.

Sovrularkən ətrafa qışın qarı, ruzgarı,
Bağrımın başı oldu onlara isti ölkə.

Bir gün göyərçinlərim qanadlanıb uçdular,
Əvət, o quşlar bütün oxşadığım əllərdi
Ki, hamsı qəlbim kimi köksümdə titrəşərdi.

Yalnız onların biri hənuz xatırımda var,
Öylə ki, əllərimlə sinəmdə oxşanarkən
Saplamışdı ruhuma dırnaq ilə bir tikən.

## AND OLSUN

Şairləri qanadında bəsləyən
İnsanların həyatını süsləyən
İncə ruhlu mələklərə and olsun!

Böynundakı dalğa-dalğa tellərə,
Qaşlarının altındakı sellərə,
Qəlbindəki istəklərə and olsun!

Gül üzündə yeni-yeni açılmış,
Xoş iyisi ürəyimə saçılmış
Qoxladığım çiçəklərə and olsun!

Qumruların yatağını oxşayan,
Pişik kimi ayağını oxşayan
Salxım-salxım küləklərə and olsun!

Buludlardan ildırımlar çaxdıran,
Göy üzündə çırağbanlar yaxdıran
Ala gözlü şimşəklərə and olsun!

Həp səninlə görüşməkdir diləyim,
Uğurunda gecə-gündüz çəkdiyim
Zəhmətlərə, əməklərə and olsun!

Gəncliyimə qanad verən, ruh verən,
Hər dəqiqə ayrı cilvə göstərən
Əlirişməz diləklərə and olsun!

Bu həyatın fərqi yoxdur dənizdən,
İştə onun üzərində rəqs edən,
Qanadlanan ürəklərə and olsun!

Sənsən mənim həyatımın məhvəri,
Sənsən mənim gənc ömrümün rəhbəri,
Tapındığım fələklərə and olsun!

## BULUDLAR

O zaman ki, üfüqlərə bəziniz dalar
Qəlbən sizi pək sevərim, yolçu buludlar.
Bu gün yenə
Əllərimi sizə doğru qaldırdım,
Bu əməldən nə saldırdım?
Əvət, heç nə!

Tutqunsunuz, qəlbinizdə yoxsa varmı sancınız?
Bu hərcayı gəzişdən nədir ya qazancınız?
Buludlar, buludlar,
Pərişan buludlar,
Başımın üstündə kişnəyib
Yarışan buludlar!

Bəziniz çox kəsif,
Bəziniz pək xəfif
Buludlar, ey dolğun qədəhlər,
Göylərin ovcunda bir yel əsincə titrər,
Əsərsiniz
Nədən siz?

Sizi ruzgarmı çaldı, onunçunmu soldunuz?
Onunçunmu dəyişdiniz, darmadağın oldunuz?
Qaçdınız ağlaya-ağlaya,
Döndünüz bir şəffaf parçaya.

Bəziniz çox yunul efir qanadlı,
Bəziniz paslanmış dəmir qanadlı,
Nə bu qadar göy üzündə gəzərsiniz?
Özünüzdən çıxan zaman,
İzinizdən çıxan zaman
Həqiqətən sevgilimə bənzərsiniz!

Ey coşqun gəncliyim, ey havalı quş,
Oxuduğum şərqi dinlənməz olmuş.
Ey şeir yazmaqla keçən günlərim,
Siz ki ən vəfalı günlərimsiniz.
Baxıb buludlara gülümsəməkçin,
Sevgi nəğmələri bəstələməkçin
Mənə müsaidə verərmisiniz?

Çünki keyfim kökdür, damağım çağdır,
Şimşək çaxdırmaya mən də hazıram,
Buludlar başında patlayacaqdır
Könlümdə qıvrılan böyük ildırım.

## QOŞMA

Şimşək kimi buludları qovaraq,
Verdim parlaq çiçəklərə könlümü.
Günəş kimi qaranlığı boğaraq,
Verdim odlu diləklərə könlümü.

Cavan ömrüm bir mum kimi sönərkən,
Yüksəklərdən alçaqlara enərkən,
Əməllərim bir səraba dönərkən,
Çaxıb verdim şimşəklərə könlümü.

O zaman ki, sahib oldum qanata,
Bir quş kimi nəzər saldım həyata,
Etdi məni gənclik şövqüm əhata,
Verdim sərxoş küləklərə könlümü.

## BAYRAM AXŞAMI

Yadımdadır çocuqluqda
Əziz bayram gecələri...
Anam, atam, üç qardaşım,
Qoca nənəm, bir də əri.

Toplaşırdıq bir süfrənin
Gülə-gülə dövrəsinə.
Nənəm derdi: – Qurban olum
Yaradanın süfrəsinə.

Bir sininin kənarında
Yaxılırdı iki-üç şam,
Qarşımızda şəkərbura,
Noğul-nabat, püstə-badam.

Hələ üskü axşamları,
Qiyamətdən nişanədir.
Oynamaqçın çocuqlara
Böylə günlər bəhanədir.

Ocaq yaxıb, od qalayıb
Üzərində atlanırdıq.
Oynayırdıq yorulduqca,
Yorğunluğa qatlanırdıq.

"Gün çıx" deyə, "Gün çıx" deyə
Çalxanırdı sevincimiz.
"Kəhər atı min çıx" deyə
Qışqırırdı ən dincimiz.

Əynimizdə təzə paltar,
Başımızda təzə papaq.
Odlu məşəl əlimizdə
Dolaşırdıq soqaq-soqaq.

Qışqırırdıq, bağırırdıq
Ölçə-ölçə küçələri.
Söz qısası, xoş keçirdi
Bizə bayram gecələri.

Sabah Novruz bayramıdır
Deyə-deyə yatıyorduq.
Çəkdiyimiz acıları
Sevinclərə qatıyorduq.

Bu axşamsa mən yalnızam,
Ətrafımda yox bir kimsə.
Qapdırmıyor bu yalnızlıq
Fəqət məni qeyri hissə.

Mən bu gecə sabahı bəkliyorum səbirsiz,
Sabah məndən xəbərsiz
Anlamıyor həycanımı, duyğumu;
Zəncirləyib gözlərimdə uyqumu.

İçində bir yatağan qıvrılıb gərinmədə,
Xəyalən xəyalıma al şəfəqlər sinmədə.
Yox bu gecə mən özümdən fərqliyim.

Qarşımda bir kalendar...
Baxmaqdayım, baxınmaqda haqlıyam.
İstiyorum bir ruzgar
Pəncərəmdən əsə-əsə
Bir nəfəsə,
Bu gecəyi unudulmuş gecələrə çevirsin.

Bir ruzgar ki, şəffaf barmaqlarilə
Bir vuruşda devirsin
Son dəmini yaşayan bu yaprağı,
Bir ruzgar ki, büllur dırnaqlarilə
Tırmalasın otuz deyə mana baxan varağı.

Bu varağın arxasında
Çünki şanlı bir mayis var,
Bir mayisin yaxasında
Qıpqırmızı bir köküs var.

Bir köküs ki, yeni həyat
Sevdasilə dalğalanır.
Yfüqlərdə çalıb qanat
Şəfəqlərdə yırğalanır.

Odur ki mən sabahı bəkliyorum səbirsiz,
Sabah məndən xəbərsiz
Anlamıyor həycanımı, duyğumu;
Zəncirləyib gözlərimdə uyqumu
İçində bir yatağan qıvrılıb gərinmədə,
Xəyalən xəyalıma al şəfəqlər sinmədə.

## QAFQAZ

Bu dağlar, göylərdə oynayan bu dağlar,
Bağrında filizlər qaynayan bu dağlar...
Buludlar rəqs edər bunların başında,
Döşündə guruldar çayların nərəsi;
Hər zümrüd yamacı, hər yaşıl dərəsi,
Min cövhər gizləmiş ən kiçik daşında.
Həp sənsin deyilmi olanım, olmazım,
Qafqazım, Qafqazım, qazanclı Qafqazım.

Bu yüksək dağların nöqsan var nəsində
Qaynarkən mədənlər atəşli köksündə.
Nefti var, qazı var, boranı, qarı var,
Şənlədir zavodda, fabrikdə hər kəsi,
Bakının buxtası, Tiflisin Zagesi.
Sabunçu uğuldar, Riyonges guruldar,
İstərim bunlarla çınlasın avazım,
Qafqazım, Qafqazım, qazanclı Qafqazım.

Meşələr, o ləpir görməyən meşələr,
Kimsəyə könlünü verməyən meşələr...
Çəlikdən mişarlar gözləyir, deyilmi?!.
Al kəmər taxalım bunların belinə,
Gürcüstan söyləyir: hər daşqın selimi,
Alınız, veriniz çarxların əlinə.
Olmasın kimsədən minnətim, niyazım,
Qafqazım, Qafqazım, qazanclı Qafqazım.

Sardıqca dağları voltlarla günəşlər,
Altında xalqımız bir yeyər, bir işlər.
Bir zaman gələcək, hər yerin olacaq
Aləmə xoş gələn rəngbərəng bir dekor.
Haçadil atların dəmirdən olacaq,
Kolxozun sürdükcə zəmidə traktor,
Şişəcək Kür çayım, coşacaq Arazım,
Qafqazım, Qafqazım, qazanclı Qafqazım.

Ey bu gənc dağların biqərar yolçusu,
Qanadlan! Çalındı yüksəliş borusu.
Ey cənub tərlanı, döyünsün ürəyin,
Yılmadan[1] havalan bu alı dağlara,
Dərəsi, təpəsi bahalı dağlara.
Bir sabah olarkən qızıldan dirəyin,
Səslənib duracaq əlində şən sazım,
Qafqazım, Qafqazım, qazanclı Qafqazım.

## SEVİNC

Bu gün mən dolaşırkən, bu əmək torpağında
Saçlarım təbiətin bülluri darağında
Necə köpüklənirsə, çoşqun qəlbim də öylə
İstərim ki, qabarsın uzun bir sevinc ilə.
Bir sevinc ki, bəlirsin yağlımda-yavanımda,

[1] *Yılmadan* – cəsarətlə, qorxmadan

Dolaşsın könül-könül Şəkimdə, Şirvanımda.
Sanmayın ki, həsrətəm bu duyduğum sevincə,
Bir cilvə aşinadır hər tazaya, hər gəncə.
Bu cilvəyi yaratmış gəncliyin ərlikləri,
Bakının zavodları, Gəncənin fabrikləri.
Bu sevinci yaratmış əmək çəkən fatmalar,
Dəzgahının başında tərlər tökən fatmalar.
Zəmilərdə traktor işlərkən gurhagurla
Mənim üzüm dikilir səmalara qururla.
Mənim dəxi sevincim artıb içimdə qat-qat
Toxunmada köksümə sərin qızıl bir qanat.
Siz ey bizdan uzaqda qışqırıb bağıranlar!
Paris soqaqlarında zəncirini qıranlar!
Sizin düşüncənizdən iraqdır türk gəncliyi,
O hər şeyi yapmada; o hər şeyi yapacaq.
Türk gəncliyi olaraq ucu almaz bir bıçaq
Girməkdədir gözünə həp müsavatçıların,
Qurur o günəşlərə qarşı duran bir yarın.
Gəncliyin gurultusu səsinizi kəsiyor,
Fikrinizin yerində qızıl yellər əsiyor.

## HEYKƏL QARŞISINDA

O yerdə ki, bürclər düşgün nəzərlərilə
Dalğın-dalğın baxıyorlar gəlib-gedənə,
O yerdə ki, radio yeni xəbərlərilə
Şən bəstələr dinlətiyor yoldan ötənə.

O yerdə ki, tramvayın zil səslərilə
Qarışıyor təbiətin gürültüləri,
O yerdə ki, siliniyor – bir növ böylə –
Ürəklərin təsadüfi döyüntüləri.

İştə orda baxıyor bir canlı heykəl;
Bir heykəl ki, dalmış köhnə düşüncələrə.
Bir heykəl ki, çöhrəsində gizli min əməl,
Fəqət daşdan nəzərləri dikilmiş yerə.

Seyr ediyor sanki kəndi çevrəsindəki
Qaynaq kimi qaynayaraq daşan həyatı,
Seyr ediyor o, Kommunist küçəsindəki
Özündən çox irəliyə qoşan həyatı.

– Seyr et, Sabir! Bu seyr ediş haqqındır sənin,
Çünki sən bu zamanı görmədən öldün.
Seyr et necə dəyişmişdir işçi vətənin,
Çünki, şair, muradına irmədən öldün.

O zaman ki, Hadi coşqun şeirlərilə
Söyliyordu çox parlaqdır istiqbalımız,
Sənin könlün, fəqət məhzun şeirlərilə
Deyirdi ki, yox, lağlaqdır istiqbalımız.

Əvət, Sabir! Sən hər şeyi gördün və yazdın,
Mühitini əks etdirdi tərənnümlərin.
Təbiidir, sən şairdin, dinc duramazdın,
Ona görə iynələrlə dolmuş əsərlərin.

Sabir, fəqət bir gələcək məsələsində...
Qapılaraq hissə bir az yanıldın gərək.
Bilmədinmi yeni nəslin coşqun səsindən
Bu iqlimə ildırımlar qanad gərəcək?!

İndi burax düşüncəni, çevrənə bir bax,
Bir bax necə ətrafında qaynıyor həyat...
Uçmaq üçün hər kəsdə var böyük bir maraq,
Çarpınıyor, sanki olmuş daş-divar qanat!

## AVRAL

Mədəndə bu gün fırtınalar var,
Çalxanmada ətrafa axınlar.
Avralçıların coşqunudur bu,
Div səsli maşınlar kimi gurlar.

Bir xeyli zamandır hərəkət yox,
Məhsullu buruqlarda kəsir çox.
Bir işçi gəlib vəcdə deyir ki,
– Tez verməliyik işlərə talçok!

Min at gücü varkən canımızda,
Can yox nə üçün fantanımızda?
Minlərcə nöyüt haləsi parlar
Hər damla qızılgöz qanımızda.

Bir dəm yapışın güclü qolumdan
Feyz almaq üçün böylə hücumdan.
Mən zərbəçi bir işçiyəm, əsla,
Ölsəm belə dönməm ki, yolumdan!

Avral nə deməkdir? Geri getmək.
Lazım bunu bilmərrə yox etmək!
Avral bizim əskikliyimizdir;
Yüksəkliyimizdir – çatıb ötmək!

Mədəndə bu gün fırtınalar var,
Çalxanmada ətrafa axınlar.
Avralçıların coşqunudur bu,
Div səsli maşınlar kimi gurlar.

## AĞ DƏNİZDƏ FIRTINA

Ağ dənizdə fırtına var, fırtına!
Ağ dənizi bir tufanlı böhran almış sırtına.
Coş dəniz, coşqun dəniz!
Daş dəniz, daşqın dəniz!
Aşqın dəniz!
Şaşqın dəniz!

İki cəbhəyə ayrılmış dalğaları dənizin,
Sürünməkdə dizin-dizin

Burjuazi –
                    bu cəbhənin birisi...
Digər cəbhə bizim cəbhə –
                    mavi kömləklilərin.
Bu cəbhə sonsuz, dərin
Bir qüvvətə sarılmış.
Dağları dənizin iki qola ayrılmış.
Dəniz ələn
Sinif duyğusilə çarpınan
Bir kommunist qəlbi –
                    kibi...
Dəniz sudan qamçılarla
Göstərib hünərini –
Döyəcləyir qıvrıla-qıvrıla
İtalyanın faşist sahillərini.
Dənizdə həyəcan var,
Xələcan var,
                    xələcan...
Hər fırtına mavi kömləkli bir can...
Səndən dərindir bu fırtınanın mənası,
Ey Eyvazovskinin "Dənizdə fırtına"sı.

Bu fırtına hələlik çalxanmayan Fransanın
Sallanır ətəklərindən.
Bu fırtına coşunca öylə sanın
Ki, doğacaq qasırğa Rur küləklərindən.
Almaniya,
Tarix bir pula dəyərmi ya,
Sinif duyğusilə qəlblər vurmasa,
Fırtına durarmı, külək durmasa?!

Deyil bir Ağ dənizdə,
Bilirsiniz bunu siz də,
Atlas dənizində, Baltik dənizində,
Bu dənizlərin ən qaranlıq dəhlizində
Fırtınalar vermiş baş-başa.
Ey Polşa

Yarın hərb olsa əgər
Fırtınamız coşacaq.
Olacaq hər dalğası bir xəncər –
bir bıçaq!
Ağ dənizdə fırtına var, fırtına!
Ağ dənizi bir tufanlı böhran almış sırtına.
Coş dəniz, coşqun dəniz!
Daş dəniz, daşqın dəniz!
Aşqın dəniz!
Şaşqın dəniz!..

## YARIŞ

Bu arzu göylərdən enmədi, yahu,
Makina əsrinin fərmanıdır bu.

Kapital boynunu şişirmək için
Böylə bir yarışa çıxdı ilk öncə.
Kəndi şorbasını bişirmək için
Ocaqdan ocağa uzatdı pəncə.

Öncə səhmdarlar gəldi diz-dizə,
Həpsi toxluğundan açdı ağzını.
Acıqla çıxdılar sonra üz-üzə,
Bu yarış qovğaya çəkdi bəzini.
Dünən üç iqlimdə qurulan pusu,
Həycanlı ciblərin son həvəsiydi,
Gözlərdə dolaşan qanqırmızı su
Ötən yarışların nəticəsiydi.

Hər kəs bilir
Bizim yarış
Nə deməkdir,
Niçindir.
Bu çırpınış, bu axtarış
İctimai cəmiyyəti sağlam qurmaq içindir.

Məmləkətə, cəmiyyətə, əzizinə,
Özünə
Kim istərsə qursun böyük bir yarın,
Tutsun ətəklərindən bu çapqın yarışların.
O da bu yarışda əjdərə dönsün,
Bir qından çıxan xəncərə dönsün.

Zavodlar da, fabriklər də coşaraq,
Bu yarışa hazırlamış bir maraq.
Sobalar çıtırdıyor,
Təkərlər tıqırdıyor,
Tövşüyor körüklər,
Ötüyor düdüklər.

Əksi-səda verən dəmir dirəklərlə bərabər
Bunlar çıxmış yarışa.
Bir ciddi axtarışa
Umuzlarla, biləklərlə, ürəklərlə bərabər.

Bu yarış,
Bu axtarış
İstiyor ki,
Diyor ki,
Könül dənizləri coşub qabarsın.
Sağlamlaşıb şüuru hər işçinin,
Taleyini sürükləsin sevincinin
Arxasınca aparsın.

Lirikanın dənizləri hər çöldə,
Hər könüldə
Bir səraba dönərkən,
Hətta söz söyləmək də ağır bir iş deyildir,
Kim istərsə yazar şeir,
Lakin bir az beyinlə əylənərək oynamaq,
Yarışa çıxmaq gərək.
Çağlayan kimi coşmaq, bulaq kimi qaynamaq,
Ürək damarlarını yerindən qoparıb da
Həyat dinən klubda
Ovucda sıxmaq gərək.

Hər kəs bilir
Bizim yarış
Nə deməkdir,
Niçindir.
Bu çırpınış, bu axtarış
İctimai cəmiyyəti sağlam qurmaq içindir.

## ÇADRALI QIZLARIMIZA

Sizə indi diyorlar: – Çıxınız bu örtüdən,
Qovunuz üzünüzdən bu məlun buludları.
Bunların fərqi yoxdur acı bir üzüntüdən,
Parçalayıb yırtınız bu köhnə yadigarı.

Bu xitabı bəlkə siz xoşlayıb bəyəndiniz,
Qəlbinizdə titrədi şəfəqlənən arzular,
Bəziniz də çarşafı yandırıb sevindiniz,
Fəqət bunu başında daşıyan daha çox var.

Bir çoxu anasından, bir çoxu babasından
Qorxaraq bu çizgini sürüklüyor peşincə.
Bəzi əskidən əski olan əqrabasından
İstəmiyor eşitsin hər ağız sözü, məncə.

Yaxşı qız! Bəlkə sən də utanaraq məhlədən
Vida etmiyorsun o zülmətin övladına?
Qorxmadasın bir xətər toxunar qanadına
Fəqət bu deyil bizə yaşayışı öyrədən.

Qaya uçdumu, əlbət, toz qopacaq yerindən,
Buludlar sıxılınca ildırımlar guruldar.
Qoy onlar nə der desin, sənin əməllərində
Möhtəşəm dənizlərin çiçəkləri parıldar.

Düşün, bil ki, o çadra, bayquş qanadlı çadra
Şərqin qaranlıq, siyah mühitindən toxunmuş.
Aləm dəyişmiş indi, o Şərq hara, sən hara?
Mərsiyəsi o Şərqin çünki çoxdan oxunmuş.

Təbiidir ki, ay qız, yaz ayları gəlincə
Yarpaqlanıb pərdədə qalmaz örtülü qöncə.
Rəvamıdır yurdunun açıq bir səhərində
Dalğalansın bir bahar buludu gözlərində?!

Həyatın səslərindən kəsb edərək iqtidar,
Bu qaynar məmləkətdə qoş, oyna, sıçra, hayqır!
Onsuz da həyat adlı, çəlik barmaqlı ruzgar
Başınızdan çarşafı götürüb qaçacaqdır.

## HƏR ŞEY COŞQUNDA...

Bu gün hər kəsdə böyük həyəcan var,
Bu gün hər çöhrədə bir xələcan var.
Hərlənir iştə beyinlər, başlar,
Hərlənir şövq ilə dağlar, daşlar,
Hərlənir ölkəmizin hər tərəfi,
Qoca ərzin böyük işlər tərəfi.
Hərlənir zərbəçi fabriklərimiz,
Hərlənir qos-qoca elliklərimiz.
Hərlənir şaxtaların qatları da,
Hərlənir ordumuzun atları da.
Hərlənir boylu buruqlar, dolanır;
Buna xaricdə ürəklər bulanır.

## QURULUŞ

Göstərib iştə beşillik planı,
Sarsıdıb yıxdı kökündən cahanı
İşçilər – ölkəmizin işçiləri.
Çünki var bizdə mətanət kəsəri.
Böyük işlərdə irəlilərkən biz,
Hərlənir daxili düşmənlərimiz.
Biz açarkən bizə düzgün yollar,
Sürünür arxada “sağlar”, “sollar”.
Biz Dneprdə yapırkən şadlıq,
Dalğalardan dağa sərpildi işıq.
Girişərkən işə Selmaş zavodu,
Sardı “sağ cəbhə”ni heyrət, qorxu.
Biz kəsərkən Arazın qarşısını,
Kavur-arx pambığın ən yaxşısını

Coşaraq, çağlayaraq verdi bizə,
Qoca Kür “möcüzə” göstərdi bizə.
Səsi gəldikcə çırağban Zahesin,
Məncə bir məqsədi var hər bəhsin.
O qədər çox ki, böyük işlərimiz.
Onu nəql etməyə şeirim aciz...
Bu zaman bizlərə ancaq
Ən kiçik şeydə böyük şey aramaq.

## KƏSİR

Var bu gün bolluca benzində kəsir,
Buna lazım quralım bir tədbir.
O deməkdir ki, bu, biz işlərkən,
Düşəcək qollarımız qüvvətdən.
O deməkdir ki, bu göylərdə bizi
Gözləyirkən yeni dünya bəhsi,
Bir kilid bağlanacaq ağzımıza.
O deməkdir ki, bu benzin dursa
İşləyən hızlı saatlar duracaq;
Fabrikin qəlbi də tənbəl vuracaq.
Benzinin varlığıdır varlığımız,
Benzinin darlığıdır “darlığımız”.
Benzinin çoxluğudur “çoxluğumuz”,
Benzinin yoxluğudur “yoxluğumuz”.
Güçlənirkən günü-gündən qolumuz,
Bəs azalsın nə üçün petrolumuz?
Benzin olmazsa bizim divlərimiz
Qalacaqdır hərəkətsiz, səssiz.
Benzinin azlığı yaxud duruşu
O deməkdir ki, siniflər vuruşu
Bu geniş ölkədə “sakitləşəcək”,
Qolçomaqlar bizə “üstün gələcək”.
Yox, sinif duyğusu sönməz, sönməz!
Atılan ox geri dönməz, dönməz!
Benzin artarsa, iş artar, çoxalar,

Ölkədə yüksəliş artar, çoxalar.
Benzinin qüvvətidir qüvvətimiz
Benzinin sürətidir sürətimiz.
Birləşib coşsa əgər qüdrətimiz
Və çəlikləşsə dəmir vəhdətimiz,
Məncə, benzində xətər qalmayacaq
Və kəsirdən bir əsər qalmayacaq!

## RÜSTƏMƏ

Dinlə, qəlbimdə, Süleyman Rüstəm,
Sənə dair kiçicik bir nəğməm,
Kiçicik – dağ kimi bir dalğam var,
Bir dənizdir ki, o dalğam çağlar...
Haydı, Rüstəm, çıxalım gəl yarışa,
Çıxalım mövzu üçün axtarışa!
Aləmə vəlvələ salmaq lazım,
Quruluş şairi olmaq lazım!
Çapar atlar kimi çapmaqda həyat,
Bizə keçməkdə bu dövran, heyhat...
Yataraq uyquya dalsan bir də,
Bizi varlıq qoyacaqdır geridə.

## BİZİM OTAQDA

Otaq heyrət içindədir
Ətrafında gurultu.
Nəzərlərdə bir arayış,
Ürəklərdə döyüntü.

Qarışmışdır bir-birinə
Neçə nəfər yataqdaş.
Həpsi fikir yürütmədə,
Hər dimağda bir təlaş.

Biri deyir: – Məni yazma!
Biri deyir: – Məni yaz.
Bu lazımlı bir işdir ki,
Ondan qaçmaq yaramaz!

Biri deyir: – Elə isə
Mən burada qalmaram.
Mən öz geniş həyatımı
Çərçivəyə salmaram.

– Sən danışma, yoxdur sənin
Heç siyasi savadın,
Köhnə həyat qəfəsində
Çırpınarkən qanadın

Bizim yeni üfüqlərdə
Uçamazsın təbii,
Ya sən bizdən artıqmısın.
– Buraxsana, ay Səbi,
O, girməyir, qoy girməsin.
– Bu olacaq şey deyil,
Girməyənlər aramızdan
Çıxmalıdır, bunu bil.
Bax, yoldaşlar, kommunaya
Keçmiş bütün otaqlar.
Bu əməldən bir bizimki
Geri qalmış bir qədər.

Gəlirindən hər tələbə
Bir payını verməli,
Tezlik ilə qurduğumuz
Kommunaya girməli.

Girməyənlər yerli-dibli
Köçməlidir buradan.
– Necə yəni köçməlidir,
Bu da sözmü? – Aradan

Rüstəm haman bir davamsız
Çocuq kimi bağırdı, –
– Mən girmirəm sözün nədir?
Deyə bərkdən çığırdı.

– Sən deməli kommunanın
Ziddinəsən, eləmi?
Biz bu yeni yaşayışa
Çağırırkən aləmi,
Sən meşşanlıq girdabında
Çalmadasın əl-ayaq.

Bir başqası uzandığı
Yatağından qalxaraq:
– Doğrusu mən kommunaya
Danışıqsız girərdim.
Bəlkə onun mənə düşən
İşini də görərdim,
Lakin onun bişmişini
Yeyə bilməm doğrusu.

Özü bilər.
– Səndən gəlir
Mədaraçı qorxusu.
– Necə yəni özu bilər?
Biz güzəştə getmərik.
Aramızda olmamalı
Bizim ayrı-seçkilik.
Bu gün bizim qarşımızda
Sarsılmayan bir yol var.
Gah oyana, gah bu yana
Əyilmədən nə çıxar?!

Bir tələbə uzaqdan bu
Həngaməyi süzmədə,
Nəzərləri dalğın-dalğın
Bağdadı da gəzmədə.

O böylədir, kəndisini
Heç bir işə vuramaz.
Guşənişin bir adamdır,
Xeyrə, şərə yaramaz.

Onu görən sanar yazıq
Düşmüş dildən, ayaqdan,
İki kəlmə söz sorsanız
Durub qaçar yataqdan.

– Yaxşı, Cəbi, yavaş danış,
Kifirləşir Ələsgər.
Toxununca kulaqlara
Bu ad, haman güldülər.

– Ey Ələsgər, bitərəflik
Vaxtı deyil.
– Nə var ki?
Teymur qaqqıldayıb güldü,
– Ah, bu Teymur qoyar ki...
– Bəli, bir padşah bir gün darılmış,
Qəlbinə amansız qəmlər sarılmış,
Əl çalmış, vəziri gəlmiş hüzurə,
Üzünü tutaraq demiş vəzirə:
– Bir dastançı gətir.
Əməl olunmuş,
Ansızın bir nəfər hazır bulunmuş.
Zal oğlu Rüstəmin hekayətindən,
Onun mərdliyindən, fərasətindən,
Vurub yıxmasını, şücaətini,
Basıb kəsməsini, məharətini
Bir-bir tərif edib bitirən zaman
Padşah başını qaldırıb haman
Sormuş ki: – Heyvandı o yoxsa insan.
Vay sənin halına müəllim olsan.
Biz burda məsələ həll etməkdəyiz
Kənardan nə var ki?.. Sorursunuz siz,

Siz yarın müəllim olsanız əgər
Məndən akademik olar. – Ələsgər
Dinləyib Cəbini, boynunu bükdü,
Üzünə bir sarı qızıllıq çökdü.
– Nə var ki, yaz məni.
– İş onda deyil,
Sən özün iştirak etməlisən, bil,
Bizim quruluşda, bizim gedişdə.
– Yenə fəlsəfəyə başladın iştə,
Boş yerə sıxılıb özünü yorma.
– Yaz məni.
– Məni də.
– Yaz məni durma...
Deyə bütünlüklə yazıldı həpsi.
Bunların içində fəqət birisi
Baxıb durmadaydı səssiz kənardan,
Ayrılmaq istərdi bu dalğalardan.
Almışdı gözləri bir dərin baxış,
İçində yatağan, dilində qarğış.
Üzünü turşutdu, qaşını çatdı,
“Eh!..” deyib yerində yıxıldı, yatdı.

## BƏYAZ ÇÖLLƏR

*Əgər su damənin tutdum, rəvan döndərdi üz məndən*
*Və gər güzgudən umdum sidq, əksi-müddəa gördüm.*

***Füzuli***

*Xayır, məndən sular dönməz, təbiət pəncəm altında,*
*Baxıb ayinəyi-qəlbimdə əksi-aşina gördüm.*

***M.Müşfiq***

Çoxdandır bir şeir yazmamışam mən,
Çoxdandır bir nəğmə tutdurmamışam,
Çoxdandır ayrılıb şeir aləmindən,
Xəyal dənizinə baş vurmamışam.

Fikrim qasırğalı dəryalar kimi
İstənilən qədər dalğalanmamış,
Könlüm uzaq gedən xülyalar kimi
İncə buludlarla çulğalanmamış.

Ürəyim ilk bahar selləri kimi
Atlana-atlana qaynamamışdır.
Ruhum Mil düzünün çölləri kimi
Bəyaz çiçəklərlə oynamamışdır.

Bir kəlmə bulmaqçın xeyli darılıb,
Əzaba, zəhmətə qatlandığım yox.
Aldığım mövzuya candan sarılıb,
Misradan-misraya atlandığım yox.

Nə kiçik bir dərə, nə bir mənzərə,
Keçməmiş zehnimin lövhələrindən,
Şeirsiz, nəğməsiz gəzib bir ara,
Heyhat, oynamamış könlüm yerindən.

## MİL DÜZÜ

Bir düz ki, fərq etməz xəyalın gözü,
Hər daşı bir çılpaq qərib öksüzü,
Məlul çöhrəli bir dulu andırır;
İnsanın fikrini dumanlandırır.
Ey illər uzunu çiçəksiz, otsuz,
Elçisiz, qonaqsız, kimsəsiz, yurdsuz,
İlanlar yatağı olan Mil düzü!
Yabançı əllərdə qalan Mil düzü!
Bilsən nələr keçmiş başından sənin,
Qəmgin torpağından, daşından sənin!
Bir kimsə etməmiş sana mərhəmət,
Salmamış üzünə "sayəyi-rəhmət".
Göylərin buludu sana yabançı,
Günəşin telləri sırtında qamçı.
Boş yerə yağmış da qarın, yağışın,
Bir alov kəsilmiş baharın, qışın.
Kimsə anlamamış faydanı sənin,
Alan olmamışdır qadanı sənin.
Odur ki, kədərin başından aşmış,
Yazıq, bilməmişəm ürəklər daşmış.
İnsanlar nankormuş tarix boyunca,
Çalıb çağırdığın yoxdu doyunca.
Dolanmış başına dönmüş fələklər,
Əsmiş uzərindən çılğın küləklər.
Tarixdən büsbütün adını silmiş,
Sana hər çapavul yağı kəsilmiş.
Şırıldarkən Araz yaxınlığında,
O zalım da qalmış öz qılığında.
Zavallı halına o da yanmamış,
Bir parça səninçin dalğalanmamış.
Bəzən üzərində tikanlı otlar
Göyərmiş, çoxuna vermiş umudlar.
Ellər köç eyləmiş, sürülər gəlmiş,
Qoynunda bir quzu səsi yüksəlmiş.

Bir səs ki, zülmətdə ağlayan bir səs...
Bir səs ki, həzindən çağlayan bir səs...
Bir səs ki, yoxluğun üstündə ölmüş,
Yenə o, yoxluğa batmış, gömülmüş.

## QƏDİM KARVAN

Gündüzlər çəkilmiş, gecələr çökmüş,
Buludlar qoynunda sanki bir gümüş,
Dərili qanğuru yavrusudur ay.
İştə yol ucundan çıxdı bir alay.
Poslası ulduzlar olan bir karvan,
İçdiyi sarı su, yediyi yavan.
Sarvanlar uyqulu, dəvələr yorğun.
Nədir bu heçlikdə bu gülünc oyun?!
Torpaq yaraları ayaqlarında.
Yazın istisində, qışın qarında
Saqlı üzlərində düşkünlük qəmi,
Ürəklərində bir xəzan axşamı,
Qarşılarındakı dənizlər sərab,
Ümidlər şikəstə, əməllər xarab,
Rahatlıq bilmədən yürür bu karvan.
– Karvan, bitməyəcək yollarla davan!
Yürü, – deyir ona göydə buludlar,
– Yürü, – deyir ona hər əsən ruzgar.
İlan nərələri: – yürü, – der ona,
Sərablar çəkmədə onu qoynuna.
Karvan, yazıq karvan, budur, su yoxdur,
Bu çöldə dağların qoxusu yoxdur.

Yanıq alınlarda bir acı röya,
Çınlayan bir çatlaq çan səsi guya
Hər göz qarşısında bir "cənnət" açar
Yolçular ayılar, uyqular qaçar.
İştə bu çan səsi, ah, bu çan səsi,

Bu çanın ruhlara ruh saçan səsi,
Bu quraq çöllərdə şəfqətlə çağlar.
Ulduzlara gülər, gecəylə ağlar.
Hıçqırar, boğular, nəhayət ölər.
Siyah bir girdaba düşər, gömülər.
Gecələr, gecələr, susuz gecələr,
Çılğın küləkləri quduz gecələr!

## RÜCU

Mil düzü, Mil düzü, geniş Mil düzü!
Eşit ürəyimdən gələn bu sözü.
Bu keçmiş halına acımam ki, mən.
Açıq danışalım, doğrudan da sən
Bəlkə bu sevgini, bu sevincini,
Bəyaz qızılını, bəyaz incini
Xanlardan, bəylərdən əsirgəmişsən,
Quduz köpəklərdən əsirgəmişsən?
Tanışlarım bilir bunu, sən də bil!
Mənim darğınlığım səbəbsiz deyil.
Bir Bakı işçisi birinci kərə
Baxıb çoraqlıqdan çıxan ellərə,
Govur-arx üstündə mitinq açaraq,
Köksündə çırpınan qırmızı bayraq
Dalğalanan zaman lenta kəsərkən,
Orda neçin, nədən olmamışam mən,
Könlüm Araz kimi havalanmamış,
Gurultum çöllərdə dalğalanmamış?

Deyirlər o zaman burda köylülər
Tutub dişlərində qalib türkülər,
Bir daşqın fərəhlə gəlmişlər vəcdə,
Araz da eyləmiş onlara səcdə.
Arazın önünü kəsən sipərlər
Qalxıb yüksəklərə açınca şəhpər,
Gənc bir arslan kimi kükrəyən Aras

Vermiş ətrafına dərin bir həras,
Sıçramış, köpürmüş, bayılmış, getmiş,
Mil düzünə sarı yayılmış, getmiş.

## MƏNİM ÇAĞLAYANIM

O gündən bəridir dəyişmiş rəngin,
Dəyişmiş büsbütün rəngin, ahəngin.
Səndə gurultulu bir çağlayan var,
Bu dönməz çağlayan durmadan axar.
O durmadan axar, dağ-dərə bilməz,
Qüvvəti daima artar, əksilməz!
Üstünə od yağsa gətirməz xətər,
O həyatla başlar, həyatla bitər.
Mənim çağlayanım axmış, axacaq,
Hər yerdə bir bəyaz iz buraxacaq.
Mənim çağlayanım çağlayır, dinlə,
Bolşevik gücünün qətiyyətilə.
Mənim çağlayanım kolxoza axır,
Dağların selini heyran buraxır.
Mənim çağlayanım xəyalım kibi,
Bəzən sakit axır, bəzən əsəbi.

## XİTAB

Nə qədər istəsək boş yerimiz var,
Canımız, qanımız, hünərimiz var.
Əkilən pambıqlar hələ azdır, az;
Bununla iş bitməz, əsla kar aşmaz!
Pambıq əkinləri gərək çoxalsın,
Qəlbimizdə gəzən həsrət yoxalsın.
Kimsəyə olmasın ehtiyacımız,
Bitsin həsrətimiz, bitsin acımız!
Pambıq çoxaldıqca, fabrik canlanır,
Kollektiv güclənir, birlik canlanır,
Pambığın çoxluğu çoxluğumuzdur,

Pambıq “çörəyimiz”, neft “suyumuzdur”.
Hər pambıq tarlası düşmənə mədfən,
Hər açılan qoza ona bir kəfən.

## PAMBIQ ŞAXLARI

Hər şaxın üstündə bir bəyaz xülya,
Bir titrəyiş duysa düşər qorxuya,
Dönər boynubükük yasəmənlərə,
Qırılar, tökülər, sərilər yerə.
O bəyaz xülyaya toxunun yavaş,
Yoxsa ürəyində duyar bir təlaş.
Dalğın bir şairin xülyasıdır o,
Mil düzünün bəyaz röyasıdır o
Ki, bu gün həqiqət şəklinə girmiş,
Bütün şübhələri yıxıb devirmiş.
Görünür tarlada ülviyyətimiz,
Nazik şaxlar təmiz, kolxozlar təmiz.
Hər qoza ləkəsiz çocuq varlığı,
Sığmayır dünyaya bəxtiyarlığı.
Mən neçin bu zaman fikrə getməyim,
Ya neçin fikrimi dərinlətməyim?
Mən neçin bu zaman coşub-daşmayım,
Ürəkdən həyata yaxınlaşmayım
Ki, bir gənc şairə lazım olan hər,
Hər dürlü mənzərə burda əks edər!

## ZƏFƏR SƏSLƏRİ

Gediriz,
Gediriz, gediriz,
Getməyir, uçuruz,
                    uçuruz...
Uçmayır, bir şimşək olub da çaxırız.
Axırız-axırız.
Keçmişin üzünə şillələr vuraraq axırız,
Elliklə yarını quraraq axırız.

## ZƏFƏRDƏN ZƏFƏRƏ

Beşillik planı
İki il yarımda yerinə yetirdik.
Deməli, bitirdik.
İşlərin qalanı
Daha çox,
Bir talçok
Gərəkdir verilən işləri
Aparsın iləri,
Aparsın iləri gələcək beşillik zəfəri
Hər şura nəfəri.
Cavab ver, Abşeron!
Qəlbində neçə ton
Bu axan
Yeni qan
Çağlamış fışqıra-fışqıra,
qışqıra-qışqıra?!
Yox, gərək
Bir çərək
Qalmasın boş yerin!
Yoldaşlar, göstərin
Torpağın altında,
Torpağın ən məchul qatında
Gizlənən o xəsis qaynağı!
Toxunsun ona bir mühəndis caynağı
Arasın zərbəçi mühəndis
Bizimçin yeraltı bir dəniz...

Arayır, aramış,
Bir qarış
Yer belə qaçmamış gözündən,
Dönməmiş sözündən.
Verdiyi ilqarı yetirmiş yerinə,
Baxınız, qaç yeni buruğun seyrinə
Daldırmış bizləri...
O, yüksək rəqəmə qaldırmış bizləri!..

## EHTİYAC

Qalsınmı fabrikdə
Dəzgahın bəndləri şirəsiz?
Dursunmu bir uzun herikdə
Traktor nərəsiz?
– Nöyüt ver! – söyləmiş firqəmiz
Ki, çıxsın yağının əlindən yaxamız.
Qoy artsın tələblər!
Bizi ki, sarsıtmaz afaqı səbəblər,
Çünki biz
Xırdaçı deyiliz.

## ZİYANÇI

Kimdir o, ziyançı mühəndis?
Çökmə diz
Yalandan önümdə!
Bugünkü döyüşkən günümdə
Tanıram səni mən
                    işindən.
Bilirəm nə varsa canında.
KPU-nun gözündən uzaqda deyilsin,
Qoy başın əyilsin
Firqəçi işçimin yanında!

## QƏDİM BAKI

Qaçmayır irəli,
                    qaçamaz!
Qırılmış şəhpəri,
                    uçamaz!
Keçməyir günləri binamaz.
Canamaz
                    üstündə kəsilmiş taqəti;

Vird etmək adəti.
Getməyir qabağa,
Yürüşü bir bağa
yürüşü...
Həyatı, görüşü
pək əski
bir Bakı.
Başının ağası
İngilis darğası.
Ey Murtuz, ey Nobel,
Bir daha bağlamaz sənə bel
buralar!
Biz bayram edərkən ürəyin aldımı yaralar?
O hansı zamandı,
Hər tərəf dumandı
O gecə?..
Başında bir sarı düşüncə,
Sarıydı əyninin paltarı,
Gəzirdin bulvarı.
Kaspinin üzündə oynaşan dalğalar,
qaynaşan dalğalar,
Əsdikcə giləvar
Oynardı bulvar.
Oynardı "ovlar", oynardı "zadələr",
"Zadələr" önündə qırılmış badələr...

## İRƏLİ

İləri,
Bakının zərbəçi ərləri!
İləri, yeni neft planı
Sarsıtsın cahanı!
İləri, yeni ruh, yeni can,
Bu uzun həyəcan
Bakıyı qaplasın,
Qəhrəman divləri bir yerə toplasın!

Ey işçi, sən necə saqlısan buruqda,
bu ruhda
Mən dəxi şerimdə saqlıyım.
Qoy məni tanıyan şerimdən tanısın,
Ey şerim, sən mənim işimin canısın.

Gediriz.
Gediriz.
Getməyir, uçuruz.
Uçuruz.
Uçmayıb bir şimşək olub da çaxırız,
Axırız-axırız!
Keçmişin üzünə sillələr vuraraq axırız.
Möhtəşəm yarını quraraq axırız!

## KÜLƏKLƏR

Mən də yazdım sənin kimi
Bir xeyli cəfəngiyat.
Fəqət heyhat
“Küləklər”im əsdi keçdi,
O da bir həvəsdi keçdi,
“Küləklər”im əsdi keçdi
Keçmişimlə bərabər.
Çoxdandır ki, “küləklər”dən,
O vərəmli əsərdən
Ölmüşmü, qalmışmı almadın bir xəbər
Mən ədəmə gedən “küləklər”in arxasınca
Baxmadım bir dul kibi.
“Küləklər”im əsdi keçdi
Nə mülayim, nə əsəbi.
Nə bir böyük fırtına qaldırdılar,
Nə qaralan qaşların altından
Bir bulud saldırdılar.

## İLLƏR

İllər külək yürüşlü,
                Qartal qanatlı illər.
Yaşayış yollarında
                Yəhərli atlı illər.

Hər biriniz nümunə
                Dalğalı bir dənizdən,
Ömrümüzün yelkəni
                Qayar üzərinizdən.

Bizi bu cədəlgaha
                Atar-atmaz anamız,

Başlar mühitinizdə
Coşmaya fırtınanız

Bəlkə biz olmasaydıq
Siz daim anlı-sanlı
Qoşardınız, nəşəyə
Ürəyiniz nişanlı,

Çobansız sürü kimi
Başınız boş olurdu.
Gündüzünüz fərəhli,
Gecəniz xoş olurdu.

İllər, bizi yoxluqdan
Varlığa atan illər...

## SU VƏ KÜLƏK

Zaman gələr
Torpaq bizdən
Əsirgəyər petrolunu.
Fəqət möhkəm bolşeviklər
Mübarizə səhnəsində
Yadırğamaz rolunu.
Yer üzündə sular var,
Sularda dalğalar var,
Dalğalarda ruzgar var,
Həpsi – bizim qüvvətimiz...
Biz suları, küləkləri
Fəth edəriz.
Külək – qüvvət,
Su – qüvvət,
Nə genişdir təbiət.
Bu il məchul iqlimlərə yelkən açan
Gedişlərin bayramı.
Fil xortumlu maşınların,
Xortumları altındakı
Qart dişlərin bayramı.

Başımızın üzərində
Hızla əsən
Qayalar var.
Ayağımız altında ilan-ilan
Qıvrılan
çaylar var.

Həp bunlarla genişlər
Dünyamızın çərçivəsi,
Bu çayların hər dalğası
Bir sarsılmaz at qüvvəsi.

## SULARDA YANĞIN

Üzgüçülər əllərində fanar,
Dneprdə su altında odlar yanar,
Əfsanələr əfsanəsi...
Qatı polad qatlarını
Parçalamaq çətin deyil,
Doğram-doğram edərək
Xırçalamaq çətin deyil.
Lakin sular altında
Poladları doğramaqçın
Məqsədə uğramaqçın,
Su altında qaz alovu yaratmaq
İnsan üçün bu sadə bir oyuncaq.
Üzgüçülər əllərində fanar,
Su altında odlar yanar
Əfsanələr əfsanəsi...

## DAŞ KÖMÜR

Fabrik, zavod çoxalır,
Ehtiyaclar həm artır, həm yoxalır.
Donbas bizə kömür verir,
Ocaqlara ömür verir.

O taylarda,
Altaylarda,
Yer altında,
Yerin gizli qatında
Qalın kömür qatları var.
Bu yeni il
Bu qatların bayramı...
Bu qatları didmək üçün
Şuraların ülgüc dırnaq
atları var.
bu yeni il – bu atların bayramı.

## USTALAR

Bu yeni il günəş deyil,
Elektrik işığilə işıqlanan
Bir diyarın bayramı.
Maşın yapan,
Kağız kəsən,
Hesab çəkən,
İp əyirən,
Əkin əkən
Cansız dəmir ustaların bayramı!

## SON

Bu yeni il Stalinqrad
Zavodlarında çıxan,
Ukrayna çöllərini,
Özbəkistan, Azərbaycan millərini
Hərəkətə gətirən
Pambıq, taxıl yetirən
Traktorlar bayramı.
Div motorlar bayramı.

Bu yeni il
Bizə həyat,
Bizə yeni bir kainat
Bizə qat-qat
Əzm-səbat
Gətirən il.
Bu il bizdən əvvəlki
Köhnə sərxoş il deyil.
Bu yeni il xaricdəki düşmənlərin
Şaşdığı gün.
Proletar qüvvəsinin
Aşıb-aşıb daşdığı gün.
Bu yeni il insanları dəyişən il,
Bu yeni il ictimai cəmiyyətçin döyüşən il.
Bu yeni il
dünyamızı çevirməkçin
Bir istinad noqtası.
Bu illərin əlindədir
Kapitalizmin noxtası.

## ÜÇDƏN BİRƏ

Yenə bizim könlümüzdən
bir səs gəlir,
Bu səs bizim qurduğumuz
həyat kimi yüksəlir.
Yüksəldikcə çəkir bizi özünə,
çəkir bizi –
Fikrimizi, qəlbimizi
Qardaşlığın günəşli gündüzünə.

Bu səs bolşevik səsi.
Bu səsə cavab verir
milyonların beynəlmiləl nəğməsi.
Bu səs tarladan qopur,
Bu səs dəzgahdan gəlir,
Bu səsin üzərində
həyatımız yüksəlir.

Cana gəldik
On-on iki il bundan əvvəl
bizə əngəl
Əsrlərin ehtiraslı əlindən;
Kürün rəngi qızardı
Qacarın Tiflisdəki
canavar əməlindən
Hər axına keçid olduq,
yaş süzməkdən yorulduq.
Əridi həyatımız,
Ağımız, bayatımız.

Unutmadıq Qarabağda
Qacarın qarşısında
lalə kimi sallanan
qanlı-qanlı başları.
Unutmadıq Gürcüstandan İrana
qamçılarla yollanan
təzələri – yaşları.
Unutmadıq Şirvandakı talanı,
Yox sözümün yalanı.
çapavul Osman paşa
Şirvanı tutdu daşa.
Qılınclara dayandı xəncərlər,
Qapılar, pəncərələr
yerindən çıxarıldı.
Hətta şişə gəlinlərin
cingildəyən bilәkləri qırıldı.

Unutmadıq yerli dərəbəylərin
Qışda isti, yayda sərin
ipək saraylarını.
Çox eşitdik tarixin
məchul üfüqlərindən
Yoxsul, köylü qızların
Odalıqlardan gələn
gücsüz haraylarını.

Unutmadıq çöllülərin
qarşısında diz çökən,
“Oğlum ölsün” – deyərək,
yalandan min dil tökən,
Hər arşına üç çərək
sürüşdürən taciri.

Unutmadıq ikibaşlı qartal çarı,
Çəkdi bizi gah aşağı,
gah yuxarı.
O da illər uzunu
Buludlu uzaqlardan
Bir qanlı şimşək kimi
sıyırdı xəncərini.

Unutmadıq onların
miyançısı kəsilən,
mərhəməti əksilən
Qafqazın bəylərini.

Unutmadıq xalqı soyan,
Xalqı quru yerdə qoyan
Seyidləri,
mollaları, axundları,
dərvişləri,
məscidləri, pirləri.
Bizi az oynatmadı, bu “cənnət müxbirləri”.

Unutmadıq müsavatı,
menşeviki,
daşnaqı.
Çalındı əməkçi kütlənin haqqı.
Hərəsi bir cahangirin nökəri:
Biri alman,
digərləri ingilisin çakəri.
Bunlar belə az qırmadı.
Bunlar da az anqırmadı
bu diyarda,
buralarda.

Bir gün qalxdı bizimkilər,
Keçmişləri yaxdı, yıxdı bizimkilər.
Bizimkilər
yıxdı, qurdu,
Qovdu burdan
bu üç qurdu.

Bu gün bizim şənliyimiz...
Biz hər şeyə hakimiz.
Hakimiz təbiətə,
Kür işlər, Zahes işlər.
Mil düzündə, Bakıda
Ağ qızıl, qara qızıl
Deyərək, hər kəs işlər.

Həyat genişləməkdə;
İnsanlar işləməkdə.
Çağlayanlar əlimizdə güc olur.
Yarın savaş olursa,
fikrimiz çəkic olur
Əzmək üçün kapitalın başını.
Biz atmışız, atacağız
tək daxmanın,
tək öküzün, tək tarlanın,
tək ocağın, tək odun,
tək fabrikin, tək zavodun
daşını!

Əldə beşillik plan,
Böyük işdir – yapılan.
Məqsəd dəmir, iş dəmir,
Həyat – tərpəniş dəmir.
Qurduğumuz bu dünyanın
dönən çarxı dəmirdən.

Mədənləri,
şaxtaları,
tarlaları,
Gavur-arxı dəmirdən.

Bu diyarda
türk, erməni, gürcü var.
Bu diyarın
bir yıxılmaz proletar bürcü var.
Sarsıtamaz
bu bürcü
Kapitalın topları,
onların hap-gopları!

Bu diyarda xərabəlik əsəri yox.
Burda əski bayquşları
bir əxlaqsız nəzərilə
çağıracaq
Başı əsən evlərin
kölgələnmiş gözləri yox.
Burda həyat
günəşlərin qucağında xumarlanır.
Burda həyat
ayların
yumşaq, sərin yelpiyilə
tumarlanır.

Burda həyat zərbəli,
Burda həyat yarışda;
İnsanlar axtarışda.
Günəş almış sanki bizi yedəyə...
Heç qoyarmı canımıza
soyuq dəyə.

Bu gün bizim birliyimiz
qızıl kimi təmizdir.
Qızılımız – cingildəyən səsimizdir.
Bizi fabrik, bizi zavod, bizi kolxoz
bir yığnağa toplamış.
Fikrimizin axını
beş qitəyi qaplamış.
Nə müsavat, nə menşevik xülyası.

Nə də daşnaq röyası
bizim sakit yataqlarda
oyanmaz...
Qanımızda əski çürük millətçilik qaynamaz!
Üfüqlərdə qanadlanır
şura Zaqafqaziyası.
Bu diyarda gələcəyi salamlayır
sosializm dünyası.

## NEFT

Dün şövq ilə mədənləri gəzdik;
Çox baxdı buruqlar bizə dik-dik.
Bilməm nəyə durmuşdu buruqlar?
– Dolsun – deyə bir anda oyuqlar!
Şən zərbəçilər mədəni sardı,
Mədəndə nöyüt azlığı vardı.
Sarsıtdı bu azlıq bizi dərhal,
Mədəndə coşub kükrədi avral.
Hər guşədə bir "aləti-zaye",
Baxdıq çürüyüb olmada zaye.
Bir yanda nöyüt axmada bomboş,
Bir işçi oturmuş kimi sərxoş,
Hər bir şeyə baxmazdı, nəhayət,
Verdik ona bir zərbəli töhmət.
Bir işçi durub söylədi birdən:
– Qalsınmı nişan köhnə kəsirdən?
Neft olmasa fabrik necə işlər?
Neft olmasa gəlməz vecə işlər!
Neft olmasa gurlarmı traktor?
Yoldaş, bunu kolxozçuya bir sor!
Neft olmasa işlərmi zavodlar?
Parlarmı ocaqlardakı odlar?
Neft olmasa kükrərmi Zaheslər?
Neft olmasa yoxluq bizi səslər!
Qarşımda bəyaz çöhrəli qış var.

Neft olmasa parlarmı baxışlar?
Beşilliyi yarısında bitirmək,
Hər əngəli şiddətlə devirmək,
Əlbət, bu günün oğluna bağlı,
Əlbət mənə bağlı, sənə bağlı, ona bağlı!

## DİVLƏR SƏSİ

Oktyabr, bu adın şöhrəti var dillərdə,
Yalnız burda deyil, bizdən uzaq yerlərdə.
Bu döyüş bayramı hər yerdə bizim işçilərin,
Mavi köynəkli, qudok səsli nümayişçilərin.
Göstərir aləmə hər işçi bu gün öz gücünü,
Kapital sahibinin göylərə çıxmaqda ünü.
On beş illik dağımız göylərə yüksəlməkdə,
Tək deyil göylərə yüksəklər yüksəlməkdə.
Çıxmamışdır boşa qollardan axan zəhmətimiz,
Günü zəbt etməyə var qüdrətimiz, qüvvətimiz.
On beş il çarpışaraq dağlara dağ vurduq, bax!
Kükrəyən, dalğa vuran çayları coşdurduq, bax!
Qapqara, qumlu yetim çölləri aydınlatdıq,
Lal, kar ənginləri can bəxş edərək çınlatdıq.
Kimya, avtotraktor, yeni dəzgah, yeni iş...
Bakı yüksəklərə dırmanmaq üçün söz vermiş,
Axıdır çeşmələrindən qara cövhər, qara su.
Bolşevik fikri qədər işdə dərindir quyusu.
Çıxarır zahirə şöhrətli Ural qatlarını.
Rəngbərəng, canlı, hərarətli metal qatlarını.
Bax, Dnepr qoca bir ölkəyə can verməkdə,
Yeni dəzgahları insan kimi dindirməkdə.
Uca göylərdə bu gün sanma buludlar sürünür,
Yeni bir kombinatın ərşə çıxan tüstüsüdür.
Parovoz, avtotramvay və traktor, Domna –
Hamısı düşmüş qatı bir bolşevikin düz yoluna.
Şaxtalar, fabrikalar, canlı zavodlar, işlər,
İşçi məfkurəsi üstündə təməllənmişlər.

Baxınız, dalğa vuran canlı sular parçalanır,
Quru səhralara pambıqlı köpüklər calanır.
Qüvvəsi göylərə sancılmış olan evlərə bax,
Gəl bu evlərdəki tarixi yapan divlərə bax.
Biz hücüm eyləmişik, selləri bənd eyləmişik.
Köpürən dalğaları sanki səmənd eyləmişik.
Biz hücum eyləmişik əski qaranlıqlara da,
Projektor kimi, matəmli dumanlıqlara da.
İşimizdir o qaranlıqları aydınlatmaq,
O rütubətli dumanlıqları aydınlatmaq.
Güclənir fit kimi, arslan kimi kollektivimiz,
"Siqləti ərzə" bərabər kimidir hər divimiz.
Bəlli, nöqsanlarımız varsa da, lakin hala,
Kimsədən minnətimiz olmamış, olmaz əsla!
Bütün əngəlləri, müşkülləri yaxmış, yıxmış,
Qəzetlər söylədilər Buxta kəsirdən çıxmış.
Bu kəsirdən o pambıq çölləri çıxmazmı əcəb,
Bunu öz şanlı firqəmiz etməkdə tələb.
Gedirik, yol qısalıb, çünki yarış var bizdə,
Quruluş xətləri var qoyduğumuz hər işdə.
Söylərik "kim-kimi", qoşduq, havalandıq iləri,
Sarsdı düşmənləri hər an "çatıb ötmək" xəbəri.
Daşırıq, çalxalanır, kükrəyirik, sel kimiyik,
Bağların şahiqəsindən sivişən yel kimiyik.
Əsirik əski fənalıqları məhv etmək üçün,
Yaxşı məqsədləri dünya boyu yüksəltmək üçün.
Neftimiz, pambığımız, benzinimiz, maqnitimiz
Güclənir, güclənirik qoşduğumuz cəbhədə biz.
Bax beşillik planın feyzinə, düşmən, sən də,
Gələcək işçilərin! Çatlayaraq ölsən də!
Ataraq keçmişin allahını, peyğəmbərini,
İzlədik ağlımızın, fikrimizin rəhbərini.
İzlədik zəhməti! Zənn etməyiniz səhv etdik,
Yapma allahı və peyğəmbəri biz məhv etdik.
Nərəmiz, gur səsimiz şərqə yayılmaqda bizim,
Səsimizdən yatan arslanlar ayılmaqda bizim.
Hindin əsrar dolu ormanları canlanmaqda,

Köhnə Qanjın suyu daşmış, həyəcanlanmaqda,
Çində vulkanlara bax, “mişki xəta”dan əl çək!
Bunu, əlbəttə, yapon taciri söndürməyəcək.
Günəşin hizməsi mizraq, göy olub qalxanımız,
Yanacaq gün çıxan ellərdə qızıl vulkanımız.
Yanacaq bir yeni vulkan kapital yurdunda,
Axacaqdır yeni bir qan kapital yurdunda!
Axacaq qan, sökəcək dan yeri! Dünya güləcək,
Oktyabr kimi günlərlə bəşər yüksələcək!

## BABA YURDU

### I

“Cana gəldim toz-torpağın əlindən,
Ev deyil ki, xarabadır, xaraba”.
Bu sözlərlə aynaları silərkən,
Öz-özünə deyinirdi Rübaba.

Nə çəkmişsə aylar, illər uzunu
Birər-birər eyləyirdi hekayət.
Ala-ala bağdadının tozunu,
Yağdırırdı “kor baxtından” şikayət.

Ürəyində gərdiş yapan kədərin
Təsirindən qızı ilə dalaşır.
Qızı Telli önündəki dəftərin
Sətirləri kölgəsində dolaşır.

– A qız, Telli!..
– Bəli, nə var?
– Zəhirmar.
Dur ayağa, buraya ver kətili!

Dolduraraq qarğış ilə ağzını,
Çıxdı haman üzərinə kətilin.
Kəlmə başı azarlayıb qızını
Acığından bilməyirdi neyləsin.

Telli isə ona fikir vermədən
Pək maraqlı bir hekayə oxuyur.
Özü üçün anlamadan, görmədən
Xəyalında bir aşiyan toxuyur.

Birdən dikib anasına üzünü:
– Ana, bəsdir, bizi qatma ərinə. –
Deyə kəsdi bir cümləylə sözünü,
Qorxusundan çox getmədi dərinə.

Yavrusunun bu şeytanca sözündən
Simasının tutqun rəngi açıldı.
Bir nur uçdu iri, qara gözündən,
Dodağından bir təbəssüm saçıldı.

Ara-sıra öskürüncə dərindən
Çatılırdı bir-birinə qaşları.
Dayanmayıb sarılırdı yerindən,
Qaralırdı gözlərinin kənarı.

– Bu zəhirmar öskürək də, neyləyim,
Bu deyilmi hər gün məni saraldan?
Yaman yerdə gücdən düşdü biləyim,
Yaman yerdə günüm keçdi qaraldan.

Həmxanası qarşı evdən baxaraq,
Rübabəyə zilləmişdi gözünü.
Ürəyində çiçəkləndi iştiyaq,
Artıq burda saxlamadı özünü.

– A qız, nə var, nəyə həşir salmısan?
Söylə, yenə kimdən barıt almısan? –
Deyə Sona daxil oldu icəri,
Rübabəni dilləndirdi sözləri.

– A qız, neylim, sən allah, bir toza bax!
Dağılmışda nə yazım var, nə qışım.

Hər gün bir az ürəyimi yeməkdə
Bulud kimi kölgələnən baxışım.

Məgər sizə ev verməyib hökumət?
– A qız, verib, köç deyirəm, köçürmü?
Varlığını basmış kimi kəsalət,
Yaxşısını yamanından seçirmi?

Köç deyəndə, azar alır canını,
Yer süpürür sanki qaşı-qabağı.
Ev söhbəti aralığa gələndə
Heç eşitmək istəməyir qulağı.

"Buraxmaram mən atamın yurdunu"
Deyə burda hər qayğıya qatlanır.
Dizin-dizin sürünərkən bu evdə,
Bilməm, hansı xoş gününə şadlanır!

Ay başında hər aldığı maaşı
Bu komanın üzərinə qoymada.
Bilməm, niyə hər yetənin fikrinə,
Hər çatanın dediyinə uymada.

İki qadın vermiş kimi baş-başa,
Arzuları çiçək-çiçək açılır.
Rübabənin qəlbi düşmüş təlaşa,
Sözlərindən ildırımlar saçılır.

**II**

Saat üçdü... Kazım işdən qayıtmış,
Vücudunu qaplamışdı yorğunluq.
Yemək gəldi, toplandılar süfrəyə,
Aralıqda gəzirdi bir məhzunluq.
Yalnız, darğın bir ehtiram, bir ülfət...
Köçürükmü?
– . . . . . . . . . . . . . .
– Səninləyəm, dinsənə!

– Qoymazsan bir yeməyimi qurtarım?
– Mən bilmirəm, son sözümdür bax, sənə.

Sən köçməsən, köçəcəyəm mən özüm,
Tellini də alacağam yanıma.
Yoxsa bu toz, bu amansız rütubət
Bir qurd kimi daraşacaq canıma.
– Köç də ...
– Yaxşı, gör köçürəm, yoxsa yox.
Mən daşınsam nə gələcək əlindən ...
Bəs deyilmi baxdım sənin sözünə,
Bəs deyilmi burda gəldim cana mən?

**III**

Kazımgilin qapısının önündə
Üç gün sonra durmuşdu bir "qurzevik"
Bir daxmanın "şənliyinə" son verən
Rübabədə görünürdü zirəklik.

Bir külfətə həyat verən bu maşın
Binəqədi zavkomundan gəlmişdi.
Gedəcəkdi pasyolkaya birbaşa,
Bu gediş çox əhmiyyətli bir işdi.

Qaydasilə bütün şeylər qalandı,
Ana-bala "qurzevik"ə tullandı.
Kazım fəqət xəbərsizdi bu işdən,
Xəbərsizdi bu oğurlu gedişdən.

Gəldi, gördü, heyrətləndi bir qədər,
"Kazım dayı, Telligili köçdülər" –
Deyə bir səs onu haman ayıltdı,
Fikirləşə-fikirləşə qayıtdı.

O zamandan pasyolkada bu külfət
Yeni həyat nəğməsini dinləyir.
Baba yurdu iztirablar içində
Dar dönmələr palçığında inləyir.

## FANTAN

Sonsuz gurultular arasında bir
Göylərə baş çəkən buruq titrəyir.
Çapuq işçilərin hərəkətindən
Dönmüş bir dalğalı dənizə mədən.
Həyəcan ətrafda fırtına kibi,
Mədən hərəkətdə, buruq əsəbi.
Buruğun sinirli gurultuları
Sarsıdır div kimi bütün civarı.

Yerin damarını sorurdu fantan,
Buruğun başına vururdu fantan.
Buruğun çevrəsi batmışdı neftə,
Yerdə neft axırdı su kimi müftə.

Buruq hayqırırdı qəlbində mətləb,
Buruq döyüşçülər eyləyir tələb.
Vardı aralıqda yanğın qorxusu,
Fantandan gəlirdi ölüm qoxusu.

Gurultu dəhşəti, yanğın lərzəsi
Salmışdı heyrətə bu gün hər kəsi.
Kranı bağlamaq gərəkdi əvvəl,
Bununçun lazımdı bacarıqlı əl.
Kran bağlansaydı qorxu qalmazdı,
Neft axıb boş yerə hədər olmazdı.
Burda kimsə işdən qalmayacaqdı,
Kimsədə donuqluq olmayacaqdı.
Mədənin nasosçu dəstəsi gəldi,
Gurultu daha da artdı, yüksəldi.
Bunlara həvalə olunmuşdu iş,
Vardı buruğa sarı bir irəlləyiş.
O bunu, bu onu qaçar, qovardı,
Ətrafda bir qoxu heyrəti vardı
Daha ilk baxışda zirəklik edən,
Qaşını çataraq, irəli gedən.

Sağnaq arasına soxulan Cəbi
Atıldı cəbhəyə bir əsgər kibi.
Mədəni bir böhran qorxusu aldı,
Qorxu vücudlara zəlzələ saldı.
İşçilər Cəbini qoymadılar tək,
Qoşdular ki, ona etsinlər kömək.
Ürəklənib girir hamı buruğa,
Kim heyran olmazdı bu coşğunluğa.
Bu yürüş bir hücum marşı kibiydi,
Beşillik planın bir tələbiydi.
Mədəndə artırdı qüvvə getdikcə,
Yardım dalğaları minirdi gücə.
Cəbinin bu işi, bu cəsarəti
Topladı bir yerə bütün qüvvəti.
Bağlamaq çətindi kranı, heç kəs
Sanki çəkməyirdi qorxudan nəfəs,
Donmuşdu yerində yüzlərcə məxluq.
Sarmışdı hüzuru bir umudsuzluq...
Birdən uğultusu kəsdi buruğun
Və əvvəlki kimi olmadı coşğun.
Fırtına qoynundan, dəhşət içindən,
Uğultu içindən, vəhşət içindən
Cəbi bağlayaraq kranı çıxdı.
Onun üzü ağdı, alnı açıqdı.
– Bağladım!
Fərəhdən coşdu fəhlələr,
Cəbinin üstünə qoşdu fəhlələr,
Aldılar ansızın onu dövrəyə.
Çoxu şahid oldu bu mənzərəyə:
– Ay Cəbi, kranı necə bağladın?
Doğrudan fantanı yaxşı saxladın.
– Onu deməzlər ki...
– Bah, çək özünü!
Bir başqası ona tutub üzünü:
– Sağ ol, Cəbi dayı!
– Sən də çox sağ ol!
– Ay balam, kişiyə bir yol verin, yol,

Qoyun bir az getsin
rahatlıq etsin.
Cəbini mən yaxşı təsvir etmədim,
İncə nöqtələrə çox da getmədim.
Parlaq zərbəçidir mədəndə Cəbi.
Şadlanır hər işə gedəndə Cəbi.
Ondan ibrət alır işdən qaçanlar,
Tənbəl iqlimlərə yelkən açanlar.
Mədəndə hər zaman ismi anılır,
Mədəndə birinci adam sanılır.
Əmək qəhrəmanı adını almış,
O yalnız meylini zəhmətə salmış.
O yalnız güvənir iş qüvvəsinə,
İşçilər səs verir onun səsinə.

– Yoldaşlar! Tərlan bəy bizi aldadır,
Onun düşündüyü yalnız paradır.
Onun sözlərinə inanmayınız,
Şirin dillərinə aldanmayınız!
O bizi qulluqdan çıxara bilməz.
Bizsiz buruqlardan cövhər çəkilməz.
Daim onun bizə ehtiyacı var,
Bizim qüvvəmizə ehtiyacı var.
Çarın quyruğudur onlar həmişə,
Bu quyruqluq olmuş onlara peşə.
İşçiyə nə vətən, nə millət vardır,
Onlar bu sözlərlə bizi aldadır!
Urus, türk, erməni – işçidir həpsi,
Onlarsa yalandan ayrırlar bizi.
Məhv olsun boş yerə canımız neçin?
Axsın, hədər getsin qanımız neçin?
Biz milli davadan əl çəkməliyiz,
Sinif döyüşündə qan tökməliyiz, –
Deyə 1905 sənələrində,
Qaranlıq günlərin bir dəftərində
Cəbinin bu nitqi qeyd olunmuşdu,
Üstünə illərin tozu qonmuşdu.

O zaman güvənib iş qüvvəsinə,
Çoxu səs vermişdi onun səsinə.

O çoxdan ayrılmış dağdan, arandan,
Gəlmişdi Bakıya Cəbi İrandan.
Gəlmişdi, ordan da ayrılmamışdı,
Əvvəlki qınından sıyrılmamışdı.
Bir yandan işçiydi, bir yandan kəndli
Keçirdi günləri daima dərdli.
Çünki ailəsi ordaydı onun,
Həmişə qəmliydi, həmişə məhzun.
Gördü sərbazların quldurluğunu,
Yoxsulluq Bakıya qovladı onu.
Keçmədi bir öylə müddət aradan
Əl çəkdi büsbütün maldan-qaradan,
Əl çəkdi, İrandan çıxdı nəhayət,
Başını Bakıya yığdı nəhayət.
O, bir gün parlaman önündə durmuş,
Kimsəsizlər kimi boynunu burmuş
Baxırdı qayəsiz bir izdihama.
Bəzən dodaqaltı gülürdü, amma,
Əsgərana doğru gedən bu axın
Həyata uzaqdır, ölümə yaxın.
Balkonda bir ovuc boynuyoğunlar,
Hamsının çiynində zərli paqonlar
İlan dərisi tək işıldayırdı.
Həpsinin dişləri qıcırdayırdı.
Parlaman üstündə üçrəngli bayraq
Çarpırdı ruzgara dalğalanaraq:
Baxırdı qəzəblə Cəbi balkona,
Bu izdiham ağır gəlirdi ona:
– Qırdırınız xalqın uşaqlarını
Məgər bu günlərin yoxmu yarını?!
Sarı ingilisin kor eşşəkləri!
Bu sözü o dövrün bir kəlpeysəri
Eşidincə artır qəlbində kini;
– Bəyənmirsən islam hökumətini?.. –

Deyə Cəbiyə əl açmaq istərkən
Cəbi izdihama qarışdı birdən.

O daim cəbhədə hazırdır, hazır;
Onun üç zərbəçi dəstəsi vardır.
Böylə fantanları çox görmüşdü o,
Böylə buruqlara çox girmişdi o.
Çox dinləmiş böylə gurultuları,
Etmişdir mədəndə ömrünü yarı.
Cəbi, neft uğrunda çalışan Cəbi,
Hər dürlü zəhmətə alışan Cəbi.
Cəbi məhsulatın güclənməsində,
Proqramın artıq ödənməsində
İlk addım atmışdır öz dəstəsilə,
Vurub hər əngəlin üzünə sillə,
Olmuş dəstəsilə mədəndə rəhbər,
Olmuş mədənçilər dilində əzbər.

Yarım saatdı ki, dincəlirdilər,
Yorulan təbii dincəlmək istər.
Fantan bulamışdı zərbəçiləri,
Sanki sulamışdı zərbəçiləri.
Tütün dumanilə otaq dolmuşdu,
Cəbiyə işçilər heyran olmuşdu.
Onun ətrafında gedirdi söhbət,
Hamı bəsləyirdi Cəbiyə hörmət.
Burda dağ sənaye məktəblərindən
Gələn bir tələbə qalxıb yerindən:
– Cəbi dayı, sən çox cəsur adamsan.
Cəsarətin məni etdi hərasan,
Fəqət sən buruğa girəndən sonra,
Fantana nəhayət verəndən sonra
Qəlbimdə mətanət qanı qaynadı,
Ürəyim açıldı, könlüm oynadı.
– Ay bala, sən hələ uşaq adamsan,
Sən hələ cavansan, sən hələ xamsan.
Başın çıxmaz sənin belə işlərdən.

Hər işi öyrənmək olmaz ki, birdən.
Nə qədər bu yolda çalışmışam mən,
Nə dürlü zəhmətə alışmışam mən.
Gurultu içində keçmiş həyatım
Mədəndə açılmış qolum, qanadım.
Bu gurultu mənə fərəh gətirir,
Bu səslər ömrümün musiqisidir.
– Ay Cəbi, şəklindən xəbərin varmı?
– Bəsdir, pərt etməyin, əşi, adamı,
Bənzətmişlər məni bir qəhrəmana.
– Məncə qəhrəmanlıq yaraşır sana.
Deyərkən, Cəbinin dodağı qaçdı,
Könlündə, fərəhli çiçəklər açdı
Danışıq yenə də davam edirdi,
Bəzisi otaqdan çıxıb gedirdi.
Bu zaman mədənin müdiri gəldi,
O bayaqkı kimi tutqun deyildi.
Gözləri sevincdən fanar-fanardı,
Könlündə məsərrət odu yanırdı.
– Sağ olun, yoldaşlar, sizin işiniz
Bizə göstərdi ki, aciz deyiliz.
Gələcək beşillik planları biz
Belə fantanlarla ödəməliyiz.
Fəqət təhlükəsiz deyil fantanlar.
Ona Cəbi kimi möhkəm insanlar,
Polad zərbəçilər gərəkdir, fəqət
Hər kəs almalıdır Cəbidən ibrət.

Cəbi vüqarlıydı, üzü gülürdü,
Siyah neftə çalan gözü gülürdü.
– Bəlkə Cəbi dayı söz-möz istəyir?
Ona da söz verək görək nə deyir.
– Mənim danışmaqla heç aram yoxdur
Onsuz da iclasda danışan çoxdur.
– Yox, danışmalısan ...
– Yaxşı, yoldaşlar,
Mənim ancaq sizə bir-iki sözüm var:

Əvvəla hər işdə sayıq olmalı,
Onda yaxşılaşar mədənin halı.
İşi özbaşına buraxmaq olmaz.
Plansız verilən rəqəmlər dolmaz!
Ayıq olsaydınız fantan vurarkən
Quyunun ağzını bağlayıb erkən,
Bu qədər zəhmətə düşməzdik, gərək
İşə əvvəlindən diqqət yetirmək.
Bu zaman bir işçi girdi içəri,
Baş-ayaq vururdu onun sözləri
– Yoldaşlar, yenə də fantan var...
– Necə?
Hər kəs batmış kimi oldu sevincə
– Hansı buruq?.. Yeni qazılan buruq?
Özümüz fantanın şahidi olduq.
Ansızın atıldı həpsi dişarı
Cəbi də yüyürdü buruğa sarı.

## TAR

Oxu, tar, oxu, tar!..
Səsindən ən lətif, şeirlər dinləyim.
Oxu, tar, bir qadar!..
Nəğməni su kimi alışan ruhuma çiləyim.
Oxu, tar!
Səni kim unutar?
Ey geniş kütlənin acısı, şərbəti –
Alovlu sənəti!

Gözləri qibləyə açılan hasarlı binalar
Dinləmiş əzəldən səsini.
Papaqlı atalar, çadralı analar
Ötürmüş sayəndə köksünü.
Düşmüşlər gah şirin, gah acı toruna,
Sevinə-sevinə, qoruna-qoruna.

Çarparaq çargahın divardan divara
Yolçunu yolundan eyləmiş avara.
Çalxanmış dərələr, təpələr,
Səs vermiş səsinə ləpələr.
Oxu, tar, fikrimdə oyansın
Baharın, Seyidin qəzəli;
Oxu, tar, ruhlansın
Şirvanın, Gəncənin mehriban gözəli!
Damağdan düşənlər,
Ürəyi şişənlər,
İlk bahar seyrinə çıxmayan
Özünü dağların döşünə yıxmayan
Sinəsi dağlılar.
Vəfasız bir eşqin dağınıq zülfünə bağlılar

Dəxilin olmuşlar,
Qapında təsəlli bulmuşlar.
Zilin var, vəsətin, bəmin var;
Sənin də quşların dəmindən ayrılan
Bir özgə dəmin var.
Səni də avara eyləmiş
Dağınıq telli bir “zərəfşan”.
Onunçun segahın danışır
Pərişan, pərişan.

Səsini dinləmiş
Şahların, xanların sarayı;
Səninlə birlikdə inləmiş
                Əsirlər alayı.
Bəzən də simlərin qəmləri ovutar,
Olardın onların sirdaşı
                Sən ey tar!..
Gülləri əməkçi barmaqlar qanından
                Rəng alan xəlçələr,
Xəlçələr üstündə uzanmış –
                Dodağı qönçələr,
“– Hey, saqi, mədəd qıl soğudu şərabın,
İncitmə könlünü bu xanə-xərabın!” –
Söyləyən tox sözlü şairlər.
Həvəsdən doymayan ac gözlü şairlər:
Nədimlər, Vaqiflər,
Gözəllik sirrinə vaqiflər
Həp səni dinləmiş;
Oxumuş, inləmiş.
İndi də bizimçin oxu, tar!
Səni kim unutar?

Sən qulluq etmədin, məscidə, axunda,
Çalışdın həyatı sevməyin uğrunda.
Çoxları üzünə durdular,
Könlünü qırdılar,
Nə deyim o yekəbaşlara?!

Çaldılar ruhunu daşlara.
Üstündən bir qara yel kimi əsdilər,
Səsini kəsdilər.
Daşlandı çəkənlər nazını,
Böyləcə qırdılar aşığın sazını.
Sən xalqa “gül!” dedin,
“Ey qüssə, öl!” dedin.
Başladı məsciddə mərsiyə.
Sarıqlı çıxınca ərsəyə,
Qüssəmiz ölmədi,
Xalqımız gülmədi.
Ağladıq daima, ağladıq,
Ey qədim aşina, ağladıq.
Oxu, tar! Dəyişdi zamana,
Bax, indi radio səsini
                    Dağıdır cahana.
Ey tarçı, çal, oxu!
Könlümü al, oxu!
Vur sazı döşünə, ey aşıq!
Qalmamış nə aba, nə qəba, nə sarıq.

Oxu, tar! Alovlu izlərin
Əcəba, neçə şux dilbərin
Yasəmən üzünü pul kimi qızartmış?
O sarı simlərin lisanı
Salmazmı heyrətə insanı?

Oxu, tar! Mən səndə
İstənən havanı çala da bilərəm.
Mən səndən bugünün zövqünü
                    Ala da bilərəm.
Sən bu gün silahsan əlimdə,
Səni mən hansı bir hədəfə
İstəsəm, çevirə bilərəm,
Qəlblərdə gizlənən keçmişi
Bir yeni nəğmənin əlilə
Devirə bilərəm!

Oxu, tar!
Fabrikdə, zavodda,
Traktor başında.
Bu saat qarşında
Nə qədər adam var!
Utanma, oxu, tar!
Mədənli Bakımın,
Pambıqlı Gəncəmin,
İpəkli Şəkimin
Acısı, şərbəti.
Alovlu sənəti!

Oxu, tar, oxu, tar!
Səsindən ən lətif şeirlər dinləyim.
Oxu, tar, bir qadar!..
Nəğməni su kimi alışan ruhuma çiləyim.
Oxu, tar!
Səni kim unutar?
Ey geniş kütlənin şirini, şərbəti,
Alovlu sənəti!..

## SÜRƏT BAYRAMI

Yaşasın məmləkətin tunc oğlu,
İldırımlar kimi qorxunc oğlu.
Yaşasın daş kimi muskullarımız,
Yaşasın tökmə, dəmir qollarımız.
Canımız top kimi sağlam, qıvraq,
Qanımız pənbə şəfəqdən parlaq.
Fikrimiz cilvəli, aydın bir su,
Hissimiz nəşəli bir yaz doğuşu.
Bir qızıl quş kimidir bizdə xəyal,
Devrilir dağlar, açarkən şahbal.
Sayımız ölkədə milyon-milyon,
Köksümüz sankı balon.
Qoy utansın gecələr şəbpərəsi.
Sıxılan yumruğumuz yer kürəsi...
Nəyə lazım sarılıq, solğunluq,
Bizdə var qırmızılıq, dolğunluq...
Tökmə bir şey kimi sıxdır aramız,
Göydə dirjabilə bənzər sıramız.
Gəziriz, oynayırız asuda,
Göydə, topaqda, dərin mavi suda.
Gördü ceyran bizi atlandıqda,
Durna mat qaldı qanatlandıqda.
Projektor kimi parlar gözümüz,
Keçər hər cəbhədə daşdan sözümüz.
Xəstəlik qoxmaya bilməz bizdən,
Yaşasın güclü bədən!
Biz iradəylə doğan bir axınız,
İczə düşmən, gücə qəlbdən yaxınız.
Bizdədir sinfi şüurun əsli,
Adımızdır yeni insan nəsli.
Yerə düşməz atılan futbolumuz,
Bir sinif cəbhəsidir son yolumuz!

## AT

Sən mənim köhlənim, oynaq atımsan,
Mənim yaman gündə ehtiyatımsan.
Qoymaram başına açsınlar kələk,
Duruşun buluddur, yerişin külək.
Bu uzun yollarda çıxsan cövlana,
Şairlər bənzədər səni ceyrana.

Xatirində varmı boranlı çağlar?
Bürümüşdü bizi zalım qaçaqlar.
Yalnız ümidimi bağladım sana,
Dedim: – Ey köhlənim, qanadlansana!
Tüfəngim əlimdə açıldı mənim,
Qurşunum ətrafa saçıldı mənim.
Bir qaya dalında yastıq belində,
Bir bel ki, olamaz qızda, gəlində,
Ayna tüfəngimi mən daraqladım,
Yalnız ümidimi sənə bağladım.

Köməkçimsən pambıq toplanışında,
İlin baharında, ilin qışında,
Kolxoz faydalanır sənin işindən,
Buludlar çəkinir kişnəyişindən.
Yarınkı tufanlı cəbhələrdə sən
Başqa bir məharət göstərəcəksən.
Çapdırıb qovğada qızıl əsgəri,
Sivri bir ox kimi süzüb iləri,
Havanın bağrını yardığın zaman,
Yağarkən yollara güllə, toz duman,
Onda məharətlə, gözəlim, gərək
Qəhrəman atlıya verəsən ürək,
Gərək qurtarasan onu ölümdən
Yarınkı tufanlı cəbhələrdə sən!

## HƏYAT SEVGİSİ

Ah, mən gündən-günə bu gözəlləşən
İşıqlı dünyadan necə əl çəkim?
Bu yerlə çarpışan, göylə əlləşən
Dostdan, aşinadan necə əl çəkim?

Dönmə bir şəbnəmə yaz səhərində,
Könül, günəş kimi parla yerində!
Göylərin laciverd ətəklərində
Gedən bu qovğadan necə əl çəkim?

Baxınız, dan yeri sökülmüş kimi,
Dostlar bir cəbhəyə tökülmüş kimi.
Uzaqdan-uzağa xam gümüş kimi
Ağaran səhradan necə əl çəkim?

Təbiət varlıdır, təbiət xəsis,
İşlədərkən onu, sən ey mühəndis,
Mən də qart daşlara verdiyim bu hiss,
Bu incə mənadan necə əl çəkim?

Bir yanda tərlanlar, dumanlı dağlar,
Bir yanda kəkliklər, ayna bulaqlar,
Bir yanda bülbüllər, çiçəkli bağlar,
Mən bu tamaşadan necə əl çəkim?

Həyat dedikləri bu keşməkəşdən,
Qəlbimdə, qanımda yanan atəşdən,
Gecədən, gündüzdən, aydan, günəşdən,
Bu əngin fəzadan necə əl çəkim?

Qarşımda dalğalı dərin bir ümman,
Ümmanı sarsıdır bir acı tufan,

Bəyaz köpükləri bir çiçək yapan
Şeirdən, xülyadan necə əl çəkim?

Ulduzlar fikrimin çırağbanıdır,
Bulud xəyalımın karıvanıdır,
Səma ki, hissimin aşiyanıdır,
Böylə bir səmadan necə əl çəkim?

Mehriban sevgilim qarşımda durdu,
Yenə şairliyim başıma vurdu,
Məndən məcnun könül maraqla sordu:
– Bu saçı leyladan necə əl çəkim?

Xəzan acısına edib təhəmmül,
Gülün kölgəsində ötəndə bülbül,
– Həyat, həyat! – deyə çırpınır könül,
Könüldən, sevdadan necə əl çəkim?

Sən aldın aşını yeni hisslərdən,
Ey cavan qələmim, düşmə bəhərdən,
A dostlar, söyləyin, mən bu hünərdən,
Bu təbi valadan necə əl çəkim?

## BƏXTİYAR

Sıyrılıb keçmişin buludlarından,
Müjdələr gətirir böyük yarından,
Yarıb günəş kimi qaranlıqları,
Söküb şəfəq kimi dumanlıqları,
Özündən alışan, özündən yanan,
Hər sabah hamıdan erkən oyanan,
İş başına qoşan nə bəxtiyardır!

Yoldaşı sıradan qalarkən geri,
Tutub ətəyindən çəkib iləri,
Ona qüvvət verən, ona ruh verən,

Ona ən uğurlu bir yol göstərən,
Həm sevgi bəsləyən, həm can yandıran,
Sönük duyğuları işıqlandıran,
Günəşlə yarışan nə bəxtiyardır!

Budur həyatdakı gözəllik ancaq:
Qüvvətli yaşamaq, canlı yaşamaq!
Məqsədim, məsləkim, şüarım budur,
Həmən əqidədir, həmən duyğudur.
Gələcək günlərə məni səsləyən,
Bir böyük yarına əməl bəsləyən,
Çarpışan, vuruşan nə bəxtiyardır!

Günlərim keçməyir ancaq əməklə,
Xəyalım göyləri seyr eyləməklə,
Buludlar ömrümün karvanı olur;
Fikrim o karvanın sarvanı olur.
Sanıram ulduzlar həmvətənimdir,
Demək, yer də mənim, göy də mənimdir,
Hüzurumla cahan nə bəxtiyardır!

Mənə ilham verir o yaşıl çəmən,
Üstümə quşbaşı yağan yasəmən.
Demək, sevimlidir bahar da, qış da,
Bir yenilik duyub mən hər baxışda
Sevirəm dəyişən, dönən varlığı.
Bu günün, yarının bəxtiyarlığı
Sevdasilə coşan nə bəxtiyardır!

Ömrümün min dürlü cilvəsi vardır,
Könlümün göyləri damar-damardır,
O bəzən ağlasa, bəlkə də haqdır,
Həyat həm gülməkdir, həm ağlamaqdır,
Lakin daha xoşdur döyüş çağları,
Həyat dedikləri uca dağları
Duman kimi aşan nə bəxtiyardır!

Həyatdan doymayan, işdən doymayan,
Əfsanə sözlərə məhəl qoymayan,
Könlünü, gözünü verib işinə,
Baxıb həyatının yüksəlişinə,
Xalqilə titrəyən, xalqilə gülən,
Vətənçin yaşayan, vətənçin ölən
Səmimi bir insan nə bəxtiyardır!

## ƏMƏK

Dönüb keçmişlərə bir fikrə getdim,
Öyrəndim insanın kim olduğunu.
Birdən gözlərimə göründü cəddim,
Baxıb seyr eylədim köhnə meymunu.

Heyvanlar içində o da bir heyvan,
Sürülər içində o da bir sürü.
Yaylağı mağara, qışlağı orman,
Zillət torpağında yazığın ömrü.

Əlində daş, dəmir... mətin dağları
Sürünə-sürünə hirslənib deşir,
Təbiət dəyişir, özü dəyişir.

Əmək – insanlığın tükənməz varı...
Əmək sərf olunan yer cənnətimdir.
Hüsnümdür, eşqimdir, səadətimdir!

## ŞAİR VƏ VƏTƏNDAŞ

(*dialoq*)

Şair: El köçdü, sən qaldın hamıdan arda,
Nə qədər acıdır bu arda qalmaq!..
Qoç bir əsgər kimi vuruşmalarda
Yıxılıb, kimsəsiz yollarda qalmaq!..

Yazıq deyildirmi duyan könüldə
Bəslənən bir əməl tarımar olsun?!
Qalmışkən bülbülün gözləri güldə,
Üstünü kəsdirən son bahar olsun!
Ey şair! Səni də düşündürən bu,
Səni də ağladan həmən xəyaldır.
Ömür günəşinin vaxtsız qürubu,
Həyata verilən sərt bir sualdır...

V ə t ə n d a ş : Burax bu hissləri, ey şair, burax!
Gördüyün, bildiyin şeylərdən danış!
Ağac qələmini yaxşı çırparaq,
Gətirdiyin yeni səmərdən danış!
Bu üzgün duyğular, qara fikirlər
Sürür gəncliyini heçliyə doğru;
Onlar bir qar kimi varlığı girlər,
Onlardan, ey şair, özünü qoru!
Həyatla olsaydı dərin rabitən,
Ruhun qaralmazdı gecələr kimi;
Solmazdın sularda yaşayan, bitən
Bir öksüz baxışlı neylüfər kimi.
Bir məzar qoxusu verən sözlərin
Zamanın ruhuna uzaq, yabançı,
Çəpərlər içindən baxan gözlərin
Bir qəmli quş kimi nə qədər acı!

Ş a i r : Neçin yabançıyam mən bu varlığa,
Fikrimdə, hissimdə bu nə sükutdur?
İçərim bənzəyir bir məzarlığa,
Gecələr ayazdır, gündüz buluddur.
Neçin hər sevincdən, hər ixtilatdan
Uzağam qaranlıq bir bucaq kimi.
Üzülmüş kimiyəm mən bu həyatdan
Qırılan, yaralı bir budaq kimi?
Mənim yoldaşlarım birər komandan.
Hamsı irəldədir, hamsı öndədir.
Bu dərin həyatı duyub qanandan
Mənimsə taleim yaman gündədir...

V ə t ə n d a ş : Xayır, ey şairim, sən bu varlığı
Yaxşı anlamadın, yaxşı duymadın.
Göylərdə aradın bəxtiyarlığı,
Bu gözəl həyata məhəl qoymadın.
Bir münzəvi kimi yaşayıb dedin:
“Həyat mübarizi bir rəng deməkdir”
Çoraq duyğuları oxşayıb dedin:
“Sənət – xəyal ilə ahəng deməkdir”
Anlamadan dedin: “Yaxşı düşünsən,
Şeiriyyət olamaz bizim dövrdə”.
Dedin ki, şairim, utanmadan sən:
“Texnika öldürür sənəti” bir də,
Əlində bir köhnə şeir divanı,
Dilində səsləndi ölgün qəzəllər...
Anlaya bilmədin yeni insanı,
Bilmədin nəçidir yeni gözəllər.
Nədir ruhu qırıq bu zümzümələr?
Bunlar həyat üçün zəhərdən acı.
Mən bir vətəndaşam, əski nəğmələr
Dərdli şikəstələr mənə yabançı.
Həyatı coşduran, dalğalandıran,
İrəli aparan nəğmələr hanı?!
Hanı bir möhtəşəm divi andıran
Şeir qəhrəmanı, söz qəhrəmanı?!
Hanı, tükəndimi sevincin, odun?
Sən xəzan kimisən bahar içində.
Göz yaşında üzən solğun vücudun
Bir sarı yarpaqdır sular içində!..

Ş a i r : Burax, dostum, burax bu töhmətləri!
Qəlbimə toplanan müsibətləri
Sən də səsləndirmə bir başqa sazda,
Duyduqca sızlayır ruhum bir az da.
Varlığım şam kimi yanmağa başlar,
Başımda atəşlər, gözümdə yaşlar...
Baxınız, baxınız, gül rəngli göylər
Ağlayan bir çocuq üzünə bənzər...

V ə t ə n d a ş: Bayron da sevmişdi bu təbiəti,
İldırım hiddəti, bulud riqqəti
Onun da şerində çaxdı, ağladı,
O da bu şeylərə baxdı, ağladı.
Təbiət dediyin vəhşi bir heyvan,
Onu əhli edən insandır, insan!
Olmasın başına sözlərim qaxınc,
Ey həyat qınına girməyən qılınc!..

Ş a i r: Əvət, qəribədir xislətim mənim;
Dinlə, uzunsa da söhbətim mənim.
Mən çıxdım ziyalı bir ailədən,
Xəyalımda millət,
Ruhumda vətən...
Məndən az etmədi bunları tələb
Sonra oxuduğum o köhnə məktəb...
Həyatdan çəkildim, işdən çəkildim.
Nə komsomol bildim, nə firqə bildim...
Sonra da qarşıma çıxdı bir gözəl,
Ruhumda titrədi incə bir əməl...
Mən nələr çəkmədim onu sevərkən,
Etdim saçlarını ağlıma yelkən
Sahilsiz eşqimin dənizlərində.
Üzdüm bu dünyanın dərin yerində.
O gözəl olmuşdu ruhuma hakim,
Mənim düşüncəsiz, xəyali sevgim
Onu az qırmadı, az incitmədi.
Onunla bu qəlbim yola getmədi,
Onu da özümə yabançı sandım;
Canandan usandım, candan usandım...
Sonra baş götürüb gəldim bu kəndə,
Çırpındı quş kimi ruhum bədəndə.
Bu kənddə başladım müəllimliyə;
Bir də şeir üzü görməyim deyə,
Küsərək sənətim ədəbiyyatdan,
Dərs dedim neçə il riyaziyyatdan.
Bu kənd, bu kənd məni qoynuna aldı,

Çocuq ilhamıma ninnilər çaldı.
Məni dinləndirən həmən təbiət
Bu qərib könlümü yordu nəhayət
Sənə söylədiyim məhəbbət kimi;
O nazənin kimi, o afət kimi
Bəzən göz yumaraq bütün varlığa,
Xəyalım yol saldı bir məzarlığa.
Həyat arzuları önündə, lakin
Könlüm əmr elədi: bu yoldan çəkin!
Qəmgin düşüncələr başımda söndü,
Yaşamaq eşqilə qəlbim döyündü.
Bəli, bu dünyada mənim kimilər
Dəyişib olarkən məsud, bəxtəvər.
Duyaraq çarpışmaq ehtiyacını,
Silib qəlbimdəki köhnə acını.
Çoxlara qoşulmaq istədim mən də,
Mühitim ruhumu şaşqın görəndə
Tutub ətəyimdən çəkdi iləri.
İndi ürəyimdə olan şeyləri
Məncə, birdən-birə atmaq çətindir;
Bilmədən hər sözə yatmaq çətindir.
Könül! Nə çətindir bu əhilləşmən
Vəhşi qaplanmısan, arslanmısan sən?!
Əllərim çataydı, düşəydin girə,
Gör necə bağlardım səni zəncirə!..
Bir zaman düşünüb fikrə gedərkən,
Sanırdım: artığam cəmiyyətdə mən.
Bu köhnə mənliyim bir dar qəfəsdi,
Bu qəfəs əlimi, qolumu kəsdi.
Bir nəfəs uçmağa bulmadım imkan,
Gözümdən od çıxdı, başımdan duman
Bu gülünc həyatdan nə çıxsın dedim,
Bir dəfə özümü vurmaq istədim.
İradəm buna da çatmadı, əfsus!
Oyaq qüssələrim yatmadı, əfsus!
Bir də ki, haqqımda fitnələr quran,
Ayağımdan çəkən, başımdan basan,
Hiyləgər adamlar, murdar adamlar,

Bütün insanlıqdan kənar adamlar
Az incitmədilər məni dünyada.
Köhnə bir ney kimi gəldim fəryada.
Könlümdən onların acısı getməz;
Yazmaqla qurtarmaz, deməklə bitməz.
Çox incitdi məni tək-tək adamlar:
Saf-çürük olunsun gərək adamlar!..

Vətəndaş: Səni küsdürməsin boş danışıqlar,
Göz önündə böyük bir məfkurə var
Onu tut, onunla yürü iləri.
Sən dünyada axan böyük selləri
Buraxıb, sızlayan, əriyən, axan,
Axışı insanı məlul buraxan
O zəif, o cılız sulara baxma!
Hər duyğu oduna könlünü yaxma!
Deyirlər: toz qopar qaya uçanda,
Həmən şey olmuşdur indi cahanda.
Sən böyük şeylərə çevir üzünü,
Gələcək günlərə söylə sözünü.
Şair, səndə böyük bir qüvvə vardır,
Gizli xəznələrə dilin açardır...

Şair: Məni həyat sevir, həyat çağırır,
– Dəyiş, yüksəl – deyə bar-bar bağırır
O deyir: “Yüksəliş dəyişmək istər,
Sən də dəyişməklə özünü göstər!”.
Mənim ürəyimdə bir ikilik var:
Keçmişdən aldığım dərin duyğular,
Acı tərbiyələr ruhuma hakim.
Duyduğum acını duysaydı hər kim,
Baxtımın ulduzu sönmüşdü çoxdan,
Bir ovuc torpağa dönmüşdü çoxdan...
Məni əski hava zəhərləmişdir,
Yalançı bir sevda zəhərləmişdir.
Daim həyat mənə eylədi gəl-gəl,
Tərbiyəmsə mənə oldu bir əngəl...
Duyğum düşüncəmi göyə sovurdu,

Ürəyim ağlımı daşlara vurdu.
Bu yeni aləmin gözəllikləri,
Onlar ki, insanı çəkir iləri,
Onlara vaxtilə xor gözlə baxdım,
Bir ildırım oldum, özümü yaxdım...

Vətəndaş: Mən bilirəm, sənin havalı könlün
Dönüb bir tərlana, uçmaq istəyir
Və bir məhbus kimi sevdalı könlün
Qırıb qandalını qaçmaq istəyir.
Bil ki, sallanışı hər yaşıl dalın
Başqa bir küləkdən, bir havadandır.
Sovet yellərilə yelkən xəyalın
Qızıl dənizlərdə üzərsə, şandır!
Sən bir qılınc kimi əldə parılda,
Qalxan köküslərdən keçən mızraq ol!
Ağır toplar kimi gur-gur gurulda,
Daim döyüşkən ol, daim qıvraq ol!
Sən həyat eşqindən götür aşqarı,
Həyat qanadlanır, sən də qanadlan!
Qarşında möhtəşəm zaman dağları...
Zaman dağlarını indidən atlan!
Sözünün təsiri elektrikdən,
Rübabın gurlasın inqilab deyə.
Əl çək birdəfəlik bu ikilikdən:
Ya o cəbhəyə keç, ya bu cəbhəyə!
Günəş işığından, ay işığından
Aldığım ilhamla ruhları parlat;
Qəlbinin, beyninin qarışığından
Göylərə sığmayan bir cahan yarat!

## BUZLU YOLLAR

Hər tərəf buz içində, buzdur hər tərəf,
Qorxur günəş də orda olmasın tələf,
Yan verib keçir,
Üzünü qorxa-qorxa göstərib keçir.

Dağ buzlar, qaya buzlar, sıldırım buzlar...
Görməmiş bir alovlu ildırım buzlar.
Əsrlər yatağında səssiz yatalı:
Buzlar xatalı...

Keçdi Amundsenin də axır çağları
Orda, nə dəhşət!
Qəbrinin barmaqlığı buz saçaqları
Oldu nəhayət.

Çox zaman bu iqlimə, araq daşıyan
Amerkanın taciri oldu müştəri.
İstərdi ki, bu yerdə qursun aşiyan,
Dondu əlləri.

Gözəl xəz var, kömür var uzaq şimalda,
Aparsınmı yad ellər bu sərvətləri?
Qoy "Krasin" gəmisi əlində balta,
Qoşsun iləri!

Qırsın, kəssin, doğrasın, ta ki, bu yollar
Yolçuları salmasın qorxuya bir də.
Düşmən şad olar,
Qatarımız ləngisə uzaq Sibirdə...

Bu yol, bu uğurlu yol, ayaq dəyməyən
Soyuq, gizli çölləri çəkəcək işə,
Yen, ey insan arzusu, təbiəti yen,
Düşmə təşvişə!

Ey vaxtilə gülməli əfsanələrdən
Zövq alaraq divlərə heyrət edənlər!
Ya kimdir şimaldakı taqi-zəfərdən
Keçib gedənlər?!

Alqış bu insanlığa yeni yol açan,
Yeni əməl uğrunda çarpışanlara!

Salam buzlu çöllərə işıqlar saçan
Kəhkəşanlara!..

Alqış bu təbiəti gözəlləndirən
İnsanlığın əbədi iqtidarına,
Onun, yeni cahana yeni ruh verən
İstismarına!..

Mən nə deyim, Çelyuskin nəfərlərinin
Həyəcana sığarmı qəhrəmanlığı?
Nə böyükdür o səma əsgərlərinin
Canfəşanlığı!..

Gördüm qızıl xətlərlə iş kitabında
Ey Şmidt, yazdırdığın böyük şanları.
Gəlsin, çalsın bir Homer öz rübabında
Bu dastanları!

## QADIN

Yoldaş, səfalətin uçrumlarından
Səni ilk qurtaran böyük xilaskar,
Yoldaş, səadətin uçrumlarından
Ən dadlı səslərlə bizi haraylar.

Sənin unutduğun ilk məhəbbəti,
O saxlar qəlbinin ən boş yerində,
İnsanın tükənməz əbədiyyəti
Çiçəklənir onun sinirlərində.

Söylə, şirinlikdə, hansı fidanda,
Hansı gülüstanda, hansı cahanda,
Ey yoldaş, ey qadın, sənin varın var?

Harda, ey xalqımın böyük yarısı,
Anası, bacısı, qızı, qarısı,
Bizdə olan kimi ixtiyarın var?!

## GÜZGÜ QAYITDI

Mənim Ceyranım məktəbli bir qız
Olur Bakının dağ hissəsində.
Bu suyuşirin, bu qarayağız
Qızın sinəsində
Duyğusu dərin
Yeni günlərin
Şirin dalğalı ahəngi yaşar.
Bu lətif ahəng ruhları oxşar.

Girmişdir payız, yarpaqlar sarı...
Mənim Ceyranım payız kibidir.
Aləm axışır məktəbə sarı,
O əsəbidir.
Həyata qanıq,
Ürəyi yanıq,
Çünki Ceyranım yaşa dolmuşdur,
Anası deyən "gəlin olmuşdur".

Qonşuda bir qız yaxdı özünü,
Bir acı, soyuq, küləkli gündə
Yeni həyata yumdu gözünü.
Bu iş üstündə
Ceyranın fəqət,
Bundan bir ibrət
Almadı yenə ata-anası,
Qulaqlarında elin zurnası.

Gəldi Ceyranı kim sevirdisə,
Dilə tutuldu, "həri" alındı.
Ceyran bilmədi, qapıldı hissə,
Razı salındı,
Məktəbi atdı.
Dadına çatdı
Bu zaman onun bir qız yoldaşı.
Ceyran düşündü, çatıldı qaşı.

Girmişdi payız... Ceyran neylədi?
Elm ocağına getdi bir səhər,
Öz ürəyini açdı söylədi...
                Uzaq bir şəhər,
                Burdan çox uzaq...
                Tiren alaraq
Ceyranı atdı həmən şəhərə.
Yerin altında gəzən şəhərə...

El-gün yığıldı, məclis qurdular,
Dedilər: "Ceyran Bakıda deyil"
Bir ilan kimi qovrulurdular
                Onlar elə bil.
                Bir titrəyirdi,
                İnildəyirdi.
Bu nə kələkdir, bu nə ədadır?
Deyirlər Ceyran Moskvadadır.

Avam anası tutuldu qəmə,
Avam atası qaşını çatdı.
Nifrət etdilər yeni aləmə.
                Güzgü qayıtdı...
                Oğlan evindən
                Qopdu bir şivən:
– Yerə girəsən, a belə gəlin!
Görüm ağ günə çatmasın əlin!..

Ceyran oxuyur... Moskvadadır.
Bakıda gəzir... sərxoş adaxlı.
Bu nə kələkdir, bu nə ədadır?
                Mən bu maraqlı
                Lövhəni aldım,
                Kitaba saldım.
Başıma sanki mövzu qəhətdi...
Adını qoydum: "Güzgü qayıtdı".

## ŞERİM

Sən varlığın eynisən, buna sözmü var?
Ürəyisən, beynisən, buna sözmü var?
Gecələr ay sənindir, gündüzlər günəş
kainat kimi!
Hər şey gözəlləşmədə, sən də gözəlləş
bu həyat kimi.

Varlığın rəngi sənsən, ahəngi sənsən!
Çiçəklərin, nurların çələngi sənsən.
Bülbülün qarşısında açıl, şirinləş
qızılgül kimi!
Hər şey dərinləşmədə, sən də dərinləş
bir könül kimi!

Dərinlik çox gözəldir, sadə olursa,
Nə çıxar o şeirdən başımı yorsa?
Mənalı səslərinlə, şerim, incələş
bir kaman kimi!
Hər şey sadələşmədə, sən də sadələş
hər insan kimi!

Doğrudur, zərifliyin adı başqadır;
Qüvvətə gəl, qüvvətin dadı başqadır.
Ölkələr silahlanır, sən də silahlan
ölkələr kimi!
Can deyə, canan deyə cəbhədə şaxlan
bir əsgər kimi!

Hər kəs bilir həyatın sonu ölümdür,
Ah bu qəmli dəyişmə yaman zülümdür.

Şerim! Bu gülünc oyun bəllidir yarın
bizi də bəklər;
Sən də öl mənim kimi, fəqət məzarın
olsun ürəklər!

## ÜÇ SAĞLIQ

Gecənin dodaqları gülümsəyirdi,
Masabəyi sevinclə: – İçin! – deyirdi. –
– İçin, bu altun şərab torpağımızda,
Şirin zəhmətimizlə, can bağımızda
Bəslənən tənəklərin şirəsidir ki,
Hətta bir az köhnədir, deyil bu ilki...
Üzlərdən ruzgar kimi keçdi fərəhlər,
Gecə gün bulağından doldu qədəhlər.
Dostlar içib gözləri süzülü qaldı;
Tuş meydən dodaqları büzülü qaldı.
Bu insanlar kimdilər? Sizin tanışlar!
Sizin kimi dünyada çağıldamışlar.
Canlarından fışqıran hər yeni zəhmət
Artırmış bir qüvvətin üstünə qüvvət!
Bu gecə bu səbəbdən ləzzət alırlar,
Boş vaxtı keflənddirib yola salırlar.
Çalan kim, oxuyan kim, qarışmış ara,
Qonaqlar bir ağızla söz vermiş tara.
Tar da sarı simində nəysə deyirdi...
Gecənin dodaqları gülümsəyirdi.

Bu gün təzə bir gülün açdığı gündür,
Dünyadan yalnızlığın qaçdığı gündür.
Dost evində çəkilmiş yeni nəfəslər,
Əks etmiş divarlara işıqlı səslər.
Başlamış bu ocaqda yeni sevişmə,
Açılmışdır həyatda bir yeni çeşmə.
Ana tutmuş körpəni öz qucağında,
Sanki bir gül açılmış cahan bağında

O çocuq bu köküsdə bir bəşərmidir?
Yoxsa su üzərində neylüfərmidir?
Əbədidir cahanda deyə izləri,
“Atanın da qürurla gülür gözləri”.
– Doldurun qədəhləri! – kimsə başladı,
Danışanlar susdular, tar yavaşladı.
– Ana! Ana!.. Əbədiyyət çeşməsi.
Nə acıdır yaman günə düşməsi!
Ana olmaq şərəflərin şərəfi.
Bu sinəsi inci dolu sədəfi
Uzun zaman ayaqlara saldılar,
Göyərçini ilan kimi çaldılar.
Gözəl ana, sənin büllur canında,
Şəfəqlərə ilham verən qanında
Nəğməmizin ilk büsatı quruldu,
Göz yaşımız ürəyində duruldu.
Ana, sənə rəvamıdır alçalış?
Qoynun beşik, yumşaq sinən nazbalış.

Aman, sən də ləkələnmə, gözəl qız!
Qaranlıqda kölgələnmə, gözəl qız!
Cilvələnmə xırsızların içində.
Ala gözlü ulduzların içində
Aydan aydın, sudan duru gecələr,
Xoş o qıza sevdasını hecələr.
Ürəyində çiçəklənən muradı,
Dodağında təbiətin ilk dadı,
İlk gülüşü qəlbimizi yandırar,
“Söz içində sözü yara qandırar”.

Gözəl qadın, çiçəklənməz ruhumuz,
Xəyalımız, düşüncəmiz, duyğumuz,
Bulud kimi könlümüzdən keçməsən,
Sən həyatın dodağında nəğməsən,
Sənin ana baxışında qüvvət var,
Məhəbbət var, səadət var, ləzzət var.

Əzəl səni quzu kimi izləyir,
Əbəd durub yollarını gözləyir.
Gəl bərabər fərəhlənib uçalım,
Sonsuzluğun qapısını açalım!

Sağlıq bitdi, yerindən məclis oynadı,
Üzlərdə cilvələndi bir hiss, oynadı.
Hamı: – Yaşasın, – dedi, ana gözəllər,
Ömrümüzün çayında sona gözəllər! –
Tar səsləndi, kaman da ona qoşuldu,
Hər könül fərəhindən uçan quş oldu.
– Qaldırın qədəhləri! – Gülüş, qəhqəhə...
Dostlarımız vurdular qədəh qədəhə.
Dostlar içib gözləri süzülü qaldı,
Turş meydən dodaqları büzülü qaldı.
Yenə tar, bir nəfər də yenə deyirdi.
Gecənin dodaqları gülümsəyirdi...

Gözəllik yuvasında gözlər quş kimi,
İpək qanadlarilə uçurmuş kimi...
– Dostlar! – deyə bir qadın ayağa qalxdı,
Mehriban gözlərilə məclisə baxdı.
Bir az əndamı oldu titrəyən kimi,
Hissinin sularında bir yelkən kimi
Ağ sinəsi qabardı, sözə başladı.
Danışanlar susdular, tar yavaşladı
– Sevincdən bu saat qəlbim atlanır,
Gözümdə göy uçur, yer qanadlanır.
Hər yerdə, hər zaman istəyirəm mən
Tutsun gözəlliyin eşq ətəyindən!
Bu yolda şənlənib ucalsın ellik,
Kimi sevda olsun, kimi gözəllik.
Vay ona: ruhunun tükənməz yası,
Tutmaz ürəyində eşqin mayası,
Boş həvəs uğrunda canından keçər,
Əzab laşəsinin yanından keçər,
Quzğun tək üstünə gülərək qonar.

Bir kaman sızıldar, bir könül yanar!
Vay o gözəllərə, açmaz gül kimi!
Vay o mərdlərə ki, bir bülbül kimi
Bir bağda gözünün yaşını tökməz,
Səadət gülünün ətrini çəkməz!
Bizə gəl-gəl deyir işıqlı günlər.
Oyunlar, nəğmələr, toylar, düyünlər.
Bizə gəl-gəl deyir günəşlər, aylar,
Yerlər, göylər, sular bizi haraylar.
Bizə gəl-gəl deyir qüvvət, məharət,
Əmək, mübarizə, həyat, cəsarət.
Bizi haraylayır altun şəfəqlər,
Ömür kitabında yeni vərəqlər.
Bizi haraylayır, şanlar, şərəflər,
Gələcək günlərin ruhu xələflər.
Ər odur, bu günü görür yarından
Musqulu torpağın damarlarından
Daha möhkəm olur, daha sərt olur.
Boş keçən bir günü ona dərd olur.
Ər odur, ürəyi duru çeşmədən,
Ellər gözəli də xofə düşmədən
İçər çiçək kimi onun suyundan,
Dünyada ləzzətli nə var ki, bundan?!

Qopdu alqış, gurultu: – Yaşasın ərlər!
Biri gülərək dedi: – İndi içərlər!
Yaşasın sağlam ata, qüvvətli bağban!
Yaşasın dünyadakı solmaz gülüstan!
Qədəhlər cingildədi, tar dilə gəldi;
Səsində el qüvvəti, yar dilə gəldi:

“Qapıdan huru gəlir,
Gözümün nuru gəlir,
Bu arxı kim arıdıb
Su belə duru gəlir?”

Bülbül uçdu qəfəsdən,
Gül açıldı həvəsdən,

Gözüm gözəldən doymaz,
Qulağım incə səsdən.

– Yaşasın bülbülün, gülün masalı!
Hər kəsin üzünə gülsün iqbalı!
Dolansın fələyin asudə çarxı,
Yaşasın ellərin işıqlı arxı! –
Deyərək, bir nəfər yenə söz aldı.
Bu məclisin halı başqa bir haldı!..
– Çocuq... bu qönçənin qoxusu başqa;
Alqış bu qönçəni bəsləyən aşqa!
Nələr gözləməyir gələcək ondan?
Çocuqsuz ev nədir, bir qara zindan!
Çocuq insanlığın əbədiyyəti,
Şərəfli torpağa şərəf qüvvəti!
Çocuq açılmamış bir dəfinədir,
İnsan dövlət üçün bir xəzinədir.
Bizə gizli qalan gözəllikləri
Onun zəhmətləri, saf ilikləri
Yarın kəşf edəcək, cahan böyükdür.
Bu insan oğlu da ondan böyükdür!
Vay ona, dünyadan sovunsuz gedər,
Nəğməsiz, nəşəsiz, oyunsuz gedər!
Gedərkən çevrilib ardınca baxmaz,
Hətta karvan kimi bir toz buraxmaz.
Keçər bu dünyadan quru səs kimi,
Bir ruzgar, bir xəyal, bir nəfəs kimi.
Biz ayız, günəşiz, ulduzlar çocuq.
Yaşa bu dünyada bəxtiyar, çocuq!
Döyün, ey qüvvətin nəşəli qəlbi,
Yaşa günəş kibi, kainat kibi,
Bizdən də asudə, bizdən də parlaq,
Bizdən də möhtəşəm, bizdən də qıvraq!
Yaz kimi qoynunu açsın gələcək,
Yollara gül-çiçək saçsın gələcək!
Ona qonaq gəlir yeni nəsillər,
Açsın saxlancını şanlı fəsillər,

Bilsinlər cahana nə canlar gəlir,
Dirilik yolçusu insanlar gəlir!
– Sağ ol! Sağ ol! – səsləri məclisi sardı.
Gurultunu bir könül nəğməsi yardı:

Baxçada güllər,
Sarı bülbüllər,
Bu balama qurban!
Duyğusuz ellər.

İlk məhəbbətim,
Qəlbim, qüvvətim,
Eyşim, işrətim
Bu balama qurban!

Əlvan çiçəklər,
Zər kəpənəklər,
Kinli ürəklər
Bu balama qurban!

Göydə ulduzlar,
Yerdə yarpızlar,
Avara qızlar
Bu balama qurban!

Dünyanın malı,
Cahı-cəlalı,
Şövqü, vüsalı
Bu balama qurban!

Onlar oxudu, çaldı, oynadı, çaldı,
Bu hal dilə gəlməyən başqa bir haldı.
Onlar həyat eşqinə, dünya eşqinə,
Zəhmətə rövnəq verən sevda eşqinə
İçdilər, dəm vurdular saysız xəyaldan,
Həyatın cövhərindən, büllur zülaldan,
Keçmişdən, gələcəkdən, şanlı bu gündən,
Səadətdən, əməkdən, toydan, düyündən.

Onlar şərab içdilər şərab eşqinə,
Şeir, nəğmə, gözəllik, rübab eşqinə.
Təbəssüm dünyamıza bəzəkdir deyə,
Gülümsəyib vurdular badə badəyə.
Onlar şərab içdilər, səfa sürdülər,
Açıq pəncərələrdən baxıb gördülər:
Ruhumuzdan tökülən nəğmələr kimi,
Dəyərli, dadlı-duzlu kəlmələr kimi
Ulduzların əriyib üzüldüyünü,
Göylərin süzgəcindən süzüldüyünü.
Gördülər dan yerinin söküldüyünü.
Qaranlığın əriyib töküldüyünü,
Artıq hamı: – Gedəlim, yetər! – deyirdi,
Günəşin dodaqları gülümsəyirdi.

## KÖNLÜMÜN DEDİKLƏRİ

Mənim könlüm deyir ki,
Hələ bunlar nədir ki...
Böyük günlər, şanlı günlər, şən günlər,
Yoluna düşən günlər
Hələ qarşımızdadır!

Hələ bunlar nədir ki...
Mənim könlüm deyir ki,
Həyat ondan küsənləri incidər.
Möhkəm dəzgah, şirin əmək, inci tər
Hələ qarşımızdadır!

Babam derdi: "Keçən günə gün çatmaz!"
Mənim könlüm bu sözlərə heç yatmaz.
O düşünüb deyir ki,
Hələ bunlar nədir ki...
Ay işığı, dolu ürək, yaşıl bağ,
Qızğın günəş, sərin çeşmə, qarlı dağ
Hələ qarşımızdadır!

## TƏRTƏRHES NƏĞMƏLƏRİ

**I**

Yenə könlüm uzaqlarda,
Quş qonmayan ovlaqlarda
Qanad çalır tərlan kimi.
Bir dərənin üzərində
Çisəkləyir duman kimi.
Nədir məni bu coşduran,
Hankı əsr, hankı dövran
Olmuş bizim dövran kimi?
Bir aşağı, bir yuxarı
Burax çapsın söz atları
Ürəyimdə ceyran kimi!
Yenə qopdu bir qasırğa,
Nəğmələrim dalğa-dalğa
Gurlayacaq tufan kimi.

**II**

Budur, gəldi gül mövsimi,
Tarçı, köklə sarı simi,
Bir şey çal ellər eşqinə!
Günəş qızıl, dünya yaşıl.
Gülümsəyir işıl-işıl
Duyan könüllər eşqinə.
Durma, köklə sədəf tarı,
Səbrimizin yarpaqları
Töküldü yellər eşqinə.
Bir hava çal, can oynasın,
Dağlarda duman oynasın
Qırdığın tellər eşqinə.
Mən də sözlə əmin-əmin
Daraq çəkim düşüncəmin
Zülfünə Tərtər eşqinə.

**III**

O yan dərə, bu yan dərə,
Hər yamacda bir mənzərə,
Nə aləmdir bu Qarabağ!..

Göy üzündə şən bulutlar
Yer üzündə məxmər otlar,
Bu günəşli səhərə bax!
Hər yan dağdır, hər yan meşə,
Novruzgülü, mor bənövşə,
Bülbüllərə, güllərə bax!..
Gah mülayim, gah əsəbi,
Bir dalğalı ömür kibi
Axıb keçən Tərtərə bax!
Tərtərdəki səhnələrə
Polad döşlü dəhnələrə,
İnsana bax, hünərə bax!

**IV**

Tərtər çayı! Nə zamandan,
Hansı çılğın bir tufandan
Qaynayışın başlar sənin?
Hər axışın bir inqilab,
Hər dərən bir dərin kitab,
Başında çox iş var sənin.
Varıb keçdi apardığın,
Yaynağından keçən yığın,
Keçmişmidir təkrar sənin?
Bir sorğu kəsdi qarşımı:
Tarixlərin göz yaşımı
Axıtdığın yaşlar sənin?
Məndən başqa arxan varmı,
Fəryadına dayanarmı
Dağlar sənin, daşlar sənin?

**V**

Tərtər çayı!.. Tərtər çayı!
Ötən çılğın vurharayı
Bir salsana yadına sən!
Bir zamanlar candı o kənd,
Dil çıxarıb yandı o kənd,
Yetişmədin dadına sən.

El yanarkən için-için,
Dalğalanıb onun neçin
Su səpmədin oduna sən?!
Qanlı alov dalğa-dalğa
Yayılarkən ortalığa,
Heç baxdınmı ardına sən?
Gözəl Vətən, söylə mana,
Söylə mana, yana-yana
Getdin kimin badına sən?

**VI**

Bu nə yoldur, daşnaq yolu...
Hər dərəsi qanla dolu,
Nə acıdır bunun adı.
O dənizdən bu dənizə
Deyib çıxdı sinəmizə,
Bir tapdadı, bir doğradı.
Orda dəhşət, burda vəhşət,
Əlində baş, dişində ət,
Tanırsınız müsavatı.
Nə bağ qaldı, nə də bağban.
Qurşun, ölüm, atəş, duman
Yaxamızı parçaladı.
Bilən bilir, bu zülmətə,
Bu uğursuz fəlakətə
Kim əl çaldı, kim ağladı.

**VII**

Onlar deyən yalan oldu,
Keçən keçdi, olan oldu.
Coşdur, bizim günlər, məni!
Bir çalışır, bir yaşayır,
Bir-birinə çox oxşayır
Bu dağlarda türk, erməni.
Arzumuzun dərəsindən,
Bağımızın bərəsindən
Haraylayır Tərtər məni.

Aman Tərtər, tut əlimdən,
Uzaq düşmə əməlimdən,
Yoxsa ellər ötər məni.
Biri sızlar, biri yanar,
Bilirsən ki, necə anar
Qələm məni, dəftər məni!

**VIII**

Gah o gözdən, gah bu gözdən,
Murov dağdan, Alagözdən
Verə-verə nişan Tərtər.
Dağı-daşı uçuraraq,
Torağaydan alıb soraq,
Eldən-elə qoşan Tərtər.
Bir gurlayan həyat kimi,
Dərələrdən ağ at kimi
Şahə qalxıb aşan Tərtər.
Keçmişini salma yada,
Gözdən düşər bu dünyada
Düz yolundan şaşan, Tərtər,
Nə işin var dağda, düzdə?
Bir qan kimi Madagizdə
Gəl qəlbimə boşan, Tərtər!

**IX**

Hər yamacda bir tamaşa,
Könlüm uçur dağa-daşa,
Seyr etdikcə təbiəti.
Dağ başında duman gözəl,
Bu qaralan orman gözəl,
Könlümdədir məhəbbəti.
Kim der sənə yaman, dünya.
Sən gözəlsən aman, dünya,
Ey günəşin əmanəti!
Keçmişin göz yağmurundan,
Ürəyimin çamurundan
Seçməliyiz şikayəti.

Ey əzəldən yığın-yığın,
Ölən, qalan insanlığın
İlk cənnəti, son cənnəti!

**X**

Gözünü aç, dağlara bax,
Bir gözəldir bu Qarabağ
Təbiətin qucağında.
Doğmuş kimi ülviyyətin,
Gözəlliyin, məhəbbətin
Ən səfalı bir çağında
Uzun saçlı qızlar kimi,
Tar çalaraq sızlar kimi
Tərtər gümüş yatağında.
Burda versən can, yeri var,
Yenə bülbül, qan yeri var
Qızılgülün yanağında.
Ürəyimdə sözüm qaldı,
Bu dağlarda gözüm qaldı
Bir maralın buxağında.

**XI**

Nə deməkdir bu aldanış!
İşdən danış, gücdən danış,
Çağır yeni mahnı, şair!
Çırpınmalı el səsində,
Elin köküs qəfəsində
Sözlərinin canı, şair!
İşə keçməz boş nəğmələr,
Dodaqaltı zümzümələr,
Orkestrin hanı, şair?!
Dönüş yoxdur bir də geri,
Şarıldayan bu Tərtəri
Yaxşı öyrən, tanı, şair!
Həqiqəti görməyənin,
Elə könül verməyənin
Batsın adı-sanı, şair!

## XII

Odlayarkən bağrınızı,
Mən duyuram ağrınızı,
Darılmayın mana, dağlar!
Gətirəcək bu daşqın sel,
Qəlbinizdən keçən tunel
Ölkəmizi cana, dağlar!
Qaranlığı yıxmalıyız,
Aydınlığa çıxmalıyız,
Nə dərsiniz, buna, dağlar?
Çırağınız sönməyəcək,
Bundan belə dönməyəcək
Ürəyiniz qana, dağlar!
Yüksələcək mənliyimiz,
Gəlməyəcək şənliyimiz
Sayıldıqca sana, dağlar!

## XIII

Günəş çıxmış qaranlıqdan,
Bir qarışıq dumanlıqdan,
Parçalamış qaranlığı...
Fəqət bilsən, gün vuracaq,
Nə ulduzlar doğuracaq
Dühamızın dumanlığı!
Şarıldayıb, tüstülənib,
Coş, Tərtərim, dağdan enib
Gəz dağlığı, aranlığı!
Öz gücünü bildir bu gün,
Cənnət kimi güldür bu gün
İlanlığı, sayanlığı!
Yaşa, həyat selimizin,
Ağlımızın, əlimizin
Qüvvət, işıq sultanlığı!

## XIV

Hər dalğası sona Tərtər,
Qurban olum sana, Tərtər,
Uyut məni yatağında!

Könül açan nəğmən, şerin
Pıçıldasın bu şairin
Ləpələnən dodağında.
Yetər artıq üzülməmiz,
İşıq kimi əzilməmiz
Qaranlığın tapdağında!
Ahımızdan meh durmadı,
Elə yandıq, şeh durmadı
Ömrümüzün yarpağında.
Yax lampanı lalə kimi,
Sərin nurlu halə kimi
Gəlnimizin otağında!

**XV**

Gəl döyəlim döşümüzə,
Başlayalım işimizə,
Qüvvət səndən, hikmət məndən.
Daşkəsəndə, dağda, daşda,
Hər cəbhədə-mərd savaşda
Himmət səndən, cürət məndən.
Ölkəmizə dəmir gərək,
Dəmirdədir asan çörək,
Şiddət səndən, zəhmət məndən.
Qazax, Yevlax yollarında,
Elektrik qatarında
Sürət səndən, söhbət məndən.
Elə işıq səndən gəlsin,
Yar-yaraşıq səndən gəlsin,
Şeir, nəğmə, sənət məndən.

**XVI**

Tərtərhesi seyrə gəlin,
Eybi yoxdur bu gözəlin,
Bu torpağın aləmi var.
Hər dərənin bir əsrarı,
Hər yamacın bir baharı,
Hər dağın bir görkəmi var.

Bu yerlərdə çalışanın,
Ay, gün kimi alışanın
Nə dərdi var, nə qəmi var?
Axşamçağı tarın səsi,
Qarabağın şikəstəsi,
Hər kəsin bir həmdəmi var.
Batma, günəş, bir az dayan,
Dar gəlməzmi sana o yan,
Bundan gözəl ölkəmi var?!

**XVII**

Çağırıram mən hər kəsi,
Gəlsin, görsün Tərtərhesi,
Bilsin, burdan nə hal keçir,
Burda köhnə məzarlıqdan,
Xəyal olan bir varlıqdan,
Bir uzunca kanal keçir.
Bu yerdə bir qoca gördüm,
Üzünə baxınca, gördüm
Könlündən bir sual keçir.
Dedim: Qoca, dərdi burax,
Mən nəyəm bir ovuc torpaq,
Qabağından xəyal keçir.
Bu inadlı vurğuya bax,
Bu möhtəşəm qurğuya bax,
Ömür sönür, tonqal keçir...

**XVIII**

Əlimdə bir sınıq qafa...
Ömrümüzə yoxmuş vəfa,
Düşündüm hər adam kimi.
Bir aralıq batdım qəmə,
Sonra dedim: – Cəhənnəmə! –
Gülümsədim Xəyyam kimi.
Öz-özümə verdim ürək,
Dedim, ömrüm keçsin gərək.
Bir işıqlı bayram kimi!

Göz gəzdirdim sola-sağa,
Baxdım, Tərtər qalxır dağa
Bizim köhlən əyyam kimi.
Məni aldı bu tamaşa,
Boş qafanı çaldım daşa
Meysiz, ruhsuz bir cam kimi.

**XIX**

Ey bu axan duru çaydan,
Gözlərimin nuru çaydan
Bir dirilik uman ellər!
Bu torpaqla, bu Tərtərlə,
Alnımızdan axan tərlə
Doğrulacaq zaman, ellər!
Zaman bizə bir qonaqdır,
Alnı açıq, üzü ağdır,
Ey mehmana mehman ellər!
Onu yaxşı yola salın,
Hər dərdini xəbər alın,
Aman ellər, aman ellər!
Könlümuzdə, gözümüzdə,
Qəlbimizdə, üzümüzdə
Görünməsin duman, ellər!

**XX**

Səhər, axşam öz yerindən
Keçsin, çocuq gözlərindən
Keçən lətif uyqu kimi.
Filiz deyə, çiçək deyə
İş nəğməmiz hər zəmiyə
Hopsun sərin bir su kimi.
Hər şey ləzzət versin bizə.
Dolsun geniş qəlbimizə
Bu dünyada arzu kimi.
İşdən sonra, axşamçağı,
Əlimizdə mey bardağı
Mələşəlim quzu kimi.

Sinədə tar, əldə qaval,
Bu dünyada bir kapital
Varmı insan oğlu kimi?

**XXI**

Bir saz kimi dərələrdə,
Çağıldayın pərdə-pərdə,
Ey ruhuma yaxın, sular!
Yoxdur sizdən fərqim mənim,
Sükut deyil şərqim mənim,
Dayanmayın, axın, sular!
Bir uyqusuz ürək kibi
Çeşməmizin həyat dibi
Qurumasın, saqın, sular!
Bizim yaşıl ruhumuzun
Mahnısını uzun-uzun
Çağırınız, daşqın sular!
Söyləyiniz dastanını,
Çınlatınız kamanını
Gözəlliyin, aşqın, sular!

**XXII**

Dayanmayın, ellər, gəlin,
Ey tükənməz sellər, gəlin,
Səslənəlim rübab kimi.
Hər könül öz hesabına,
Əbədiyyət rübabına
Toxunmalı mizrab kimi.
Ürəyimiz sərin olsun,
İzlərimiz dərin olsun
Göy üzündə şəhab kimi.
Al günəşin altında biz
Kaşanələr tikməliyiz,
İşıqları mehtab kimi.
Dostlar, baxın bir yuxarı,
Göydə ulduz salxımları,
Sıxın, için şərab kimi!

## XXIII

Bu nəğmələr Tərtərdəki,
Torpaqdakı, bəşərdəki
İşıq-qüvvət nəğməsidir,
Bu nəğmələr mədəniyyət,
Dünyadakı şirin ləzzət,
Yüngül zəhmət nəğməsidir.
Bu nəğmələr dərin-dərin,
Geniş-geniş ürəklərin
Səmimiyyət nəğməsidir.
Bu nəğmələr məlahətə
Gözəlliyə, məhəbbətə
Olan hörmət nəğməsidir.
Bu nəğmələr kainatın,
Dadlı-duzlu bir həyatın
Əbədiyyət nəğməsidir!

## SƏNƏTKAR

Ah, nə böyük şərəfdir sənətkar olmaq,
Könüllər dünyasından xəbərdar olmaq!
Nə xoşdur bir hiss kimi qəlblərə girmək
səssiz-sorğusuz.
Bütün fənalıqları yıxıb devirmək
qara-qorxusuz.

Mən ruhlanıb çevrəmi saran yığından,
Hayqırıram xalqımın ucalığından.
Orda candan, könüldən mənimlə ellər
olmuşkən tanış.
Mənə bu aralıqda kim deyə bilər:
çox bil, az danış?

Mən qarşımda yamyaşıl çöllər görürəm,
Qeyrətli, bacarıqlı ellər görürəm.

Görürəm o dağdakı toyu, düyünü
yeni səhnədə.
Görürəm Tərtərhesin köpürdüyünü
polad dəhnədə.

Getsin iş əvəzində mənə söz verən,
Gəlsin dəmiri döyən, yeri becərən.
Mənimki onlarladır, onlar da ancaq
bizə tərəfdir.
Əvət, bu insanların şairi olmaq
böyük şərəfdir.

Mən bir dövürdəyəm ki, tunc qanadlanır,
Qara daşın, mərmərin köksü atlanır,
Boylanır qabağımda böyük bir əməl,
ucalır başım.
Fərəhlə seyr edincə, şerimdən əvvəl
axır göz yaşım.

Ah, nə böyük şərəfdir sənətkar olmaq,
Könüllər dünyasından xəbərdar olmaq!
Nə xoşdur bir hiss kimi qəlblərə girmək
səssiz-sorğusuz.
Bütün fənalıqları yıxıb devirmək
qara-qorxusuz.

## TORPAQ

Hər şeyin anası, qaynağı sənsən!
Sənin varlığına ölüm-itim yox.
Sən bütün-bütünə ruhsan, bədənsən,
Gözəl torpaq, sənə çox borcluyam, çox!

Bu qardaşım ağac, bu dal, bu yarpaq,
Hamsını canladan sənin şirəndir.
İnsan da, ey qoca, ey köhnə torpaq,
Sənin hər addımda dəyişdirəndir!

Sən və mən bir ruhuq iki qalıbda,
Qara torpaq, səni yerdən alıb da
Göylərə qaldıran əməllərindir!

Sənə qüvvət verən, sənə ruh verən,
Çoraq çöllərini çiçəkləndirən
Mənim şən əməyim, alın tərimdir!

## USTAMIZA

Burax şeir kürəsini qaplasın məlal,
Gözümüzə görünməsin başqa bir xəyal,
Qarşımızda yalnız onun xəyalı dursun,
Bizdən sovet sənətinin sirrini sorsun,
Sızıldasın qəlbimizin tarında hər sim.
Durdu sənət dühasının ürəyi – Maksim!
Nə qalmışdı bu dünyada açılmamış, nə?
Əsrlərin şairləri insan qəlbinə
Cumub nələr, nə incilər çıxarmadılar?!
Gəzdi xəyal iqlimində min bir sənətkar,
Sandılar ki, bu dünyanın sözü qurtardı;
Ancaq hələ açılmamış bir qitə vardı,
Bir qitə ki, şanlı adı əmək dünyası.
Böyük usta! Əlindəki şeir fırçası
Bir zamanlar dumanların altında qalmış,
Üzərini ölümlərin kabusu almış
Bu qitənin rənglərindən yapdı bir dəmət,
Cilvələndi mənasında insan və zəhmət!

## N. OSTROVSKİ ÜÇÜN

Dağlarda, daşlarda bir qartal kimi
Sarpdı yorulmadan qanadın sənin!
Tufanda çarpışan bir sandal kimi
Keçdi cəbhələrdə həyatın sənin!

Min dəfə ölümün yanından keçdin,
Qızıl şəfəq kimi qanından keçdin,
İnqilab yolunda canından keçdin,
Zəkandan kəskindir inadın sənin!

Ey böyük sənətkar, ey böyük əsgər!
Bu şərəfli həyat dünyaya dəyər!
Bağırır ardınca ölkələr, ellər:
Bərkimiş, bərkiyir "poladın" sənin!

## YALNIZ AĞAC

Olduqca qayğılı, olduqca qəmli,
Sadə mənzərəli, sadə görkəmli
Yalnız ağac baxır bir dağ başından.
O hansı əyyamın iğtişaşından,
Hansı zəlzələdən olmuş müztərib?
Düşünür təklikdə sanki bir qərib.
Sarmış çevrəsini inadlı bir çən,
Danışır haqqında hər gəlib keçən.
Sanki fələklərin fırtınasından,
Bir yavru ayrılmış öz anasından.
O, yoxsa kimsəsiz bir çobanmıdır?
Sürüdən ayrılan bir ceyranmıdır?
Sularda, dəhşətli göy dalğalarla,
Atəşin zərbəli qasırğalarla
Sarsılan çarəsiz bir yelkənmidir?
Onun gözlərində həyat şənmidir?
Bu yanda səfalı qalın bir orman,
Yaz olsun, qış olsun, gülür hər zaman.
Quşların nəğməsi, suların səsi,
Ətirli güllərin sərin nəfəsi
Davasız dərdlərə gizli əlacdır.
Məni düşündürən yalnız ağacdır.
Zavallı qardaşım! Böylə keçərsə,

Əbədiyyət sənə qanad da versə,
Səndən qalmayacaq nişan dünyada,
Dirilik eşqilə coşan dünyada.
Bir tufan qopacaq, saralacaqsan,
Bir şimşək vuracaq, qaralacaqsan.
Başında oynayıb qəm buludları,
Sökəcək bağrını ölüm qurdları.
Mən də sənin kimi yalnız ağacdım,
Təklikdən usanıb axırda qaçdım.
Qəlbimlə, ruhumla qoşuldum elə,
Düşüncəm sakitdir o gündən belə.
Bax, indi mən hara, yalnızlıq hara?
Azad fikirlərə, azad quşlara
Qəlbimin hər gözü bir aşiyandır,
Bədbəxt bu dünyada tək yaşıyandır!

## GÖZƏLLİK

Gözəllik əzəldən bütün ellərin
Həvəslə qoşduğu bir şanlı qayə;
Gözəllik ruhudur qızılgüllərin
Bülbüllər üstünə saldığı sayə.

Xoşdur gözəl görüb bütün elliyi
Çalışmaq, yaşamaq, sevmək, sevilmək!
Xoşdur xilqətdəki hər gözəlliyi
Ürəkdən duyaraq anlaya bilmək!

Ey bizim dünyanın ən birincisi,
Mehriban gözəli, nadir incisi,
Mən sevmişəm səni hər kəsdən əvvəl!

Fəqət yabançıdır coşqun ruhuma,
Elimə, ölkəmə, təbi-şuxuma
Mənasız gözəllik, mənasız gözəl!..

## AXŞAMÜSTÜ

Günəş solğun. Üfüq də tutulmuş kimi dərdə,
Orda sarı buludlar sallanır pərdə-pərdə
Və gül rəngli kölgələr çörəmizdə sıxlaşır.

Aman! Şu qan gölündə günəşi kimdir boğan?!
Sevda yollarımızda nə işıq, nə işılğan,
Əzablı ruhlar kimi hava qaranlıqlaşır.

Mənim təmiz eşqimin zülmətdə nə dərdi var?
Həramilərə qalsın qara, qorxulu yollar,
Mənə günəş batınca ulduz verin, ay verin!

Sevdamızı işıqlı bir yola çıxarmağa,
Yeri-göyü qaplayan zülmətləri yarmağa
İliç günəşlərindən mənə bir alay verin.

## NƏ DEMƏKDİR?

Çoxdandır çalınmayır divardan aslı tarın,
Tutqun bir ürək kimi telləri paslı tarın,
Ey mehriban sevdiyim, gurlayacaq, yoxsa yox?!

Mən bilirəm, sənin ki, bir qəlbin var sədəfdən,
İçindəki incilər saçılıb hər tərəfdən,
Dodağında şərqilər parlayacaq, yoxsa yox?!

Sən iclasdan gəlirsən, məni də yormuş kitab,
Nə dayanmaq vaxtıdır, iştə tar, iştə mizrab,
Nə gözəldir nəğmələr qanadında ucalmaq!..

Həyat işdir, döyüşdür, səadətdir, əməkdir,
Bilə-bilə bunları dayanmaq nə deməkdir?!
Nə deməkdir dünyada tez qarıyıb qocalmaq?!

## OXU

Oxu, sevdiciyim, öz həvəsinlə!
İlzam qanadlanır sənin səsinlə.
Nəğməndə oynasın sellərin səsi,
Dan yerindən əsən yellərin səsi.
Gülləri qoxlayan bir rüzgar kimi,
Qumları oxşayan dalğalar kimi
Titrəyən, çağlayan nəğmən olaydım,
Ürəyindən qopan səs mən olaydım,
Oxu! Qüvvət gəlsin şeirə, sənətə,
Könlümün quşunu gətir heyrətə!
Nə qədər bənzəyir, vardım fərqinə,
Ömrümün ahəngi sənin şərqinə.
Ürək kövrəkləşir sən oxuyanda,
Sən də dinləsəydin mən oxuyanda!
Oxu, sevdiciyim, öz həvəsinlə!
İlham qanadlanır sənin səsinlə!

## SƏNİN GÖZLƏRİN

Nə gözəl süzülür qara gözlərin,
Əcəba, onları süzmək vaxtımı?
Duruşun mənalı, baxışın dərin,
Mən bu dərinlikdə buldum baxtımı.

Sənin gözlərinmi gənclik bağında,
Yoxsa nərgizlərin sayrışıb oynar?
Yoxsa çıxılmayan eşqin dağında
Ömrümün dirilik çeşməsi qaynar?

O qara gözlərin deyil parlayan,
Ulduzlar içində gecələrimdir!
Bəlkə də ruhuma aydınlıq yayan
Bir sərin, ziyalı, yaz səhərimdir.

Qoy desin dünyanın el aşıqları
Bu şövqü kim mənim ruhuma yaydı,

Donardım, gözünün şən işıqları
Qəlbimin camında qırılmasaydı.

Qara qış üstümə tökər qarını
Nərgiz gözlərindən məni ayırsan.
Mənim ümidimin qapılarını
Neçin gah açırsan, gah qapayırsan?

Sənin gözlərinmi gənclik bağında,
Yoxsa nərgizlərin sayrışıb oynar?
Yoxsa çıxılmayan eşqin dağında
Ömrümün dirilik çeşməsi qaynar?

## BİR DƏ BAXSAN MƏNƏ

Baxışın qəlbimi incitmişdir;
Bu baxışdan, bu duruşdan əl çək.
Bir də baxsan mənə, iş bitmişdir;
Bir də baxsan mənə, fikrim dönəcək.

Yenidən uyqusu qaçmış gecələr,
Sevgilər, fırtınalar başlanacaq.
Ayrılıqlar, qarışıq bilməcələr...
Yanacaq sıtmalı ruhum, yanacaq!

Bu baxışdan, bu duruşdan əl çək!
Yoxsa könlümdəki qızğın şimşək
Üstünə od sovurar hər yerdən.

Orda dur, burda dayan, hey bəklə,
Səni tale günəşim güdməklə
Keçməsin qorxulu vadilərdən.

## SƏNİN GÜLÜŞLƏRİN

Qarşımda nazlanıb yenə gülürsən,
Bilsən gülüşlərin nəyə bənzəyir?
Mən desəm artıqdır, özün bilirsən,
Lalə yarpağında şehə bənzəyir.

Sənin gülüşlərin bir ruzgar kimi
Əsərkən arzumun gülü açılır.
Gülsə dodaqların ulduzlar kimi
Ruhuma bir sərin işıq saçılır.

Söylə, gözəllərin dodaqlarından,
Bu oynaq gülüşlər umulmuşdur?
Sənin hər qəhqəhən ay kənarından
Keçən buludmudur, uçan quşmudur?

Sənin gülüşlərin yaz səhərindən
Hissimə, fikrimə sanki rəng alır.
Gül ki, şeirlərim gülüşlərindən
Qırılmaq bilməyən bir ahəng alır.

Sən güldüyün zaman bu şad günümdə
Açılır qarşımda, canlanır bahar.
Bəzən başucumda, bəzən önümdə
Şimşəklərim çaxar, sularım axar.

Cahan ki solmayan bir bağça-bağdır,
Burda rəvamıdır gülmədən ölmək!
Yazıq o şəxsə ki, qaraqabaqdır,
Nə qədər yaraşır insana gülmək!

## ULDUZLAR

Bəzən titrəşərək parlayırsınız
Göylər bağçasında lalələr kimi,
Bəzən yaş tökərək ağlayırsınız
Lalələr üstündə jalələr kimi.

Baxarkən süzülən gözlərinizə,
Deyirlər: nə qədər siz yovuqsunuz.
Həqiqətdə isə bir-birinizə
Siz çox iraqsınız, çox sovuqsunuz.

Fəqət biz – o gözəl sevgilimlə mən
Uzaqdan-uzağa tanış deyilkən
Nə qədər yaxınıq, öyrənsəydiniz.

Şirin söhbətlərdən uzaq da olsaq,
Uzun illər boyu ayrı da qalsaq,
Eyni duyğularla vurur qəlbimiz!

## MƏNİM EŞQİM

Nə ağırdır mənim eşqim, nə ağır,
Bu ağır siqləti çəkməz divlər.
Ey könül! Burda təhəmmül göstər,
Nə haray çək, nə acıqlan, nə bağır.

İldırım çaxdıracaq hər yandan,
Azacıq dolsa buludlarla səma.
Bu dənizlər də çocuqdur, baxma,
Sarsılır hər qopacaq tufandan.

Mən fəqət kəndimi hiss etdim şad,
Çəkmədim eşqin əlindən fəryad,
Bu da hər davranışımdan bilinir.

Gözlərin, ah o qaranlıq göllər,
Bu gözəl göllərə çox dalsam əgər,
Hər ağırlıq ürəyimdən silinir.

## MƏNİM BEŞİLLİYİM

Hər kəs öz işini sona yetirdi,
Kimsə bu dünyada arzu qoymadı.
Kimi yer altından xəbər gətirdi,
Kimi uçdu göyə, yenə doymadı.
Ellər muradını aldı zamandan,
Bizə könül sözü qaldı zamandan.

Gözəldir bir uca əməl bəsləyib,
Bu əməl uğrunda qan-tərə batmaq.
Gözəldir günəşi, ayı səsləyib,
Onları da bizim dəstəyə qatmaq.
Dövranla əl-ələ vermək yaxşıdır,
Hər bağdan bir çiçək dərmək yaxşıdır.

Görməkçin özünü hər kəs ilərdə,
Bir məqsəd uğrunda göstərir hünər.
Çarpışıb havada, dənizdə, yerdə,
Hər döyünən ürək bir əməl bəslər.
Hayıf, ömür qısa, arzu genişdir,
Kim bu qayğı ilə titrəməmişdir?!

Bu vəfasız ömür, bu coşqun dərə
Gərək boş-boşuna axıb keçməsin!
Bu gözəl cahanı sanıb pəncərə,
Hər gələn sadəcə baxıb keçməsin!
Gəlin, arzumuza çatalım, dostlar!
Dağları dağlara qatalım, dostlar!

Ayrılıb arzumun kəşməkəşindən,
Gizlənmə könlümdə sən də, ey ilham!
Gah batan, gah çıxan qış günəşindən
Dərs alıb, dayanma gendə, ey ilham!
Niyə mən istəyən olmasın, niyə?
Mənim beşilliyim dolmasın, niyə?

## RƏQS

*İlk rəqs dəstəmizə ithaf*

Əcəb, sizmisiniz böylə oynayan,
Yoxsa göy üzündə qartallarımdır?
Yoxsa ürəyimdə coşan, qaynayan
Şirin arzularım, xəyallarımdır?

Bəzən durna kimi düzüləndə siz,
Fikrim sətirlərə düzülməsinmi?
Sallanıb qarşımda süzüləndə siz,
Duyqum gözlərimdən süzülməsinmi?

Oynayın, qarşımda oynasın yenə
Əski tufanlarım, burağanlarım!
Sevdalı ruhların dərinliyinə
Tökülsün hisslərim, çağlayanlarım!

Oxuyub oynarkən siz, öylə bil ki,
İldırımlar çaxdı ilk baharımda.
Dedim ki, dünyanın ilkidir, ilki;
Ulduzlar sayrışır fəzalarımda?

Əcəb, sizmisiniz böylə oynayan,
Yoxsa göy üzündə qartallarımdır?
Yoxsa ürəyimdə coşan, qaynayan
Şirin arzularım, xəyallarımdır?

## YAĞIŞ YAĞARKƏN

Yağış yağır, rəqs eyləyir gur damlalar,
Sıra-sıra, inci-inci nur damlalar.
Göydə iki qara bulud çatılaraq,
İldırımlar şaqqıldayır şaraq-şaraq.
Quşlar uçur yuvasına pırıl-pırıl,
Şırıldayır navalçalar şırıl-şırıl.

Çaxnaşmada göy üzündə ildırımlar,
Bir-birinə dəydi, baxın, qaldırımlar.
Dönmələrdə durana bax, qaçana bax!
Qaldırımda o balaca oğlana bax!
Öz döşündən yeni sözlər toxuyaraq,
Ayağını şappıldadır oxuyaraq.
Gülə-gülə bir qız qaçır o səkidən,
Ürəkciyi xali deyil səksəkidən,
Yanında bir gənc də qaçır,
Yağış yağır, onu açır.
Ey gənc, durma, qoltuqlamaq zamanıdır,
Təbiətin ən şux, çaqraq zamanıdır.
Yağ, yağışım, yağ sel ol, yağ!
Sırma-sırma, tel-tel ol, yağ!
Çözül, sən ki kölgəli bir yar saçısan,
Bağrıyanıq səhraların əlacısan.
Yağ, yağışım, sellənərək,
Sırmalanıb tellənərək!
Zümzümənlə şirin-şirin dillən, yağış.
Küçələrdə uşaq kimi vellən, yağış!
Bunlar keçər, çarpın, səma, köksüm kimi,
Ey ildırım, səs ver mənə, səsim kimi!
Yağ, ey yağış, fikrim kimi, hissim kimi,
Uzaq, yaxın çöllərə yağ,
Ölkələrə, ellərə yağ!
Yağış yağır, rəqs eyləyir gur damlalar,
Sıra-sıra, inci-inci nur damlalar.

## DƏVƏT

Bu gecə nə qədər xoş gecədir,
Bir qara qız kimi tellicədir.
Yer işıq, göy ılıq,
Hər tərəf yaraşıq.
Sevgilim, dayanma, sahilə gəl,
Seyr elə gəl.

Ulduzlar ətrafa nur səpələr,
Bir bölük uşaqlır şən ləpələr.
Onların əlində top kimi ay,
Sevgilim, başında ağ kəlağay
Sahilə gəl,
Seyr elə gəl.
Bu fürsət əlinə düşməz bəlkə də,
Hər tərəf kölgədə,
Kölgədə işıldar.
Yarpaqlar xışıldar.
Gəl, ipək saçını oxşayım,
Səninlə bir an da yaşayım
Zövqünü illərin,
Dağınıq tellərin
Tökülsün üzümə,
Qulaq as sözümə.
Bu gecə nə qədər xoş gecədir,
Bir qara qız kimi tellicədir.
Yer işıq, göy işıq,
Hər tərəf yaraşıq.
Nəşələr sığmayır aləmə,
O yanda bir gülüş, bu yanda bir nəğmə,
Hər xəyal bir canlı qanatdır.
Bunların cümləsi həyatdır!

## ŞİRİN QIZ

Zərif ayaqların nə qədər incə,
Gözəl əndamını onlar xəfifcə
Necə aparmada bilməm, şirin qız?

Şikayətim vardır gül əllərindən,
Onlar ürəyimi tutub dərindən
Necə qoparmada bilməm, şirin qız?

Sənin mərhəmətli, dolğun gözlərin
Mənim hisslərimi məndən də dərin
Necə anlamada bilməm, şirin qız?

Ölmüş hisslərimi gözəl rəftarın,
Ruzgarlı, dalğalı sallanışların
Necə canlatmada bilməm, şirin qız?

Üfüqdə günəşi necə saraltdı,
Lalənin köksünü necə qaraltdı
Yanıl yanaqların bilməm, şirin qız?

Mən bir çayır quşu, sən bir neylufər,
Mənim öpüşümü necə rədd edər
Gözəl dodaqların bilməm, şirin qız?

## BİR GÜNƏŞ, BİR BAXIŞ

Hər tərəfdə sovuq, hər tərəfdə qar,
Yığılmış çillənin can boğazına.
Axşamkı fırtına, axşamkı ruzgar
Düşmüş nağıl kimi xalqın ağzına.

Hər şey susqun kimi, hər şey lal kimi,
Budur, sevdiyimiz yaz yaxındadır,
Yaşıl mənzərələr bir xəyal kimi
İndidən gözümün qabağındadır.

Toxunub qarlara günəşin əli,
Çağlarkən bir sabah sular nəşəli,
Qopdu hər tərəfdən yaza alqışlar.

Sən də atsan mənə isti bir baxış,
Əriyib qəlbimdə bu hicran, bu qış
Sənə dəmət-dəmət güllər bağışlar.

## SABİR ÜÇÜN

Neyləyim ki, fikrim kimi qəşəng olsun nəğmələrim?
Parlaq bahar səmasilə həmrəng olsun nəğmələrim?
Sevinclərlə uğuldayan bir zəng olsun nəğmələrim?
Bir işıqlı, bir ətirli çələng olsun nəğmələrim?

Hey o qədər nəğmə var ki: qüvvətdənmi oxuyalım?
İşdən, gücdən, cəsarətdən, sürətdənmi oxuyalım?
Yoxsa keçmiş rəzalətdən, dəhşətdənmi oxuyalım?
Nurumuzun dağıtdığı zülmətdənmi oxuyalım?

Sən heybətli, cəhənnəmli dövürləri gördün, Sabir!
İşçilərə yağdırılan təhqirləri gördün, Sabir!
Kəndlilərin boynundakı zəncirləri gördün, Sabir!
Ürəyinin sapı nazik fəqirləri gördün, Sabir!

Hər cahangir qabağına vurub qatdı xalqımızı,
Zaman-zaman quduz çarlar qırıb çatdı xalqımızı,
Müsavatla daşnaq gəldi, alıb-satdı xalqımızı,
Həpsi qırıq kaman kimi sızıldatdı xalqımızı.

Zaman-zaman bir div kimi köksümüzə çökdü onlar,
Yurdumuzu, yuvamızı viran qoyub sökdü onlar.
Tufan kimi bağçamızın meyvəsini tökdü onlar,
Boynumuzda bir çəkilməz, bir əzablı yükdü onlar.

Həyat kimi yaz onların, ölüm kimi xəzan bizim,
Nəğmə, oyun onlarındı, matəm bizim, fəğan bizim.
Kaşanələr ağaların, qazma bizim, viran bizim,
Eyş onların, nuş onların, zəhər bizim, qətran bizim.

Məzarlıqdan qalxıb, Sabir, indi azad ellərə bax!
Al günəşin qoynundakı bu işıqlı səhərə bax!
Yaşıllıqlar qucağında nəfəs alan çöllərə bax!
Bizə həyat, bizə şadlıq bəxş eyləyən rəhbərə bax!

Qalx məzardan, ölkəmizin dağını gör, düzünü gör!
Yeni-yeni aşıqların sazını gör, sözünü gör!
Azərbaycan qızlarının parlaq açıq üzünü gör!
Həm bu günün, həm sabahın uzaq görən gözünü gör!

Bircə bizim Bəstiyə bax, ah, bu qadın nə qoçaqdır!
Topladığı pambıq kimi alnı açıq, üzü ağdır.
Hələ Leyla... daha yüksək fəzalara uçacaqdır,
Manya Vətən sərhədində dalğalanan bir bayraqdır.

Seyr et bizim Mil düzünü, ellik olan Muğanı gör!
Torpaqları köksüm kimi nəfəs alan aranı gör!
Qarabağda, xas Qubada bağa girib, bağbanı gör!
Bu yerlərdə insan kimi həyat sürən insanı gör!

Səndən sonra min xanəndə, min sazəndə üzə çıxdı,
Ölkəmizin ceyranları dəstə-dəstə düzə çıxdı.
Yağdı yağış, zümrüd otlar çəmənlərdə dizə çıxdı,
Bülbül ötdü, gül açıldı, dodağında məzə çıxdı.

Yeni-yeni söhbətimiz, yeni-yeni sazımız var,
Yaşayırıq qardaş kimi, kitabımız, yazımız var,
Sakit, şirin əməyimiz, xəyalımız, arzumuz var,
Keyfimiz var, ruhumuz var, sevgimiz var, nazımız var!

Kəndlilərin otağında yanır sülhün çıraqları,
Seyr edəlim gülə-gülə yaxınları, iraqları.
Qardaşlığın bağçasıdır bizim sovet torpaqları,
Yallı gedir ağacları, çəpik çalır yarpaqları.

Su üzündə gəmimiz var, göy üzündə tərlanımız,
Yer üzündə nərə çəkər qoşun-qoşun arslanımız.
Çox böyükdür dövranımız, çox genişdir meydanımız,
Şənliyimiz, taleyimiz, azad olan vicdanımız.

Alqış sənin məzarına bu qardaşlıq dünyasından!
Bu qardaşlıq dünyasının qayğısından, sevdasından!
Fikrimizin, hissimizin çiçəklənən tarlasından!
Hər qafqazlı bəstəkarın beynəlmiləl havasından!

## YENƏ O BAĞ OLAYDI!

Yenə o bağ olaydı, yenə yığışaraq siz
O bağa köçəydiniz.
Biz də muradımızca fələkdən kam alaydıq,
Sizə qonşu olaydıq.

Yenə o bağ olaydı, səni tez-tez görəydim,
Qələmə söz verəydim,
Hər gün bir yeni nəğmə, hər gün bir yeni ilham...
Yazaydım səhər-axşam.
Arzuya bax, sevgilim, tellərindən incəmi?
Söylə, ürəyincəmi?

Yenə o bağ olaydı, yenə sizə gələydik,
Danışaydıq, güləydik.
Ürkək baxışlarınla ruhumu dindirəydin,
Məni sevindirəydin.
Gizli söhbət açaydıq ruhun ehtiyacından,
Qardaşından, bacından
Çəkinərək çox zaman söhbəti dəyişəydin,
Mənimlə əyişəydin.
Yenə də bir vuraydı qəlbimiz gizli-gizli,
Sən ey əsmər bənizli!

Bu yaz bir başqa yazdır, bu yaz daha da xoşdur,
Vay o qəlbə ki, boşdur!
Hər üfüqdə bir həvəs, hər bucaqda bir umud,
İnsanlar daha məsud,
Duyğular daha incə, fikirlər daha dərin,
Ürəklər daha sərin.
İnsanların vüqarı, tələbi daha yüksək.
Yolumuzdan daş-kəsək
Təmizlənmiş bir az da. Ellərin keyfi sazdır,
Bu yaz bir başqa yazdır!

Yenə o bağ olaydı, yenə o qumlu sahil,
Sular ötəydi dil-dil.
Saçın kimi qıvrılan dalğalara dalaydım,
Dalıb ilham alaydım.
Əndamını həvəslə qucaqlarkən dalğalar,
Qəlbimdə qasırğalar,
Fırtınalar coşaydı, qısqanclıqlar doğaydı,
Məni hirsim boğaydı;

Cumub alaydım səni dalğaların əlindən,
Yapışaydım belindən,
Xəyalımız üzəydi sevda dənizlərində,
Ləpələr üzərində,
İlhamımın yelkəni zərrin saçın olaydı,
Sular xırçın olaydı.

Bu nə gözəl şeirdir, bu nə gözəl mənzərə,
Gəlin, baxın Xəzərə.
Çıxalım Buzovnada kiçik qayalıqlara,
Seyr edəlim bir ara...
Gecələr sayrışarkən ulduzlar lalə kimi,
İşıqlar jalə kimi
Çilənib dağılarkən ətrafa damla-damla,
Ən yaxın bir adamla
Nə gözəldir dinləmək suların nəğməsini,
Təbiətin səsini!
Nə gözəldir dolaşmaq isti yay fəsilləri
Bu sərin sahilləri!

Nə gözəldir səhərlər bizim böyük ruhumuz,
Aşıb-daşan duyğumuz,
Şəklindəki sulardan baxaraq ləzzət almaq,
Bu mavi şerə dalmaq,
Dalğalar kimi qalxmaq, dalğalar kimi enmək,
Bəzən hürküb çəkinmək.
Hər dalğa bir kişnəyən bəyaz yallı at kimi,
Bizim bu həyat kimi!

Yenə o bağ olaydı sevdalar ölkəsində,
O söyüd kölgəsində,
İnci qumlar üstündə yenə verib baş-başa,
Yayı vuraydıq başa.
Günlərimiz keçəydi qızğın fərəhlər kimi,
Dolu qədəhlər kimi;
Yarpaqlar arasından uzadaraq əlini,
Oxşayaraq telini,

Gecələr darayaydı saçlarını, ay gözəl!
Sən gözəlsən, ay gözəl?
Əllərində əllərim, gözlərində gözlərim...
Asılaydı sözlərim
Könlünün qulağından bir qızıl tana kimi,
Günəş doğana kimi.

Bu yaz dostlarım bir az bəxtəvər olacaqlar,
Can-ciyər olacaqlar.
Bir az da uzaqlara açacaqlar yelkəni,
Ruh yeni, həyat yeni...
Çıxacaqlar – göyləri aşaraq dönə-dönə –
Buludların fövqünə.
Uçacaqlar sabaha, uçacaqlar yarına,
Efir boşluqlarına.
Vaxtilə bir kölgə tək hür yaşamaq istəyən
Bu insan oğlu bilsən
Azadlıq ölkəsində daha şad olacaqdır,
Dünya dad alacaqdır.

Yenə o bağ olaydı, yenə yığışaraq siz
O bağa köçəydiniz.
Biz də muradımızca fələkdən kam alaydıq,
Sizə qonşu olaydıq.
Yenə o bağ olaydı, səni tez-tez görəydim;
Qələmə söz verəydim.
Hər gün bir yeni nəğmə, hər gün bir yeni ilham...
Yazaydım səhər-axşam.
Arzuya bax, sevgilim, tellərindən incəmi?
Söylə, ürəyincəmi?

## ÇAĞLAYAN

Sən uca bir dağın göy gözlərindən
Sevincdən tökülən gur yaşlar kimi –
Axdıqca, ürəyim qopur yerindən,
Uçunur bədənim bir ruzgar kimi.

Ey böyük çağlayan, ey təmiz ürək,
Yoxmu aramızda bir könül bağı?
Səsinə səs verən bəstəkar gərək,
Ey qüvvət qaynağı, işıq qaynağı!

Sən də şəlaləsən, təbim yerində,
Ürəklər, beyinlər, ruhlar çağıldar
Sənin də ölməyən nəğmələrində.

Fikirlər torpağı, hisslər torpağı
Sənin seylabınla çiçəklər açar,
Ey həvəs qaynağı, nəğmə qaynağı!

## YEDDİ AŞIQ

Onlar yeddi aşıqdı,
Ellərə yaraşıqdı.
Hamısının telli sazı,
İldırımdan avazı,
Fikirləri nur kimi,
Sözləri yağmur kimi,
Çıxmışlar bərkdən, boşdan,
Olmamışdan, olmuşdan
Yaxşı xəbərdardılar,
Kamil sənətkardılar.

Budur, mənim ərənlərim,
Çox gəzib, çox görənlərim,
Bayram günü, bir şənlikdə,
Bir səfalı çəmənlikdə
Sıra vurmuş, oturmuşlar.
İçlərindən ən ixtiyar,
Bir ağsaqqal ərən qalxdı.
Bulud keçdi, şimşək çaxdı
O qalxarkən bu məclisdən,
Qopdu alqış alqış üstdən.

Xitab etdi qoca ərən:
– Dostlar! – dedi, – çərən-pərən
Söhbətlərin vaxtı keçdi;
Ağır günlər axdı, keçdi.
Biz ruhların fəzasına,
Könüllərin dəryasına
Dalıb, dalıb tapmalıyız
Yeni inci, yeni ulduz.
İndi saya vadilərdən
Külək kimi əsməliyiz.
Yeni yollar kəsməliyiz.
Aranızda varsa yayan,
Dənliyində söz olmayan
Xəcalət verməsin bizə,
Girişməsin bu məclisə.
Məclis başqa bir məclisdir,
Hamı həkim, mühəndisdir
Öz işində, öz gücündə.
Əziz dostlar, bu şad gündə
Bayağı söz oxumayın!
Alçaq qumaş toxumayın! –

Deyib qoca aşıq oturdu. Sıradan ilk dəfə orta yaşlı biri çıxdı. Üzünü məclisə tutub dedi:

– Mənim nəğməm alnımızın qırışlarından tər kimi sızar, həyat bağçamızın arxlarından sərin sular kimi axar, sərhədsiz, azad torpaqlarımızda azad əməyin nəğməsini oxumaq mənə nəsib oldu. Bu bizim əzəliyyət və ədəbiyyət mahnımızdır. İnsanı insan mərtəbəsinə çıxaran da odur. Vaxtilə göz yaşlarımızı andıran sular, dərdimiz kimi qat-qat torpaqlar artıq öz əlimizdədir. Atalarımız becərdikləri bağçalara hasar söküklərindən həsrətlə baxardılar. İndi bu bağçaların bağbanı da, sahibi də bizik. Hər kəs öz əmək baharından istədiyi feyzi aparsın. Bizdə ancaq işləməyən dişləməz! Xoşdur təzə bir çiçəkdən gülab çəkər kimi dirilikdən kam almaq! Arzularımızın torpaqlarına gülə-gülə saçdığımız həvəs toxumlarının meyvəsini dadmaq ləzzətlərin ləzzətidir!

Sonra sazını döşünə sıxdı, oxumağa başladı:

Ellər, gəlin iş görəlim
Siz bir yandan, biz bir yandan.
Ömrümüzü xoş sürəlim
Siz bir yandan, biz bir yandan.

Məhəbbətlə sarışalım,
Ayla, günlə yarışalım,
Ulduzlara qarışalım
Siz bir yandan, biz bir yandan.

Azad əmək, azad torpaq,
Qəlbimizdə sevgi, maraq,
Əl çalalım şaraq-şaraq
Siz bir yandan, biz bir yandan.

Yeddilərdən ikincisi meydana atıldı. Yarışa çıxmış kimi, ətvarında bir dirilik sezilirdi. Bir o başa, bir bu başa getdi; baxalım nə dedi:

– Mən gəlib keçən nəsillərin eşitmədiyi bir nəğməni tərənnüm edəcəyim. Bu nəğməni keçmişin yazıq oğulları oxumaq istədi, ancaq yapılmış sazların pərdələri buna kafi gəlmədi. Mənim nəğməm istirahət üçündür. Qəlb qəlbliyilə vurmasa mümkün deyil, bir vurub ikinciyə keçərkən arada bir nəfəs alır. Külək küləkliyilə ətrafı sarsıdıb keçdimi, havaya ani bir sükut çökmüş olur. Buludlar oynar, göylər gurlar, şimşəklər çaxar, yağmur yağar, sel olar. Sonra göylər əmin bir çöhrə kimi gülümsər. Dəniz şahin qanadlarını qaldırıb qayalara çarpar, tufan keçər, dalğalar susunca, həmən dəniz anasının qoynunda süd əmə-əmə uyuyan bir yavruya dönər. Bəs insan! Onun istirahəti? Yeddi saat iş... sonra klub... Fikir açan siyasi dərs... çalğı, oyun, rəqs!.. Ruhun tuğyanı! Budur mənim nəğməm! Mənim dəzgah yoldaşım bu saat istirahət evindədir. O indi güllü, sarmaşıqlı bir eyvanda, könlünün gözünə sükunət pəncərələri açılmış bir təbiət parçasını seyr etməkdə. Dimağına istirahət gülşəninin ətri saçılır. O, bəlkə də sərin kölgələr kimi bir ağac altına sərilmişdir; lakin günəşlə həmsayədir. O, sovet dövrünün rahat insanıdır.

Sonra sazını aldı, tərənnümə başladı:

Açılsın gönlümüz ilk bahar kimi,
Yanaqlar qızarsın güllər içində.
Axalım gülşənə irmaqlar kimi,
Səsimiz gurlasın sellər içində.

Yamandır insanın tez qocalması,
Düşüb yol daşı tək yolda qalması,
Erkən bir ürəyin vərəm alması
Bir də görünməsin ellər içində.

Ömür uzun olsun bizim diyarda,
Kimsə kimsənədən qalmasın arda,

İnsanların günü qışda, baharda
Keçsin şirin-şirin dillər içində.

Üçüncü. Gənc bir aşıqdı. Sazı vardı, sözü də... Ayağa qalxıb, xitab etdi:

– Mənim nəğməmdən çoxları dəm vurmuşdur. Elmə həyat, cəhlə ölüm, ölümə varlıq, cəhlə yoxluq demişlər. Ancaq bu sözlər bir ovuc insan ağalarına məxsusdu. Biz, babaların nəsihətlərini hər kəsə dinlətməyə gəldik. Biz təhsilin, günəşin qapılarını insan yavrularına fərq qoymadan açdıq. Onlar onsuz da fərqsizdirlər. Biz mədəniyyətdən qorxub ona düşmən kəsilmədik. Elektrik sürətini buraxıb, maviliklərə sürdüyümüz motorların sükanından əl çəkib də, tənbəl karvan yollarına qayıtmaqmı olur?! Biz elmin həm içinə, həm qabığına malikiz, çünki quş bir qanadla uça bilməz. Qarşıda uca dağlar var. Mehriban dostları ayrı salan əngin dənizlər maviləşir. Qarşıda qara yerin sarsıntıları gözlənilir. Bu çətinlikləri həllə mədəniyyət gərək, mədəniyyət! Mədəni bir kütlənin boynuna minmək olmaz! – deyib saza söz verdi.

Mehriban ellərim, dinləyin məni:
Hələ bu diyarda çox işimiz var!
Məhsul toplamağa, çiçək dərməyə
Xəzanda, baharda çox işimiz var!

Hələ bu yerləri sürəcəyik biz,
Hələ gözəl günlər görəcəyik biz,
Dalğalara köküs gərəcəyik biz,
Çıxınca, kənarda çox işimiz var!

Təbiət olmasın çox əngəl bizə,
Buludlar, dalğalar versin əl bizə,
Bizdə qonaqlıqdır, günəş, gəl bizə,
Qaranlıq yollarda çox işimiz var!

Dördüncü aşıq qalxdı. Məclisdə oturmuş öz arvadına üzünü tutub xitab etdi:

– Sən anasan, sən qadınsan, sən bu insan sellərinin qaynağısan. Taxtın var, beşiyin var. Evin var, eşiyin var. Nə mələksən, nə pəri. Mən səni sevərək aldım, sən mənə sevərək gəldin. Sevişdik, güldük, ağladıq. Camalın gözlərimdə su kənarındakı bir çəmən kimi gülümsədi. Keçən iclasların birində bir qadın belə demişdi:

«Ayaqlara toz, ağızlara söz olduğumuz günlər getdi. Ərlərlə hüququmuz var. Təlimdə birik, əyləncədə birik, cəbhədə də bir olacağıq! Bizə bu hüququ verən Oktyabra alqış! Bizim ərlərimizi, çocuqlarımızı, qızlarımızı səfalət çamurlarından çıxarıb sülhün, qardaşlığın büllur sularında yıxayan, onların qey-

dinə qalan, bəşər nəslinin uzanmasına – əbədiyyətinə qanun verən insanlar üçün ana qəlbimizin döyüntüləri milyon-milyon əllərdən qopan alqış səslərinə dönsün!».

Sonra sazını köksünə sıxdı, baxalım nə dedi:

Sən mənim cananım, şirin canımsan,
Ətirli bağçamda bar səni gözlər!
Elimsən, günümsən, mehribanımsan,
Qızğın məclisimdə tar səni gözlər!

Qarşında səfalı beşiyin sənin,
Deyirsən: «Yat, çəkim keşiyin sənin!»
Cənnətmidir evin-eşiyin sənin?
Dövlət əlindədir, var səni gözlər!

Yıxıqlar əlinlə gülüstan olur,
Can cahana dönür, cahan can olur,
Bütün qaranlıqlar çırağban olur,
Ellərin şənliyi, yar, səni gözlər!

Yeddilərdən beşincisi qalxdı. Məclisə qürurla baxıb dedi:

– Nəğmələr içində mənim nəğməmin ayrı bir yeri var. Mən toxunulmaz hüququmun nəğməkarıyam. Bir fərd, bir cəmiyyət nə qədər yüksəlirsə-yüksəlsin, hüquqsuz yenə heçdir. Başı sərkili, üzü danlaqlı, qəlbi səksəkəli əməl yollarında yorğun düşən, əli istəyinə irişməyən əcdadımızın göylərdən asılı iradəsini acı-acı bir düşünəlim. Biz ümid qapılarını asanlıqla keçdik. Azad əməllərinə, azad əməyinə yetən bizim nəsil nə bəxtəvərdir! Təhəkkümün, zəncirin, təhqirin hüdudu bizim torpaqların sərhədinə gələndə bitər. Qarayammı, ağammı? Fərqində deyiləm. Qarlı bir dağam mən. Qaynar bir bulağam mən. Varlı budağam mən. Qoltuğa sığınmaq da bir şey deyil. Böyük bir palıdın həşəmətli budaqları altında bir çiçək fırtınalardan, boranlardan nə qədər qorunsa da, yenə günəşsizlikdən sarı, solğun qalır. Vay o fərdə ki, asılıdır! Vay o kütləyə ki, məhkumdur. Mən arzularımın hovuzu kənarında durub məqsədimin surətini dərin bir heyranlıqla müşahidə edirəm.

Sonra sazını aldı, bir-iki ağız dedi:

Mənim ixtiyarım öz əlimdədir,
Ömrü çarpaşıqlı bir insanam mən!
Könül otağının pəncərələri
Güllü, sarmaşıqlı bir insanam mən!

Gəldi yaz ayları, sayrıldı güllər,
Başladı pərvaza tərlan könüllər,
Dolaşdığı ellər, gəzdiyi çöllər
Yarlı-yaraşıqlı bir insanam mən!

Təzə əməllərim ilk bahar kimi,
Ömrüm gəlib keçməz bir ruzgar kimi,
Xəyalım göylərdə buludlar kimi,
Yolları işıqlı bir insanam mən!

Söz altıncı ərənə gəldi. Görək bu nə dedi:

– «Çox bil, az danış». «Adamın dili öz başına bəladır!» – deyən əsir babaların bu nəsihətləri nə qədər acıdır! Mənim nəğməm sözü əsarətdən, məhkumluqdan çıxarıb azad etmək üçündür. O sözlər, vicdanlarda casus qulaqlarının şəkləndiyi dövrlərin məhsuludur. Nə mey şişədə, nə gül qönçədə, nə söz ürəkdə qalar. Bunu bir şair demişdir. Mey içilər, qönçə öz əsrarını rəngilə izhar edər. Söz də qanadlı bir quşdur. Yuvası təmiz bir ürək, açır bir yuva... yaşadığımız bu inqilab dünyası mərd oğulların dünyasıdır. Bu dünyada kütlələrə səadət müjdəsi verən hər söz azaddır.

Sonra tərənnümə başladı:

Mənim də sözlərim bir-bir yazılmış
Sinə dəftərimin varaqlarında.
Sənin qoxladığın ətir gizlidir
Qızıl çiçəklərin yarpaqlarında.

Gözəldir insanın öz azadlığı,
Yüksəltdik hər yerdə biz azadlığı;
Qələm azadlığı, söz azadlığı,
Doğrulmuşdur sovet torpaqlarında.

Hər irmaq çağlasın bir könül kimi,
Hər ürək açılsın qızılgül kimi,
Hər şair oxusun bir bülbül kimi
Azad fikirlərin budaqlarında.

Ən son, qoca aşıq meydana atıldı. Çöhrəsində narın təbəssümlər bəlirdi. Üzünü məclisə və şagirdlərinə tutub dedi ki:

– Hamınızın sözü doğru! Hamınız haqlısınız. Əmək, təhsil, istirahət, ana, çocuq, azad söz... Bunları kim istəməz? Ancaq kədərlə səfa, faşizmlə sosializm kimi iki zidd parçaya bölünmüş dünyada bir əmniyyət varsa, o da tərən-

nüm etdiklərimizi qorumaqdır. Sosializm ölkəsinin sosialist əsaslarına əməl etmək – sərhədləri bərkitməkdədir. Havalar getdikcə qarışır, göylər bir-birinə dəyəcək... dolu yağacaq. Müdafiə... ilk və son borcumuzdur! Bu olmasa, əməyimiz heçə gedər, təhsilimiz yarımçıq qalar, istirahətimiz pozular, anaların laylası ağıya dönər, qara ölüm üstümüzə qanad gərər. Bundan sonra nə azad söz, nə hüquq! Biz sərhədlərdə sıralanıb dilbər vətənimizi vüsal qucağına polad bir hasar kimi almalıyıq.

Sonra tavar sazını döşünə sıxdı, baxaq nə dedi:

Hərb olursa, külək kimi
Qalxar bizim qəhrəmanlar!
Qaranlıqda şimşək kimi
Çaxar bizim qəhrəmanlar!

Sərhədində sayıq durar,
Bir möhtəşəm qurğu qurar,
Çətinlikdən həmən vurar,
Çıxar bizim qəhrəmanlar!

Hər birimiz bir qasırğa,
Dağılmışıq ortalığa,
Hər dərədən dalğa-dalğa
Axar bizim qəhrəmanlar!

Aşıqlar sözlərini bitirdilər. O günkü şənlik qiyamət keçdi. Hamı onlardan məmnun qaldı. Sazlarını qollarına vurub Azərbaycanın başqa dağlarına çəkildilər.

## TƏZƏ EV

*Gənc kolxozçu qardaşlarıma ithaf*

Usta bir ev tikirdi, gözəl işdi gördüyü,
Sanki bir cift qaranquş yuvasıydı hördüyü.

– Can usta, mən bir çəlik yay kimi qurulmuşam,
Urəkdən ahu gözlü bir qıza vurulmuşam.
Həm gözəl, həm yeyin tik ruhumun məvasını,
Əldən-ayaqdan düşən qəlbimin sevdasını.

Qəlbimin dünya qədər şirin arzularını,
Günəş fikirlərini, bahar duyğularını
Qəşəng, ağ otağımda uyutmaq istəyirəm,
Həsrətimi, şövqümü ovutmaq istəyirəm.

Usta bir ev tikirdi, gözəl işdi gördüyü,
Sanki bir cift qaranquş yuvasıydı hördüyü.

– Can usta, mahir usta, gərək işin iş olsun;
Çırağban göylər kimi eyvanım geniş olsun;
Uzaqlaşsın xəyalım qaranlıqdan, vərəmdən,
Ay batsın pəncərəmdə, gün doğsun pəncərəmdən;
İşıq gülsün, oynasın evimdə ruhum kimi,
Gələcək lalə üzlü, nur topu yavrum kimi.

Usta bir ev tikirdi, gözəl işdi gördüyü,
Sanki bir cift qaranquş yuvasıydı hördüyü.

– Can usta, axı mənim böyük bir niyyətim var,
Mənim həyat qurmağa qəlbim var, qüdrətim var.
Can usta, qurtarsana ruhumun məvasını,
Uyutmaq istəyirəm qəlbimin sevdasını!
Həyətimdə səfalı bir bağ salacağam mən,
Yurdumda bir misilsiz bağban olacağam mən.
Çiçəklərlə, quşlarla dolacaq bağım mənim,
Daşacaqdır həyatla əlvan otağım mənim.
Ömrümüz həmişəlik bir bahar qucağında,
Günəşin təbəssümü yarımın dodağında...

Usta bir ev tikirdi, gözəl işdi gördüyü,
Sanki bir cift qaranquş yuvasıydı hördüyü.

## KÜSMƏRƏM!

Mən şirin ləhcəli bir bülbüləm ki,
Güllərdən küsərəm, səndən küsmərəm!
Məni öz canından artıq istəyən
Ellərdən küsərəm, səndən küsmərəm!

Gözlərin misaldır axan çaylardan
Kirpiyin oxlardan, qaşın yaylardan.
Qarşımıza gələn uzun aylardan,
İllərdən küsərəm, səndən küsmərəm!

El içində bizə derlər Sayadlı,
Tərlan ovçusuyam, ruhum qanadlı.
İlham pərisinin açdığı dadlı
Dillərdən küsərəm, səndən küsmərəm!

## YAŞA KÖNÜL!

Ah, bu uzun sevda yolu
Vurulurmu başa, könül!
Nişan aldım, kaman atdım,
Dəydi oxum daşa, könül!

Bir od düşdü buluduna,
Yandı könül eşq oduna,
Qaldın hicran umuduna,
Ey qırılan şişə könül!

Tərlansan, göydən enməzsən,
Bu torpaqda sevinməzsən,
Mən dönərəm, sən dönməzsən,
Yaşa, könül, yaşa, könül!

## QURBAN OLDUĞUM

Bilməm məni neçin atmış, unutmuş,
Cövrü cəfasına qurban olduğum?
Yoxsa özgəsinə üzünü tutmuş
Yeni sevdasına qurban olduğum?

Dilbəri sordum gəlib-gedəndən;
Dedilər barışmaz, küsmüşdür səndən.
Mən iltifat etdim, o qaçdı məndən,
Qasqın ədasına qurban olduğum?

O mənim sevgilim, o mənim anam,
Onsuz üzüm gülməz, açılmaz aynam...
Bilməm harda qaldı o nazlı durnam,
O xoş sədasına qurban olduğum?

Ayrılıq oduna könül dayanmaz,
Eşq oduna yanan bir daha yanmaz,
Çəkdiyim nalədən neçin oyanmaz
Şirin röyasına qurban olduğum?

## MARAL

Dolaşma sıldırım sal qayalıqda,
Daşlar ayağını əzər, maralım!
Gəl səni bəsləyim gözümün üstdə,
Etmə aşiqindən həzər, maralım!

Diksinə-diksinə qıya baxanda,
Səksənmə könlümü oda yaxanda,
Çeşmeyi-çeşmindən nurlar axanda.
Qaynar bulaqlara bənzər, maralım!

Səyyarə tutmuşdur hüsnündən soraq,
Bədnəzər gözündən olasan iraq!
Köksümdə gəl gizlən, getmə çox uzaq,
Hicran dağlarını gəzər, maralım!

## MƏHƏBBƏT

Mən ki bilməz idim nədir məhəbbət,
Bu sirri sən mənə anlatmadınmı?
Dünyaya sığmayan şair könlümü
Köksümdən çıxarıb oynatmadınmı?

Mən ki nəğmə deyib bənövşələrdən
Peşəm zövq almaqdı bir şux dilbərdən,
Məndən uzaq gəzib, dolanıb hərdən,
Qəlbimi sıxmağa can atmadınmı?!

Min hicran könlümü alanda ələ,
Zərrəcə halıma yanmadın belə.
Müşfiqin qəlbini tez alıb ələ
Onu röyalardan oyatmadınmı?!

## ÜRƏK

Sən onun eşqilə, məhəbbətilə
Vurmadın ömrünü başa, ürəyim.
Sevgi hədəfinə nişan alanda
Dəydimi oxların daşa, ürəyim?!

Sevgi dəryasında ruhum bir ada,
Fırtınam ziyada, dalğam ziyada,
O ellər gözəli düşəndə yada,
Az qalır xəyalım şaşa, ürəyim!

Sən canı canandan ayrı tutmadın,
Odur ki, vəfasız deyildir adın.
O səni unutdu, sən unutmadın,
Yaşa, məhəbbətim, yaşa, ürəyim!

## ONA

Könül oğurlayan bir adı vardır,
Mələk deyil, amma qanadı vardır.
Siyah qaşlarının kölgəliyində

Daima çırpınır iki göyərçin.
Qonaraq könlümün budaqlarına,
Hər gün şeir oxurlar onlar mənimçin
İndi öz-özümə inanmışam mən,
Nə qədər bəxtiyar insanmışam mən,
Saçları andırır zərrin suları,
Tökülüb axdıqca umuzlarına.
Oxşayır bədəni, bəyaz əndamı
Kölgədə bəslənmiş quzey qarına.
Amandır əsməsin tufan yelləri
Solar eşqimizin qönçə gülləri.

## BƏXTİYAR ODA

Ey altun şəfəqli bəxtiyar oda
De nurlu qoynunda sənin kim yaşar?
Ellər dolaşarkən açıq havada,
Səni Dilbərinmi nəfəsi oxşar?!
Nə olaydı bu dəm bir quş olaydım,
Sənin pəncərənə qonmuş olaydım.

Gözümü hüsnündən çəkə bilmirəm
De, niyə salmısan məni bu hala?!
Sənsiz sevinmirəm, sənsiz gülmürəm
Qəlbim elə coşur, derəm nə ola:
Dönüb divarında bir daş olaydım.
Əbədi səninlə sirdaş olaydım.

## SƏNİNÇÜN

O gün ki hicrana uğradı yolum,
Qırıldı qanadım, qırıldı qolum.
Fələkdən bac verib, bac alan könlüm
İndi uşaq kimi ağlar səninçün.

Gül gülü çağırır, çiçək çiçəyi,
Gülər aşiqlərin qönçə diləyi.
Sən neçin yıxırsan bu şux ürəyi?
Qəlbimin çeşməsi çağlar səninçün.

## SƏNƏ QURBAN

Deyirsən yanında qalacağam mən,
Çox gözəl fikirdir, qal sənə qurban.
Nə zaman istəsən əziz canımı
Qumral gözlərinlə al, sənə qurban.

Gəlmiş hüzuruna bir qara dağlı,
Bir qara qulundur, qolları bağlı,
Gəl çəkmə könlümə sən hicran dağı,
Gümüş topuğunda xal, sənə qurban.

## SEVİRƏM

Sevirəm
Bənövşə tək
Boynun bükərək
O məhzun duruşlarını.
Sevirəm
Mənimlə göz-gözə gələndə,
Şimşək baxışların vuruşlarını.
Sevirəm
Kirpik çala-çala
Məni süzərək
Bir mahir ovçudan qorxmuş, ürkərək
O ceyran ədalı baxışlarını.

## KİMİDİR

Sevgilim əyninə yaşıl geyinmiş,
Sallanışı sərvi-çəmən kimidir.
Bu bənzətmə bir az üzdən olsa da,
Tamaşa görkəmi səmən kimidir.

Nə arzu eyləsən, könlümdə vardır,
Eşqimin səhəri bir ilk bahardır.
Ona könül verən nə bəxtiyardır,
Fikrim-hissim təzə gülşən kimidir.

Müşfiqin ürəyi yarpaqdan incə,
Titrəyir bir xəfif ruzgar əsincə,
Məşuqun ayağı haraya dəysə,
Orası aşiqə vətən kimidir.

## İŞİDİR

Xeyir, hörüklərin deyildir ilan,
O əski şairlər söyləmiş yalan,
Məni xəyal kimi ayağa salan,
O coşqun dalğalı telin işidir.

Bunu yaxşı bilir tanış yolçular,
Nə sən günahkarsan, nə mən günahkar.
Bu ovçu könlümə verməyə qərar,
O zərif qamətin, belin işidir.

Müşfiqəm, sözümdə tapılmaz yalan,
Gözündür könlümü odlara salan,
Qəlbimi ovlayıb, canımı alan,
O bülbül nəğməli dilin işidir.

## QURBAN

Bu qədər baş vermə, səməndər, yaza,
Düşərsən ayağa, başına qurban.
Yazığam, ömrümü vermə güdaza,
Qəmzəli gözünə, qaşına qurban!

Bir qara buludam uca göylərdə,
Bu qara baxtımla bizim ellərdə
Sən neçin ağlarsan mən duran yerdə,
Nərgiz gözlərinin yaşına qurban?

Sinən billur kimi, altında daş var,
Bilməzsən könlümdə nə iğtişaş var,
Nə qədər ki, mənim gözümdə yaş var,
Olsun ürəyinin daşına qurban!

**DÜŞDÜ**

Çiçəklər aşiqi bir bülbül kimi,
Gözüm bir bağbanın gülünə düşdü.
Qəhrini çəkdiyim gülün surəti
Sakit xəyalımın gölünə düşdü.

Orda-burda keçdi gənclik həyatım,
Hər yerdən kəsildi rəhi-nicatım,
Gör nə bədbaxtam ki, axırda adım
Hər körpə uşağın dilinə düşdü.

Onunçün çırpındı qolum-qanadım,
Onu yerdə deyil, göydə aradım.
Gəncliyim, şərəfim, müqəddəratım
Bir ürkək ceyranın əlinə düşdü.

**SÖYLƏ**

Günlərim axışır bir uyqu kimi,
Dərədən dərəyə axan su kimi,
Dilbərim hərcayi bir ahu kimi
Hicran dağlarını aşarmı, söylə?

Sənsiz nə zövqü var bağın-baharın?
Açan çiçəklərin, uçan quşların?
Sənsiz cənnət olsa kainat yarın,
Heç mənim quhumu oxşarmı söylə?

Səninlə bağlayıb mən əhdi-peyman,
Dedim qismətimiz olmasın hicran.
Müşfiq quş olsa da, görəsən bir an
Səndən uzaqlara uçarmı, söylə?



## BULUD QARŞISINDA

Nə qaplamışsan göyü, sən ey bulud, xınca-xınc?!
Nədir ildırımında bu gurultu, bu çaxınc?!
Qaranlıqda sıyrılan hər şimşəyin bir qılınc.
Yetər, çaxma, ey bulut!
Mənə bir qədər sükut!

Həyəcan az deyildir onsuz da içərimdə,
Bu gənc fikirlərimdə, bu körpə hisslərimdə,
Səndən umacağım yox, dolaşıb üzərimdə
Yetər, çaxma, ey bulut!
Mənə bir qədər sükut!

Düşün, uzun qissədir bu gəncliyin qissəsi,
İstəməm gurultunu, mənim səsim mis səsi,
Nə bir qüvvət qayğısı, nə bir həyat qüssəsi.
Yetər, çaxma, ey bulut!
Mənə bir qədər sükut!

Dolaşma başucumda bir qara qüvvət kimi,
Aydın yoluma çıxma bir dərin zülmət kimi,
Güclüyəm, dəhşətliyəm mən əbədiyyət kimi.
Yetər, çaxma, ey bulut!
Mənə bir qədər sükut!

## QAFQAZ

Şərqdə bir çox fırtınalı boralar əsmiş,
Qoparmışlar keçdikləri yolda tozanaq.
Hər bora bir gic ürəkdən qopan həvəsmiş,
Bunlar üçün Qafqaz dəxi yapılmış oylaq.

Bu uğursuz boraları əsdirənləri
Ehtirasla qucaqlarkən mərmər sinələr,
Ac torpaqla yutmuş susuz can verənləri
O canavar ağızları qorxunc sənələr.

Gözəl Qafqaz o günləri artıq unutmuş,
Başqa səs var zurnasında, balabanında.
O üzünü indi başqa bir üfqə tutmuş,
Başqa quşlar dəm çəkiyor sayəbanında.

Azad Qafqaz xalqlarıyız biz, indi olmuş
Hər nitqimiz bir nəşəli şerə bərabər.
Araratdan əski qalın çənlər qovulmuş,
Gürcüstana "Zahes" nurdan çiçəklər sərpər.

Azərbaycan uğuldayan buruqlarilə
Ətrafına bir div kimi nərələr saçar.
Əməkçilər qüvvətilə, ixtiyarilə
İctimai cəmiyyətə hər gün yol açar.

Dinlə, Tiflis, keçmişini eyləyincə hiss
Gəmiriyor içərimi yırtıcı dişlər.
Tiflis, Tiflis, ey çiçəklər bəldəsi Tiflis,
Dilə gəlməz o səndəki ilərləyişlər.

Gürcü qızı, bir ruzgarın xülqi var səndə,
Küləklərin rəftarından doğdunmu nədir?!
Qaşlarının budaqları kölgəliyində
Könlüm kimi göyərçinlər nədən titrəyir?

Burax günəş, indi balıq şüalarilə
Damla-damla əriyərək batsın sularda.
Biz məhəbbət günəşinin parçalarilə
İsinəriz bu Qafqazda, bu şux diyarda.

Burax bizim qarşımızda diz çöksün, burax,
O başı dik, başı müzlüm dumanlı dağlar!
Qaynar-qaynar gözlərindən yaş töksün, burax,
Hər ruzgara kökus gərən amanlı dağlar!

## SƏN VƏ MƏN

Sənin xəndan olur gül dodaqların
Onda ki gözümdən yaşlar saçılır,
Çünki sayəsində gur bulaqların
Çiçəklər açılır, güllər açılır.

Üzün şəfəqlənir mən ah çəkincə,
Çünki od qızarar əsincə ruzgar.
Hər şeyin axırı heçdirsə, məncə,
Sənin gözəlliyin getdikcə artar.

Çevirib üzünü nərəyə dönsən,
Könlümün gözləri düşər ardına,
Çünki təbiətdən öyrənmişəm mən,
Günəbaxan baxar Günəş yurduna.

Qurumuş göz yaşım, o gül üzündən
Axar, daim axar, durmadan axar,
Sellər coşqun olur çünki, qəflətən
Doğunca gəncliyin fəsli ilk bahar.

## ÇOBAN

(*Əfsanə*)

Ey öz tarixinin memarı insan!
Çox zaman göylərə baxdın hərasan.
Həyatı şənlədən işini qoydun,
Bir əsilsiz, çürük taleyə uydun.
Şirin xəyalınla çoban xan oldu;
Xan qızı çobana nigəhban oldu.
Bu şirin xəyallar güldürdü səni,
Lakin həqiqətdə öldürdü səni.
Mənim eşitdiyim bu nağıl fəqət,
Anladır: duyduğun deyil həqiqət.
Həqiqət olsaydı, Çobanla Mərcan
Verməzdi dalğalar arasında can.

**1**

Çox əski bir zamanda,
Bizim Azərbaycanda,
Abşeron civarında,
Quzğunun kənarında
Varmış qədim bir şəhər,
Görünüşü birtəhər...
Çevrəsi dərə-təpə,
Evləri bir mərtəbə.
Küçələri dolambac,
Əhalisi yoxsul, ac.
Görünüşü birtəhər...
Səbayeldi bu şəhər...
Söylənilən şəhərdə,
Ən səfalı bir yerdə
Zümrüd qalaçalar var,
Ətirli bağçalar var.
Ağaclar sıra-sıra
Baş endirir sulara.
Yaxında bir geniş xır,
Sular şırhaşır axır.

Cırıldayır bağara,
Qurbağalar nağara
Çalır kimi səslənir.
Buna xan bağı denir.
Qırx otaqlı bir bina,
Hər əmələ aşina.
Fəvvarələr, hovuzlar,
Xoş yerişli tovuslar.
Eyvanlar sarmaşıqlı,
Divarlar yaraşıqlı.
Mərmərdir novalçası,
Saray "Çiçi" xalçası
Kimi işləmiş zərif.
Könül açan bu lətif,
Bu sevimli mənzərə
Səssiz baxır Xəzərə.

**2**

Baxın, burda kim yaşar:
Quş xan adlı hökmüdar.
Deyirlər ki, bu Quş xan,
Bu dili qurumuş xan,
Bir gün həmən sarayı
Tikən böyük ustayı
Qarşısında oturtmuş,
Üzünü ona tutmuş:
– Söylə, ey qoca memar,
Sənəti uca memar!
Sən bu saraydan gözəl,
Daha zəngin, mükəmməl
Bir iş də işlərmisən,
Yarada bilərmisən,
Bundan da gözəlini,
Daha mükəmməlini?

Tarixin baş memarı
Üz tutub xana sarı,

Başını qaldıraraq,
Ürəyi dolu maraq,
Gülə-gülə çöhrəsi,
Birdən gurlamış səsi:
– Mən bu sənət yolunda
Ömrümü fəda etdim.
İnsaniyyət yolunda
İşimi əda etdim.
Məsləkimi, dinimi
Sənətimi yeritdim.
Ürəyimi, beynimi
Bu uğurda əritdim.
Çalışdım için-için,
Gəncliyimi qocaltdım.
Xəyalımdan səninçin
Bir kaşanə ucaltdım.
Bax, bu lövhə nə zəngin!
Mənəm memari-əzəl.
Tanrının, irənlərin
Cənnət bağından gözəl.
Özümü oda vurdum,
Fikrim, hissim təlaşda.
Canlı ruhlar uçurdum,
Suda, torpaqda, daşda,
Mən ölüb getsəm belə,
Yaşayacaq sənətim;
Düşəcək dildən-dilə
Adım, sanım, şöhrətim.
Bundan da gözəlini,
Daha mükəmməlini
Yarada bilərəm, xan.
Nə yapsa yapar insan!

Paxıl, dar ürəkli xan
Darılmış bu cavabdan:
"Cəllad!.. vurun boynunu!"
Bir an içində onu,

O böyük sənətkarı
Qılınc bölmüş tən yarı.
– Öldü... günah özündə!..
Qırışıq üz-gözündə
Xanın qara dalğalar,
Ruhunda qasırğalar:
“Demək, bundan da gözəl,
Daha zəngin, mükəmməl
Bir saray tikəcəkdi,
Öz cəzasını çəkdi.
Memara bax, memara!..
Yarın ətraf xanlara
Saray tikərkən, demək,
Mənimkindən də yüksək
Görünəcəkmiş. Hay, hay...
Sana öylə bir saray
Tikdirəcəm mən də ki,
Bundan belə səndəki
Başarıq, hünər daha
Mana oturmaz baha.
Bir saray yer altında,
Yerin ən alt qatında
Yapılacaq bu saray.
Sana çox xoşdur, hay!.. hay!”

**3**

Quş xanın bir qızı var.
Bir könül xırsızı var.
Bu qızın adı Mərcan,
Hər baxışına bir can
Doğan gündən qurbandır.
Ölkə ona heyrandır.
Adı dillərdə əzbər,
Görülməmiş bu dilbər
Abşeron civarında,
Quzğunun kənarında.
Yaxın, uzaq ellərdən,

Hər tərəfdən, hər yerdən
Elçi gəlir bu qıza,
Bu mehriban ulduza.
Adlı-sanlı igidlər,
Dəliqanlı igidlər,
Tacir, bəy oğulları
Keçib uzun yolları,
Həpsi yorğun, dərbədər
Səbayelə gəlirlər.

Qoy kim gəlirsə gəlsin,
Qapılıb hissə, gəlsin.
Bu gəlişdən nə çıxar,
Ümidsiz qayıdarlar.
Xan dermiş elçilərə:
"Qızım yosma dilbərə
Eş olmaq istəyənlər,
Bircə sorğuma əgər
Düzgün cavab taparsa,
Sahib olacaq qıza:
Siz, ey gələn yolçular!
Qızın neçə xalı var?"

Kim bilsin bu mələyin,
Bu açmamış çiçəyin
Canında neçə xal var.
Kimsə bilməz, qayıdar.
Bir başqa dəstə gəlir,
Yorulmuş xəstə gəlir.
Verilincə bu sorğu,
"Mənim işim deyil bu!" –
Deyərək, gələn dönər,
Parlaq diləklər sönər.

Xan taleyə inanır,
Hər şeyi ondan sanır.
"İnsanın olsa baxtı,
Qızıldan olar taxtı.

Mən talesiz olsaydım,
Talesiz doğulsaydım,
Xan olmaz, qul olardım,
Muzdur, yoxsul olardım”.
Onunçun hər elçiyə,
Qız xoşbəxt olsun deyə,
Verərdi bu sorğuyu.

**4**

Daşıb çayların suyu.
Hər sənə yaz olunca,
Quşlar dəmsaz olunca
Saray köçürmüş dağa,
Bir səfalı yaylağa.
Yaylaq, Yarımca yaylaq,
Hər tərəf çəmən, bulaq;
Xızıdan az o tayda,
Əriməz qarı yayda.
Quş xanın qızı Mərcan,
Sevda ulduzu Mərcan
Toplayıb tay-tuşunu,
Bir nizamsız qoşunu
Andıran dəstəsilə
Hər gün çıxarmış çölə.

Onun gəzdiyi yerdə,
Dağlarda, dərələrdə
Dəmirdaş adlı igid,
Bir çoban varmış, eşit!
Çobanın torpağı yox,
Tarlası yox, bağı yox;
Bir kiçik qülbəsi var,
Bir yırtıq gəbəsi var,
Bir də beş-on quzusu.
Çox yünüldü arzusu
Bu qərib çobanımın,
Müztərib çobanımın.

**5**

Bir gün çoban Dəmirdaş
Qonşuda bir iğtişaş,
Bir vay, haray eşitdi;
Dəyədən çıxdı getdi,
Nə gördü: yel qanadlı,
Dərədə bir qaç atlı
Qovurlar; bir qadın da
Əlləri saçlarında
Üzünü cırmaqlayır,
Hönkür-hönkür ağlayır:
– Tutun, qaçdı həramı,
Söndürdülər çıramı,
Qollarını sardılar,
Qızımı apardılar! –
Deyə yıxıldı qadın.
Dəyələr axın-axın
Qoşdular bu səs-küyə;
Dikildi gözlər göyə:
– Niçin ey ulu tanrı!
Yoxsulları, qulları
Qorumazsan ya, niçin?..
Kor kimi için-için
Yandı qəlblərində yas.
Qərinələrcə ağzı
Aşağı çevrilən tas
Duymadı bu niyazı.
O mavi tas nədənsə
Səs vermədi bu səsə.

**6**

Bir bahar günü yenə
Dəmirdaşın könlünə
Bir qəriblik yayıldı;
Yatmış ruhu ayıldı.
Yıxıldı böyrü üstə,
Bir yanıqlı şikəstə

Qavalında inlədi;
Urəyi sərinlədi.
Çaldı, düşündü, çaldı,
Başını duman aldı.
Bu duman nəzərində
Göylərin üzərində
Buludlar kimi çaxdı,
Al bir işıq buraxdı.
Canlandı təsəvvürü;
Əsirlər sürü-sürü
Axışdı xəyalından.
Dinlədi qavalından
Zəncir, qamçı səsləri,
Ömrün acı səsləri
Bəstəsində ağladı,
Bir lövhə xatırladı.

– İşlə, yaramaz, işlə!
Haydı, boşboğaz, işlə!
Dayanma, daşı, daşı!
Əsirin, qulun başı
Yuxarı qalxmaz, işlə!
Haydı, boşboğaz, işlə!
– Arqadaşlar, bu qansız,
Bu daşürək, amansız
İnsanlar dinmədikcə,
Zülmə təpinmədikcə,
Özlərindən çıxırlar.
– Söylənmə, hey ixtiyar,
Al, bu da sənin payın!
Nə arxayın-arxayın
Danışır da!..
Qamçılar
İxtiyarı acılar.
Dəmirdaş anır, anır;
Gözlərində canlanır:
Əsirlər alay-alay

Xana tikirlər saray.
Xatırlayır: bir gecə
Onu xəlvət, gizlicə,
Gözəl bir qız çağırdı,
Üz-gözündən yağırdı
O qızın bir mərhəmət,
Bəlkə də bir məhəbbət.
O qızın adı Mərcan,
Qolu, qanadı mərcan...

Dəmirdaş anır, anır,
Xatıratı canlanır:
İşlədi xəstə-xəstə;
Yerə dəydi iş üstə.
Baxaraq bu lövhəyə,
“Artıq işləməz”, – deyə
Bir az da incitdilər,
Sonra azad etdilər.
Dəmirdaş anır, anır,
Xatıratı canlanır.
Düşünür o gözləri,
Danışdığı sözləri.
Anır: bir sabah erkən
Çıxaraq Səbayeldən,
Dağlar, dərələr aşdı,
Bu yaylağa ulaşdı.
Hey düşünə-düşünə
İnlədi qaval yenə!

(*Bu zaman Mərcan öz dəstəsilə uzaqdan çobanın qavalına dalaraq heyrətlə dinləyir.*)

M ə r c a n

Bu qavalı çalan kim?
Kimdir bu şerə hakim?
Tez ondan xəbər verin,
Kimsə, tapın gətirin!

Çox keçmədi, Dəmirdaş
Ürəyində bir təlaş,
Qızın önündə durdu,
Səssiz boynunu burdu.
Görüncə Dəmirdaşı
Mərcanın döndü başı.
İldırım vurmuş kimi,
Ürəyi durmuş kimi,
Tərpənmədi yerindən.
Dümqara gözlərindən
Siyah bir atəş axdı.
Maraqla baxdı, baxdı
Çobanın göz-qaşına,
Yamaqlı üst-başına.

M ə r c a n

Kimdən öyrəndin, çoban,
Sən bu qaval çalmağı?

Ç o b a n

Mənə öyrətdi dövran
Dağlara ün salmağı.

M ə r c a n

Neçin nəğmən qəmlidir,
Nəşə yox qavalında?

Ç o b a n

Çünki el matəmlidir
Səbayel mahalında!

M ə r c a n

Sürünü buraxsana
Bir an özündən uzaq!

Ç o b a n

Ətrafına baxsana,
Hər adam bir yalquzaq!

M ə r c a n

Çoban, kimdir yalquzaq?

Ç o b a n

Xan qızı, yaxın uzaq,
Olmuş olursa hər kim
El üzərində hakim,
Sərkərdələr, əyanlar,
Dərimizi soyanlar,
İşləməyib yaşayan,
Başında tac daşıyan
Adamlarınsa ancaq
Bir adı var: yalquzaq!

Mərcan çobana baxdı,
Çoban Mərcana baxdı.

M ə r c a n

*(yanındakılara)*

Arqadaşlar, siz gedin,
Bir az məni tərk edin.

*(İkisi qalır)*

Məni tanıyırmısan?

Ç o b a n

Xayır!

M ə r c a n

Düşün, ey insan,
Keçmişini eşələ!

Ç o b a n

Bu bir əmək-nafilə!
Buraxaraq işimi,
Arasam keçmişimi,
O kül altından ancaq
Bir göz də çıxmayacaq.

M ə r c a n

Eşələ, çıxar, çoban,
Orda bir od var, çoban.
Üzümə diqqətlə bax!

Ç o b a n

Mərcan!

M ə r c a n

Sus ancaq.
. . . . . . . . . . . . . . . .
. . . . . . . . . . . . . . . .

**7**

Bir səhər hava gözəl,
Dağ gözəl, ova gözəl,
Dumanlı deyil hava,
Xan bu gün çıxmış ova.
Ətraf dolmuş adamla,
Bir yığın izdihamla.
Tuşlayırlar, atırlar,
Ətrafı çınlatırlar.
Qorxmaz adlı çoban da
Dağ başında, o yanda
Söykənərək ağaca,
Sürüsünü yamaca
Buraxaraq, dayanmış
Üzü mis kimi yanmış.

V ə z i r

Xan, nişan al çobanı!
Yerində çıxsın canı!

X a n

Yox, canım.

V ə z i r

Görünür xan,
Vuramayacağından
Qorxur...

X a n

Vəzir, qorxumu?
Bu günədək oxumu
Boş çıxan gördünüzmü?

V ə z i r

Ay canım, bu da sözmü?
Hünərlisən gözətlə,
Öyünməyin nafilə!

X a n

Mən atıram, dayanın,
Oxum dəyməz çobanın
Əgər olarsa baxtı.
Çəlik yayı buraxdı.
Uğuldadı dağ, dərə,
Yıxıldı Qorxmaz yerə.
Görünür baxtı yoqmuş,
Tale ona soyuqmuş.

**8**

Xan bir çobanı vurmuş.
Xan yenə də qudurmuş
Azğın bir köpək kibi.
Bilinməyir səbəbi.
Neçin çobanı vurmuş?
Xan yenə də qudurmuş.
Xan qaçırmış bir qızı.
Yetim bir günahsızı, –
Deyə, gizlicə xalq da
Qaynayır aralıqda.

**9**

Bir gün Dəmirdaş yenə
Yayıb dağın döşünə
Sürüsünü, dayandı,
Günəş üfüqdə yandı,
Qızardı yavaş-yavaş.
Düşünürdü Dəmirdaş.
Köhlən başlı buludlar,
Gözü yaşlı buludlar
Üfüqdə yol kəsirdi.
Onu hankı təsirdi
Düşündürən, əcəba?
Derdi: – Görən əcəba,
Bizdən nə istəyir xan?
Yetməzmi tökdüyü qan?!
Neçin, neçin bu qansız
Qaçırır gündə bir qız?!
Xan yenə də qudurmuş,
Neçin Qorxmazı vurmuş?
Yetməzmi vurduğu baş?..
Düşünürdü Dəmirdaş.

Yerlər, göylər açıqdı,
Dəmirdaş dağa çıqdı.
Çıxardı qavalını,
Bəyan etdi halını:

O çaldıqca, güllərin
Qaçdı qırmızı rəngi,
Dəyişdi bülbüllərin
Nəğməsinin ahəngi.
O çaldıqca, buludlar
Göy üzündə dayandı,
Şəbnəmli məxmər otlar,
Gün çıxmış kimi yandı.
O çaldıqca, axan su
Şırıltısını kəsdi,
Söyüdlərin, doğrusu,
Suda qolları əsdi.
Nəsir var – duyan anlar –
Çobanın havasında.
O çaldıqca, ilanlar
Uyudu yuvasında.
Qavalın bu səsinə,
Bu duyğulu səsinə
Qoşaraq, gəldi Mərcan,
Ürəyində həyəcan.

M ə r c a n

Mana da öyrət, çoban,
Sən bu qaval çalmağı.
Mana da öyrət, çoban,
Dağlara ün salmağı.

D ə m i r d a ş

Xan daha gözəl bilir
İncə-incə çalmağı.
Xan daha gözəl bilir
Dağlara ün salmağı.

M ə r c a n

Dəmirdaş, buraq, buraq!
Kinayəni ataraq,

Bir az da məni dinlə,
Səni sevəni dinlə!

D ə m i r d a ş

Sən xan qızı, mən çoban!
Nə çıxar boş xəyaldan?

M ə r c a n

Xəyal deyil, həqiqət!..
Mərcan sənindir fəqət.

D ə m i r d a ş

Yox, Mərcan, ola bilməz,
Bu bir dərd ki, çəkilməz!

M ə r c a n

Onu bil ki, sevməsən,
Öləcəksən yəqin sən!

D ə m i r d a ş

Səni xan mana verməz,
Yoxsul çobana verməz!
Bir də deyirlər ki, xan,
Əgər kim xalınızdan
Doğru xəbər verərsə,
Sahib olacaq sizə.

M ə r c a n

Qoy deyim: xallarım bu!
Yetər, sıxma ruhumu.
Ürəyini aç mana,
Xəstəyəm, əlac mana!

D ə m i r d a ş

Söylə “möhtərəm” atan,
Bizim “ədalətli” xan
Neçin Qorxmazı vurmuş?
Yenə neçin qudurmuş?
Qaçırmışdır bir qızı,
Yetim bir günahsızı?

M ə r c a n

Mən neyləyim?

D ə m i r d a ş

Sən heç nə!
Qulaq as mən deyənə,
Ey sarayın laçını!
Sevgi ehtiyacını
Ruhunda duyan gözəl,
Bir qədər özünə gəl!
Səni kim istəməz, kim?
Hər lətafətə hakim
Sevimli bir pərisən,
Dillərin əzbərisən.
Bu şərtlə sevərəm mən:
Çıxmasan dediyimdən.

M ə r c a n

Yox, sözündən çıxmaram,
Ürəyini sıxmaram,

D ə m i r d a ş

Desəm atanı öldür!
Ağlayan xalqı güldür.
Edərsənmi?

M ə r c a n

Edərəm,
Ölümə də gedərəm!

D ə m i r d a ş

Yox, hələ öldürmə, yox!
Xanın ölməsi ən çox
Xalqa gətirər ziyan;
Üsyan etməli, üsyan!
Lakin dediklərim, bax,
Yanında qalsın ancaq!

M ə r c a n

Yazıq ki, bu yaxında,
Bu ayın axırında
Köçəcəyik şəhərə,
Bu mehriban dağ-dərə,
Ah, bu səfalı yaylaq
Yenə sizə qalacaq!

D ə m i r d a ş

Yalnız bu dağ-dərə yox,
Bu gözəl mənzərə yox,
Sərin yaylaqlar deyil,
Qaynar bulaqlar deyil,
O kor, o sağır kəndlər,
Vergisi ağır kəndlər,
Barlı bağ, gözəl çəmən,
Dağ döşündə dəyirmən,
Sürü, ilxı, çapar at,
Uçan quş, gərgin qanat,
Göy zanbaqlı ovalar,

Dalğa vuran tarlalar,
Sarısünbül zəmilər,
O çılğın Xəzərin də,
Hər zaman üzərində
Lərgər vuran gəmilər,
Keçəcək əlimizə,
Veriləcəkdir bizə
Ayın, günün işığı,
Dünyanın yaraşığı!

**10**

Yenə də uzaq, yaxın
Ellərdən axın-axın
Gəlirdi baş igidlər,
Qəmə yoldaş igidlər.
"Ey sevdalı yolçular,
Qızın neçə xalı var?"
Sorğusunu eşidər,
Eşitməz, dönürdülər!

Qız on səkkiz yaşında,
Sevda yeli başında.
Getdikcə canı qızır,
Lətif əndamı sızır
Günəş vuran qar kimi,
Solur son bahar kimi.
Çiyninə düşür başı.
Çağırdıb Dəmirdaşı
Girir ağaclıqlara,
Görüşür ara-sıra.
Dəmirdaş da bir yerdə
Durmayıb gah şəhərdə,
Gah kəndlərdə dolaşır,
Böyük fikirlər daşır.
Ələ almış Mərcanı,
Hazırlayır üsyanı!

**11**

Vəzirin oğlu Gülçin
Çırpınır bu gözəlçin.
Fəqət bilməyir o da,
Bu qızın əndamında
Neçə həbəşi xal var.
Düşünür, qəlbi sızlar,
Gülçinin xəyalından,
O çətin xəyalından
Bilsən nələr keçirdi,
Nə səhnələr keçirdi:
“Qız onun olacaqdır.
Əlinə alacaqdır
Səbayeldə xanlığı,
Bütün hökmranlığı.
Hakim olub Arana,
Daha sonra İrana
Ordusunu çəkəcək,
Hər yerdə qan tökəcək,
Hər yerdə hökm edəcək,
Çinə qədər gedəcək,
Böyük İskəndər kimi.
Xızır peyğəmbər kimi
Tapacaqdır zülmatı.
İçib abi-həyatı,
Ömrü, günü artacaq,
Hər yerə qol atacaq,
Mərcanı alacaqdır,
Qoynuna salacaqdır,
Yapacaqdır baş hərəm,
Onun olacaq aləm!”

**12**

Günəş qızıllarını
Xəsis kimi toplayır,
Səbayel diyarını
Bir qaranlıq qaplayır.

Bir axşam xan bağında,
Bağın bir bucağında
Mərcan bir səs eşitdi;
Səs gələn səmtə getdi.
Bir yüklənmiş araba,
Bir qoca kəndli gördü,
Ayağı bəndli gördü.
– Vurun, vurun alçağı,
Keçmiş verginin çağı.
Vurun, vurun, qoymayın,
Mərhəmətə uymayın!
Səslənir acı-acı
Darğanın sərt qırbacı.
– Zavallını buraxın!
İnsafsızlar, bir baxın,
Nədir bu qanlı səhnə?
Sərxoşmusunuz yenə?
– Xan buyurmuş!
– Bəlkə xan
Qəzəblimiş o zaman,
Ya sizin vicdanınız,
Məgər yoxmu qanınız?
Mana verin qırbacı!
"Ulu yaradan, acı,
Acı bu yoxsullara,
Yetimlərə, dullara!" –
Deyə, Mərcan düşünür,
Meyli saraydan dönür.

**13**

Bir gün qafiləsilə
Xan çıxmışdı sahilə.
Ləpəciklər quş kimi,
Qalxıb uçurmuş kimi.
O sərin baxışlı ay
Dənizə alay-alay
Ulduzlarla tökülmüş.

Dalğalar qızıl, gümüş...
Sinələr lalə-lalə,
Dodaqlarda piyalə,
Sərxoş baxan hərəmlər,
Baxışı qan hərəmlər,
Oyun, şərqi, şərab, saz,
Dodaq-dodağa dəmsaz.
Bir hərəmsə ələmli,
Qızına qəmli-qəmli
Danışır həyatını,
Küskün xatıratını:
– Mərcan, həyat bir kitab!..
Hər vərəqi bir əzab...
Mən bir kəndli qızıydım,
Bir evin ulduzuydum.
Keçmişim qar altında,
Qasırğalar altında...
Yadımdadır, əsirdim...
Yarpaq kimi əsirdim,
Bir gün caryə bazarda,
İradəm qulçularda –
Ordan məni aldılar,
Bu zindana saldılar!

**14**

Ruhu sərin bir gecə,
Ay gizlicə-gizlicə
Bir bulud arxasından,
Göylərin yaxasından
Göstərərək üzünü,
Bəyəndirir özünü.
Söylənən xan bağında,
Bağın bir bucağında
Xışıldayan nədir, nə?
Örtülüdür bu səhnə.
Yarpaqlarmı öpüşən?
Söylə o suya düşən
Mərcanın kölgəsimi?

Yoxsa ayın əksimi
Göstərir hovuzda su,
Ah, bu könül oğrusu
Qızın yanındakını,
Qızın canındakını
Həmin bu sirdaş bilir,
Yəni Dəmirdaş bilir...
Əsir Dəmirdaşın da
Sevda yeli başında.
O sevimli Mərcanı,
O füsunkar ceyranı
Almaq üçün düşünür.
Yenə fikrindən dönür:
“Əvvəl üsyan, sonra qız,
Xanlığı yıxmalıyız!..”

D ə m i r d a ş

Səni bir xan istəsə,
Xalını tapıb, desə,
Ona gedərsənmi sən?

M ə r c a n

Bir dəfə dedim ki, mən
Səndən başqa bir kəcə
Getməm başım kəsilsə!

D ə m i r d a ş

Səni bütün saraylar,
Əyləncələr haraylar.
Oralar başqa aləm,
Olacaqsan baş hərəm.

M ə r c a n

Anam da bir hərəmdir,
Fəqət yediyi qəmdir.
O daim deyir mana:

Saray bənzər zindana.
Qaç, qızım, buradan qaç!
O parlaq, günəşli tac
Süslənmiş göz yaşından.
Yoxsulların başından
Yapılmışdır qədəhlər;
Nalədir bu fərəhlər.
Bu saray yoxsulların,
Öksüzlərin, dulların
Tikilmiş gəmiyindən!
Qaldırılan, içilən
Badə ürəklər qanı.
Sarayda şənlik hanı?
Saray bir qara səhnə,
Qorxu, vəsvəsə, fitnə.
Gizli dar ağacları,
İşgəncə qırbacları.
Tənbəl, sərxoş bir xəyal...
Falçı, əfsunçu, rəmmal,
Hər göz bir kasa şəhvət,
Hər baxış bir xəyanət.
İnsanlar alçaq, dəni,
Tez burdan qaçır məni!

D ə m i r d a ş

Burdan qurtarmaqla sən,
Sarayın pəncəsindən
Qurtuldunmu sanırsan?
Yox, Mərcan, aldanırsan!
Xanlığı yıxmalıyız
Ağ günə çıxmalıyız.
. . . . . . . . . . . . . . .. . . .. . .

M ə r c a n

Dəmirdaş, yarın səhər
Elçilər gələcəklər.
Sən də yarın gedərsən.

Çocuq deyilsən ki, sən.
Səni xan mana verməz,
Yoxsul çobana verməz.

**15**

Böyük məclis quruldu.
Gələnlərdən soruldu.
Bilməyənlər getdilər.
Qalmışdı iki nəfər:
Dəmirdaş, bir də Gülçin.
Sorğu verildi, lakin
Gülçin bula bilmədi,
Xaqan ola bilmədi.
Sıra çatdı çobana,
Bir gülmək gəldi xana,
Dedi: – Sağ ol, ay çoban!
Çoban dedi: – Var ol, xan!
– Neçə xalı var qızın?
Çoban dedi ansızın:
– Qızın yeddi xalı var,
Həpsi gözəl, müşgüvar.
– Çoban, hardan bilirsən?
– Yuxuda saymışam mən.
Götürdü xanı heyrət,
Dedi: – Tanrıdan qismət
Yoxsul çobanmış qıza,
Bu canıyanmış qıza.

Xan sarayda düşünür;
Başında yanır, sönür
Dürlü-dürlü xəyallar,
Keçirir şaşqın hallar.
Xan bir deyildir, iki
Dumanlı beynindəki
Düşüncələr çataçat.

Dərdi artmış ikiqat.
Bu iş olsunmu ya yox?
Qızımı istəyən çox.
Mərcanı xan alsınmı?
Yoxsa çoban alsınmı?
Hansı daha uğurlu?
Deyilmi haqqın qulu
Bəy də, xan da, sultan da
Mavi göyün altında?!
Bir qədər düşündü xan:
“Mana taymı bir çoban?
Çoban hara, mən hara?
Gül hara, tikan hara?
Sonamı alsınmı sar!
Hardan çıxdı bu yasar?
Mən deyirdim sultanlar,
Ulu şahlar, xaqanlar
Sahib olacaq qıza.
Nə çıxdı baxtımıza?!.
Ayaqyalın bir çoban.
Hay, hay, zavallı Quş xan!
Sana bir gəda eşmi?
Rəvamı günəşimi
Bir zərrənin başına
Dolandırım? Yox! Mana
Bu iş çox ağır gəlir.
Yerdən, göydən yüksəlir
Sanıram mana nifrət.
Qazandığım bu şöhrət
Bir çobana yaraşmaz.
Yox, taleylə kar aşmaz”.

**16**

Gecə, sisli bir gecə,
Xan bağında gizlicə
Mərcan ilə Dəmirdaş
Danışır yavaş-yavaş,

D ə m i r d a ş

Dün gecə cəbbəxana
Dağıdıldı dörd yana.

M ə r c a n

Bilir bu sirri dərban,
Açmayır qorxusundan.
Gizlicə onu gördüm,
Qolbaqlarımı verdim
Qızına, susdu dərban.

D ə m i r d a ş

Sağ ol, sevgili Mərcan!
Kəndlər üç günə qədər
Hücuma keçəcəklər.
Xanın keyfi necədir?

M ə r c a n

Sənin "istəyincədir".
Daima eyşü-işrət;
Eyləməz bir məşvərət.
Xalqın dərdinə qalmaz,
Sərxoşluqdan baş almaz.
Elçilikdən nə çıxdı?

D ə m i r d a ş

Bütün əfsanə çıxdı.
Budur, baxta inanan,
Boşboğaz, yalançı xan.
Onun bəxtindən ancaq
Ucaldıqca ucalmaq,
Deyil yalnız xan olmaq,
Böyük bir xaqan olmaq
Nəticəsi çıqırdı.
Bizim ölçümüz qırdı

Nədənsə məramını.
Biz taleyin şamını
Siyasətlə söndürdük,
Xanı çox düşündürdük.
Söylənərək, dedi xan:
“Mənə taymı bir çoban?”
Ürəyimdə: “Bu çoban
Sənə ən qatı düşman,
Çevirəcək baxtını,
Devirəcək taxtını” –
Deyib, çıxdım saraydan.
Düşün, sevgili Mərcan,
Sən böyüdün sarayda.
Ancaq ordakı qayda,
Qanun, adət, ənənə
Sənin geniş qəlbinə
Sığmadı, atdın onu.
Bir çobanın yolunu
Kəskin inadla tutdun,
Taxtı-tacı unutdun.
Şöhrətin bundan belə
Düşəcək dildən-dilə.

Gecə, səhərə yaxın
Axın şəhərə yaxın.
Ulduzlar sönür, sönür;
İki ürək döyünür.
Toranlaşır batan ay.
Uyquda sərxoş saray.

M ə r c a n

Səhər üsyanmı?

D ə m i r d a ş

Üsyan!
Ayağa qalxmış hər yan.
Hər şey, hər şey öncədən

Düşünülmüş incədən.
Tez burdan çıxalım gəl,
Çıxmamışdan bir əngəl.
Qoşularaq üsyana,
Bu saraya, bu xana
Birlikdə son verəlim,
Gözəl günlər sürəlim!
. . . . . . . . . . . . . . . . .. .. . .
. . . . . . . . . . . . . . . . . . . . .

Vəzir çıxmış özündən.
Anlaşılmaz sözündən
Xan gəlmiş həyəcana:
– Gətirmə məni cana!
Çapuq söylə nə var, nə?
Nə toxunmuş könlünə?
– Xan sağ olsun, qız!..
– Necə?
– Qaçırılmış indicə.

Hazırlanır atlılar,
O külək qanadlılar.
Gözlərdən od saçılır,
Dərvazalar açılır.
Onların arxasınca,
Quzğunun yaxasınca
Çapır bir dəstə atlı,
Atır at üstə atlı.
Ox atır, kaman çəkir,
Yayını yaman çəkir.
Mərcan, Dəmirdaş uçur
Sanki iki quş uçur.
Çapuq çatdılar Zığa.
Bax, o iki yazığa
Daha qaçmağa yol yox,
Yağış kimi yağır ox.
Qarşı su, arxa düşman.

Qurtuluşa yox güman.
Üç yandan Abşeron su,
İki gəncə qarşı su
Mavi köksünü açmış,
Mərcanın rəngi qaçmış.
– Düşmə, Mərcan, qorxuya!
Çap atını, gir suya!

**17**

Qərb tərəfdən bir axın
Axışır, baxın, baxın.
Axın çılğın, əsəbi,
Ox yağır yağış kibi.
– Gəlin, qorxmayın, gəlin!
Önünü hər əngəlin
Alaraq, çapır axın;
Axına şəhər yaxın.
– Gəlin, qaçaraq, gəlin,
Bayraq açaraq gəlin! –
Deyə, qoşur bir qoca.
Qarşıda qaça-qaça
Gah durur, gah yatırlar,
Tuşlayırlar, atırlar.
– Hücum, hücum, irəli
Səbayelin kəndləri,
Hücum, saraya hücum!

Aldı araya hücum
Quş xanın alayını,
Dağıtdı sarayını.
Quş xanı öldürdülər,
Yoxsulu güldürdülər.
Dan yeri sökülmüşdü,
Dənizə tökülmüşdü
Günəşin qızıllığı.
El bürümüşdü Zığı.
Dəmirdaşla Mərcanı,

Bu iki qəhrəmanı
Arayırdı yoxsullar,
Aclar, yetimlər, dullar.
Dənizin boy yerində,
Atlas su üzərində
Üzürdü bir tutam saç,
Artıq məsələdən qaç!
Bir gün qabardı Xəzər,
Qalxdı tərlan ləpələr.
Qanadlarını açdı,
Bu tarixə acıdı,
Quş xanın ləkəsini,
Xaraba kölgəsini
Silməkçin yer üzündən,
Coşub çıxdı özündən,
Səbayelə tüpürdü,
Dalğalandı köpürdü;
Şəhər boğuldu.
Hala,
Fəqət bir-iki qala
Boylanıb bu səhnədə,
Çapalarkən, yenə də
Döyür bu qalaları
Qızıl neft dalğaları.

**Son**

Bu bir əfsanədir, nağıldır, fəqət,
Tarixdə azmıdır böylə həqiqət?
Tarixdə dağılan saraylar azmı?
Döyüşdə pozulan alaylar azmı?
Azmı yoxsulların çəkdiyi səflər,
Basılan tərəflər, basan tərəflər?
Bağışla, oxucum, sual olarmı?
Həqiqət olmasa, xəyal olarmı?
Ey əfsanələrin qəhrəman oğlu,

Əsrlər tapdadı keçdiyin yolu.
O sənin yaxdığın azğın saraylar,
Qovub dağıtdığın vəhşi alaylar
Yenə baş qaldırıb işini gördü,
Yenə də haqsızlıq hökmünü sürdü.
Yenə göz yaşları axdı günahsız,
Həyat nəfəsini çəkmədi ahsız.
Qırıldı insanlar, töküldü qanlar,
Titrədi cahanlar, qopdu fəğanlar.
Yenə lalə kimi başlar oynadı,
Başların üstündə daşlar oynadı.
Yağdı yağış kimi zəhərli oxlar.
Aclar hesabına yaşadı toxlar.
Tarixin bu acı dəhşətlərinə,
Əsrlərin qara qüvvətlərinə
Qırmızı bir axın verdi nəhayət,
Artıq nə bir fəğan, nə bir şikayət.

***1933***

## “MƏNİM DOSTUM”

Zuvanddan gəldiyi bir ay olardı...
(Onun bir dumanlı keçmişi vardı).
Bulduğum bu qoçaq, yeni qəhrəman
Olmuş xəyalıma, fikrimə mehman.
Dostumun şöhrəti Nəsib ağaydı,
Köhnə müəllimdi, adı Sadaydı.
Göycə mahalının bu nəcib oğlu
Bir gün Gürcüstana gedilən yolu
Tutaraq, Qoridə almışdı təhsil,
Mənim qəhrəmanım xəyali deyil.

Bir müddət buraxıb Azərbaycanı,
Elmlə bəzədi Türkmənistanı.
Qorxunc cahan hərbi nərildəyincə,
Dünya bir-birinə çaxıb, dəyincə,
Gəlincə ölkələr pəncə-pəncəyə,
Mənim qəhrəmanım qaçdı Gəncəyə.

O bir müəllimdi; o zaman gərək,
Dostum bir firqəyə verəydi ürək.
Lakin bu şeylərə yaxın durmadı,
Siyasət uğrunda qafa yormadı...
“Müəllim babayam, mana nə firqə?
Mənim yolum başqa, məsləkim başqa.
Rəngdir bu dunyada hər firqə bir şey,
Əlinə düşəni ordaca bas, ye!..”
Deyə qəhqəhəylə gülürdü dostum,
Uğunub, gülməkdən ölürdü dostum.
Ölkədə inqilab nərəsi qopdu...
Köhnə əqidələr, sanmayın, hopdu
Yerin nəhayətsiz dərinliyinə...
Yaşayırdı əski insanlar yenə...
Bəzən məndən uzaq, bəzən yanımda
Yaşayırdı mənim qəhrəmanım da.
Ancaq, keçmişdən söhbət düşürkən

"Eh!" – deyib dizinə vurur ürəkdən.
Sovrulan bir aha dönür sözləri,
Kəlləsinə çıxır xırda gözləri.
"İndi müəllimlik hamballıq demək,
Havaya sovrulur çəkilən əmək..
Keçmişdə müəllim ağaydı, ağa!.."
Deyərək, gedərdi xeyli uzağa.

Gözləri yıldızlı bir yaz gecəsi,
Xəfif küləklərin şirin ləhcəsi
Bir ney dili kimi açılan zaman
Dallarda yarpaqlar əl çalan zaman
Bir evdən gəlirdi nəşəli səslər,
Nəşəli səslərdə sıcaq həvəslər...
Büllur qədəhlərin öpüşməsini,
Kaman naləsini, tar nəğməsini
Ürkmüş dinləyirdi, gecə yolları,
Gecənin kimsəsiz incə yolları.
– Çal! Dönüm gözünə!
– Çal!
– Ay qız, oyna!
Qurban olum sənin uzun boyuna!
Ala! Bu çervonlar, ala bu pullar!
Ala! Zibil kimi; nə dərdimiz var?
Maarif şöbəsi sağ olsun, canım,
Tək xiffət çəkməsin mənim ceyranım,
Deyərək, qədəhin getdi dibinə.
Əlini salarkən yenə cibinə,
– Saday, yetər, yetər!..
                        Qalxdı bir nəfər.
– Bu qədər özünü itirməz insan!
Onun söz tutmayan dodaqlarından
Bir sərxoş qəhqəhə qopdu, yayıldı,
Yuxudaymış kimi, birdən ayıldı.

Bu sayaq, Gəncədə işlədi, dostum...
Bir sabah qəzetdə, olduqca məşum,
Uğursuz bir xəbər oxudum – əvət,

Mənim qəhrəmanım etmiş xəyanət,
Hər gün vur-çatlasın, hər gün vur-haray!
Nə bilim nə qədər pul yemiş Saday?
Bütün varlığilə bir qızı sevmiş,
O qız da özünün talibəsiymiş.
Bir an ayrılmazmış onun izindən,
Dərs dediyi yerdə getmiş özündən...
Bu hal pisikdirdi onun ruhunu,
İti qovan kimi qovdular onu,
Gəncədən basdılar qəhrəmanımı,
Bu iş "çox qaraltdı" mənim qanımı.

Bilsəniz Bakıda bir gün nə gördüm?
Gördüyüm adama tərəf yüyürdüm:
– Salam!
– Paho, salam!
– Balam, necəsən?!
Söylə, nə var, nə yox bizə Gəncədən?
– Gəncəni büsbütün buraxdım.
– Niyə?
– Çevirməm üzümü bir də Gəncəyə.
Hamı bisavaddır, hamı biədəb.
Qəza intiriqa yuvasıdır həp.
Onsuz da, Bakıda iş yeri çoxdur,
Kimsənin kimsədən xəbəri yoxdur.
Bu saat rabfakda çalışıram mən;
Şeytan da baş açmaz mənim işimdən.
Mənim əlimdədir məktəbdə hər şey.
Əlinə düşəni ordaca bas, ye!
Bir gəl bizə sarı, yaxşı evim var,
Şikarnı, balkonlu, geniş otaqlar..;
Sən öl! Bir tələbəm tapmışdır mana.
Keçən sülüs zəif vermişdim ona,
Bu yolla ödədi o da borcunu.
Sən öl! Bir ikmala tutmuşam onu.
Di, sağ ol!
– Hələlik!
Ayrıldım ondan...

Bir gün eşitdim ki, yenə qolundan
Yapışıb, atmışlar onu dişarı;
Meydana çıxmışdır oğurluqları.
Bu dostum rabfakda çalışan zaman,
Məktəb zavxozuymuş, edirmiş "siçan".
Burdan da basdılar qəhrəmanımı,
Yenə "qaraltdılar" mənim qanımı.

Bir gün qəhrəmanım əlində çanta,
Görüncə: – Gedirəm, – dedi, – fronta.
Zuvand rayonuna soyuz göndərir;
Qorxma, işlər yenə öz yerindədir, –
Deyə qəhrəmanım mindi vapora...
Ürəyimdə: "Bir gün düşərsən tora!.."
Xayır, qəhrəmanım aciz deyildir,
Acizlik naminə cayiz deyildir.
Danışsa od yağar dilindən onun,
Şeytan da qurtarmaz əlindən onun.
Öz-özümə fikrə gedəndən sonra,
Dedim: – "Cahan düşər, o düşməz tora,
Onun yapmadığı kələk qalmamış,
Boş yerə aferist namı almamış".

Mənim qəhrəmanım yola düşəndən
Bir neçə gün sonra dərsdən dönərkən,
Bir əski yoldaşım qarşıma çıxdı,
Mehriban-mehriban əlimi sıxdı.
– Dostunun işindən xəbərin varmı?
– O qədər dost var ki, saymaq olarmı?
Hansı dost, nə bilim?
– Saday mirzədən.
– Onun işlərini varmı bilməyən?
– Doğrudan da yaman fırıldaqçıdır;
Öylə yaşayışdan ölüm yaxşıdır!
Müəllimlik hara, oğurluq hara?
Atdılar rabfakdan onu bayıra.
Neçə yol məktəbdən şey-şüy aparmış,

Məktəbdən nə isə yenə qoparmış.
Nəhayət haqlayıb tutmuşlar onu;
Bütün məktəb bilir oğurluğunu.
Bu iş yaraşarmı bir müəllimə?!
Dedim: – Bu sözləri deyirsən kimə?
Bir də bu kəlməni dilinə alma,
Onu hər yetənin ağzına salma!
Düşün, mənim dostum "yaxşı kişidir",
Zuvandda maarif müfəttişidir.
– Canım, nə deyirsən?
– Sən öl!
– Vay, hərif!
Davama başladım mən xəfif-xəfif.
– Bəli, – dedim, – onu kimsə göndərmiş,
Dostuma bir məsul vəzifə vermiş.
Aferistlik onun köhnə işidi;
Zuvandda maarif müfəttişidi.
Çəkir iki aklad dərsin yukunü,
Aparır Şekayım müdürlüyunü.
Metodik işlər də ona baxırdı,
Müxtəsər su kimi çervon axırdı.
O hər ay min manat maaş alırdı,
Çox zaman ovlaqda yatıb qalırdı.

Ovçuluq dostumun köhnə sənəti,
Hər zaman, hər yerdə budur söhbəti.
Söz düşəndə deyir: – Gərək dədəmdən
İrsiyyət qanunu mövcibincə mən,
Bir şey öyrənəydim, bir şey alaydım,
Ta ki, öz atamın oğlu olaydım.
Atamın bildiyi bir şey vardı – ov;
Əldən saldı onu qırqovulpulov;
Kişi var-yoxundan keçdi bu yolda.
Bəli, mənim kimi fərli oğul da
Atanın yolundan çıxmaz bir addım.
Mən bu sənətimdə ona oxşadım,
Deyərək, dostumun dişi ağarır,
Çılqın bir qəhqəhə havanı yarır.

Dostum ovçuluqda olduqca pərgar,
Onun, Tirmə adlı bir ov iti var.
Gözunə döndüyum, Tirmə, nə Tirmə,
Kişmir tirməsini yada gətirmə.
Dərsdən gələn kimi Tirməyə baxır.
Gözləri süzülür, ürəyi axır.
Onunla oturur, onunla durur.
O da məlul-məlul boynunu burur.
– Çoxdanmı ovçuluq edirsən, Saday?
– Öylə vaxt olmuş ki, canınçun, bir ay
Kollarda-koslarda yatıb qalmışam.
Uşaqkən əlimə tüfəng almışam.
Həyatın ləzzəti başqaydı onda,
Başqa bir aləm var, qaban ovunda.
Gənc bəylər, qış günü çıxardıq çölə.
Görürdün ördəklər çamır bir gölə
Soxub dimdiyini arayır qida;
Bu zaman uzaqdan nişan alıb da
Atınca, vururdum bir yığın ördək.
Lakin qaban ovu qorxuludur pək.
Canım, indi nə var? Gecə-gündüz iş,
İnsan iş əlindən cəzana gəlmiş.
Baş, beyin yorulur. Hər yerdə iclas
Çağrılır, qurulur hər yerdə iclas.
İçlasdan nə çıxar, iş gərək, canım!..
Yenə də boş yerə qaraldı qanım...

Mənim qəhrəmanım "gözəl işlədi",
Zuvandda şöhrəti çox genişlədi.
Həftənin çoxunu ovda qalırdı,
Quşların içinə şivən salırdı.
Zuvand meşələri olduqca qalın...
Bakıya getməsin sənin xəyalın.
Göylərdə laciverd, əlvan buludlar,
Yerlərdə meşələr, boylu palıdlar.
Qızılgöz ağaclar, dəmir ağaclar.
Rəngin bir xalıya bənzər yamaclar.

Gül gülü çağırır, çiçək çiçəyi,
Sular qart dağların bəyaz birçəyi;
Belə mənzərədən kim ayrılar, kim?!.
Səncə, bir duyğusuz daşmı müəllim,
Maarif müdiri, metodist Saday?
“Ömr etmək, yaşamaq deyildir qolay,
Böyük axmaqlıqdır həyata gəlmək.
Gəlirkən, keyfini çəkmədən ölmək,
Bəlkə axmaqlığın axmaqlığıdır.
Bəlkə də insanın sarsaqlığıdır”.
Dilinin əzbəri buydu Sadayın,
Çox da bu sözlərə məhəl qoymayın.
Mənim qəhrəmanım sərxoş oldumu,
Kefi də bir qədər çox duruldumu,
Qızıb bulanacaq içində kini,
Ötürəcək geri içindəkini,

Bir sənə işlədi Zuvandda dostum,
Bir gün evlərinə düşmüşdü yolum.
– Ya allah, ya allah, xoş gördük səni
– İçəri gəl görüm!
                        Girdim içəri.
Başqa bir halətdə gördüm evləri:
Salmış qəhrəmanım hər yana xalı,
Bir o qalmış vursun tavana xalı.
– Mübarəkdir! – dedim.
– Sağ ol...
                        Yepyeni
Bir divan üstündə oturtdu məni.
Önümüzdə bir daş ayna ki vardı,
Saday ara-sıra ona baxardı.
Sanmayın aynaya fikir vermədim,
Verdim, Sabir kimi “əyri görmədim”
Aynada muəllim qəhrəmanımı.
– Oralar necədir?
– Hara, Zuvandmı?
Orası cahillər vilayətidir,

Özü də dunyanın nəhayətidir.
Bir mənə bax görüm, kökəlmişəmmi?
Cana dolmuşammı, yekəlmişəmmi?
– Sən, hələ əvvəldən yekəydin, fəqət
Bir az bədəninə çatmayırdı ət.
Zuvandda doldurdun bu kəsiri də,
Həmən kökəlmənin gizli sirri də
Bir sana məlumdur, bir də ki, mana.
– Çək, gəlsin!
– Gedəydin Talışıstana,
Görəydin nələr var, nə mənzərələr!
Bir gumüş ney kimi körpə dərələr
Dağların dibində inləyən zaman,
Həmən iniltini dinləyən zaman,
Düşünə-düşünə qalın meşələr
Doğurur ürəkdə büllur nəşələr.
Vəhşi bir gözəllik, vəhşi bir aləm,
Göy yerə aşina, yer göyə məhrəm.
Hər tərəf yaşıllıq, hər tərəf orman,
Dağların başında seyrək bir duman
Ardında süzülur günün baxışı –
Dərədə bir çayın məxmur axışı.
Başqa səfası var hələ Lerikin.
Çağlaya-çağlaya uca bir dikin
Oyuğundan bəyaz saçlı bir arslan
Kimi nərə çəkib çıxan, çağlayan,
Altında parlayan daşı görsəniz,
Vallah, şairliyə başlardınız siz.
Quşlar bölük-bölük uçarkən həmən,
Tüfəngi çiyninə dikləyincə sən,
Bilirsən ovçuluq onda dadlıdır,
Bir az qaban ovu ehtiyatlıdır.
– Məktəblər necədir?
– Canım, nə məktəb!
Heç varmı məktəbi eləyən tələb.
Oxumuş nolacaq avam talışdan,
Başını götürməz hisli balışdan,

Köhnələr demiş ki, talış, ay talış;
Ağzına gələni danış, ay danış!
Əkşi, cəhənnəmə, mənə nə var ki,
Heyf deyil Bakı, can deyil Bakı.
Keçmək mümkün deyil süddən, qatıqdan,
Yoxsa o yerlərdə durarmı insan?..
Deyib danışmamız çəkdi, uzandı,
Söhbət əsnasında birdən dayandı;
Aha, dur, yaxşıca düşdü yadıma,
Görsən, əqlin çaşar mənim radyoma.
Yeddi yüz manata almışam, – deyə,
Sıçrayıb tələsik çıxdı eşiyə.
Böyük bir çamadan gətirdi, açdı,
Radyonun telini harasa sancdı.
Bir qədər oxudu, çaldı radio.
Yenə ovçuluqdan basdı, kəsdi o.

Yazıq, qəhrəmanım, yazıq halına,
Yenə cəfa oxu atdılar sana.
Yenə dağıtdılar xanımanını,
Saldılar ayağa namü şanını.
İşdən çıxartdılar, həbsə atdılar,
“Öz dostların” səni alıb-satdılar.
Ömrün üç aydır ki, keçir həbisdə,
Gözlərin yollarda, qulağın səsdə...
Tökülür burunundan yediyin pullar.
Söylə, sənin kimi tülkü azmı var?
Lakin çox böyükdür sənin macəran,
Böyükdür qəlbində açılan yaran.
Sən yedin pulunu müəllimlərin,
Onlar üç ay qışı olduqca dərin
Bir böhran içində ömür sürdülər,
Bütün günahı da səndə gördülər.
Sən beş radyosunu satdın Zuvandın,
İşləmək yerinə gəzdin, dolandın.
Sən rayon maarif müfəttişikən,
Bir kənddə olmadı üzünü görən.

Aldın iki aklad dərsin pulunu,
Köhnə düşmənlərin tutdun yolunu.
Şekayım müdirlik gözlədi səndən,
Keçirtdin gününü ovçuluqda sən:
“Rəngdir bu dünyada hər firqə, hər şey
Əlinə düşəni ordaca bas, ye!” –
Deyərək kefləndin, gəzdin sərsəri,
Səndən şikayətçi Zuvand elləri.
İndi yat, yerindir, böyük dəhşətin
Ləkədir adına müəllimliyin.

Siz ey tərbiyəçi, işıqçı ərlər!
Zülmətlə döyüşə çıxan nəfərlər!
Mən də müəlliməm, bir gənc müəllim,
Bu yeni dünyada mənim də əlim
Çömləkçilər kimi bir şey yoğurur,
İnsanın fikrini yenidən qurur.
Sən ey müəllimlik, bilirəm ki, sən
İnqilab uğrunda nələr çəkmisən.
Zülmətin yellərə sovrulmasında,
Həyatın günəşdən qurulmasında
Kargüzar olmusan, müxbir olmusan,
Ey qoca müəllim, ey möhkəm insan!
Bir qədər dərindən edilsə təhmil,
Saday sənin əsil sifətin deyil.
Ah, lakin sənin də içərində var
Mənim “dostum” kimi çuruk ağaclar
Onlar müəllimlik adını alır;
Düşmənin üstünə kölgələr salır.
Mən buldum bunların bir nəfərini;
Siz də
Qovun içinizdən böylələrini.

## SƏHƏR

Qaşlardan qaşlara süz, romantikam!
Könül sularında üz, romantikam!
Bu əngin sənindir, bu yer sənindir,
Ulduzlar sənindir, güllər sənindir.
Çırpınsın şövqunlə söz, romantikam!
Ey mənim könlumə göz, romantikam!
Bu zəngin varlığı bəzəsin, burax,
Mənim öz xəyalım, öz romantikam!

### I

Uç, mənim, uç, mənim uçağan bacım!
Yetər süründüyün, mehriban bacım!
Düzlərdə ceyran ol, sularda yelkən,
Göylərdə tərlana acıq verərkən,
İstədiyin qədər havalan, bacım!
Açıqdır arzuna asiman, bacım!
Çıxmasın əlindən tutduğun sükan,
İnqilab yavrusu, qəhrəman bacım!

Uç, qovuş göylərə, göylər sənindir,
Sanma yalnız sənin Yer vətənindir.
Bulud çəmən kimi, ulduzlar çiçək,
Gəl bu çiçəklərin ətrini sən çək!
Demək göy də sənin göy çəmənindir
Hər ulduz nərgizin, yasəmənindir.
Bunları qoxlamaq nəsibi ancaq,
Əlini, ağlını işlədənindir.

Uçarkən göylərə min bir həvəslə
Mənim arzumu da könlündə bəslə!
Bir nəhəng ölkənin timsalısan sən,
Yüksələn bir elin xəyalısan sən,
Bütün qadınlığı ardınca səslə!
Səslə, döyüşsünlər köhnə qəfəslə.
Əski nəsil bilir, sərgüzəştini.
İzin ver söyləyim bu yeni nəslə.

Doğuldun Qarabağ ellərində sən,
Gəzmədin sevdanın əllərində sən.
Doğuldun, üzünə baxan olmadı,
Səninçin ürəyi axan olmadı.
Boğuldun göz yaşı sellərində sən,
Bir tumar görmədin tellərində sən.
Ay Səhər, çox zaman yoxsul atanın
Dolaşdın zəhərli dillərində sən.

Atıb anan səni bir qəmli küncə,
Sənə süd verərdi sanki ödüncə[1].
Baxardın hər kəsə gözləri yaşlı,
Çunki sən qız idin, ay başıdaşlı!
Çocuqdun, dərdini duymazdın öncə,
Sən yüz yol ağladın, bir yol gülüncə.
Hər zaman söylənib atan deyərdi:
"Arvad tayfasılə yoxam ölüncə!"

Azmı qadınlığa qaşlar çatılmış,
Oda qurban getmiş, suya atılmış?
Sarılıb əndamı ipək tüllərə,
Azmı diri-diri gömülmüş yerə?
Qadın sürü kimi önə qatılmış,
Qullar bazarında azmı satılmış?
Varaqla keçmişi, görərsən, əfsus,
Qadın hey ağlamış, hey ağladılmış.

**II**

Böyüdün, ay Səhər, sən yastı-yastı.
Sonra hər kəs səni bağrına basdı.
Yıxıla-yıxıla ayağa durdun,
Gecəni, gündüzü artıq duyurdun.
Ay, gün gözlərində bir zərli tasdı,
Göy birini aldı, birini asdı.
Sən də qarğı kimi birdən boy atdın,
Uzun saçların da sanki Arasdı...

[1] *Ödüncə* – burovuz

Atandan nə deyim: atan çobandı,
Qaravaş ananın dərdi yamandı;
Xanım gətirmişdi yazığı cana,
Bu qəmli dastanı söylərkən sana,
Neçin bağrın yanıb, yaşın dayandı,
Qurunun oduna yaşın da yandı?
Neçin ayna sular, aydın üfüqlər
Birdən gözlərində axdı, bulandı?!

O keçən ömrünüz donmuş qar kimi,
Zaman isti əsən bir ruzgar kimi.
Sən də bir xanıma qulluqçu oldun,
O qədər keçmədi gül kimi soldun.
Xanımın hər sözü zəhirmar kimi,
Sən bir quzu, o bir canavar kimi.
Çəkilib xəlvətə uzun gecələr,
Axdı göz yaşların ulduzlar kimi.

Ay Səhər, atanı görüncə təkdir,
Derdin: "Qoy işləyim, ona köməkdir".
İş ağır olsa da qaçan deyildin,
Bir sabah çəkib, aynada bildin
Yanağın xəzəldir, ahın küləkdir;
Küləkdən solmayan hankı çiçəkdir?
Hər yetən nə bilir sərgüzəştini,
Bu dərdi anlamaq, duymaq gərəkdir.
Sana neyləmədi orda qız, gəlin?
Qab-qaşıq yumaqdan qabardı əlin.
Hər zaman xanımın əli yaxanda,
Özün ağırlıqda uşaq arxanda.
Gecə yatarkən də ağrırdı belin;
Tükəndi həvəsin, söndü əməlin.
Hayıf ki, bilmədin çör-çöp də olsan
Alarsan önünü bu azğın selin!

Səhər, uşaqlıqda günmü gördün sən?
Hər gecə bağçada düşünürdün sən.
Ay da bu halına göstərib maraq,

Nurilə zülfünə çəkərkən daraq,
Bir parça göy kimi görünürdün sən,
Pul-pul ulduzlara bürünürdün sən.
Günəşin altında, səhərdən yenə,
Yavru ilan kimi sürünürdün sən!

Mən bilə bilmirəm dərdini səncə,
Kimsə evinizə gəldi bir gecə,
Üz tutub atana dedi: "Ay kişi,
Balana yazığın gəlsin: hər işi
Bir yekə külfətdə, o görür, necə
Dözürsən də buna? Uşağın incə,
Göyərçin qəlbini rəvamı didsin,
Gözün görə-görə bir qanlı pəncə."

Bu acı sorğular verilən zaman,
Başını aşağı salmışdı atan.
Bir acı hiss ilə düşmüşdü dərdə,
Bir şeylər cızırdı əlilə yerdə
Sanki su axırdı qaya alnından,
Başını qaldırıb eylədi üsyan.
Dedi: "Bir ölmədik, qurtulaq, kişi,
Bu qədər tənəyə dözərmi insan?"
O gecə onların yoxdun yanında,
Bir yuxu ağrısı vardı çanında.
Beşiyin önündə gözün axırdı.
Ağırlaşan başın boynunu qırdı.
Küləklər gecənin bu zamanında
Dərdini söylərdi öz kamanında.
Yandı, çıtırdadı qəlbin od kimi
Köküs dedikləri buxurdanında.

Bilsəydin, ay Səhər, sən onda neydin?
Sən gözlərdən düşən bir damcı şehdin.
Kim vardı bağrına səni basaydı,
Uşaq dillərinə qulaq asaydı?
Kim vardı yanında sən əyləşəydin,

Onunla dinləşib diləkləşəydin?
Sən dağlar dibində bir həzin irmaq,
Sən dağlar başında bir xəstə neydin!

Gözlədin, bəzəyin, düzəyin yoxdu,
Deyib-danışmağın, gülməyin yoxdu.
Yoxdu ayağında zərli başmağın,
Yoxdu gül üzündə güllü yaşmağın.
Başında saçaqlı örpəyin yoxdu,
Zərxaran, atlasın, ipəyin yoxdu.
Dəlimi olmuşam, bu söz nə sözdür,
Yeməyə bir qarın çörəyin yoxdu!

**III**

Yenə ötən illər yadıma düşdü,
Səhər, sizin ellər yadıma düşdü.
Dərələr, təpələr, qalın ormanlar,
Dağların üstündən keçən dumanlar,
Çağıldayan sellər yadıma düşdü.
Uğuldayan yellər yadıma düşdü.
Sonra bu aləmi, bu gözəlliyi
Qarışdıran əllər yadıma düşdü.
Çox deyil, on beş il bundan qabaqdı,
O il Qarabağda qandan sel axdı.
Dağlara, daşlara yaman səs düşdü,
Vurhavur, qırhaqır, kəshakəs düşdü.
Türk ilə erməni qanlıbıçaqdı,
Göydə şimşək kimi qılınclar çaxdı.
Aprel inqilabı yetişməsəydi,
Bugünkü qardaşlıq olmayacaqdı.

Sizi əsir etdi bir dəstə daşnaq,
Birisi nağanı şaqqıldadaraq,
Sərdi qan içində ananı yerə,
– Qoy çıxsın yadından həmən mənzərə –
Sonra bir erməni edib əl-ayaq,

"Mən öldürməliyəm bunları ancaq", –
Deyə, alıb sizi gizlin buraxdı,
O Bakı işçisi – o usta Arşaq.

Yenə keçmişini andı Qarabağ,
Nə deyim: bir zaman candı Qarabağ.
Uydu məliklərə, uydu bəylərə,
Bir axşam fəryadı çıxdı göylərə.
Neçin ilqarını dandı Qarabağ?
Pozdu bir əzəli andı Qarabağ?
Musavat atəşi, daşnaq fitnəsi.
Alışdı Qarabağ, yandı Qarabağ.

İnqilab ölkədə qaynadı, daşdı,
Üz-üzə varliylə yoxsul tutaşdı.
Partladı qaz kimi kinlər, acıqlar,
Coşdu ürəklərdə köhnə yanıqlar.
Qırmızı dalğalar dağları aşdı,
Müsavat başını götürdü qaçdı.
Günəş bayrağını bir qızıl əsgər
Bir sabah da sizin dağlara sancdı.

Onda on beş yaşın olardı, Səhər,
Boyun boy deyildi, çinardı, Səhər.
Çox sevərdi yarın, yoldaşın səni,
Yaman bəzəmişdi nəqqaşın səni.
Üzün bir səfalı bahardı, Səhər,
Yerişin bir lətif ruzgardı, Səhər.
Ürəyin bir bahar buludu kimi,
Bir zərif vurğudan dolardı, Səhər.

Hələ bilməyirdin bu gediş nədir,
Çarxını dəyişən bu gərdiş nədir?
Nədir bu vurhavur, nəyin üstədir?
Görürdün insanlar dəstə-dəstədir.
Yenə bilməyirdin, əsil iş nədir,
Şikayət, ərizə, sərzəniş nədir?

Gördükcə ətrafda şiş papaqları,
Deyirdin: "Hökumət dəyişmiş nədir?"

Xanımın da sənə qılıqlanırdı,
Bu haldan gözlərin işıqlanırdı,
Deyirdin: "Özütək heç insan olmaz,
Hayıf, tutması var yazığın bir az".
O, keçən günləri fəqət anırdı,
İçərdən tutuşub qəlbi yanırdı.
O səni burovuz olduğun evdə
Qulluqçu olsan da, xanım sanırdı.

Neçin keçmişinə güldün bu yerdə?
Bilməm, nə məna var bu gülüşlərdə?!.
Yoxsa, gözəl Səhər, utandınmı sən,
Bu dilə gəlməyən sadəliyindən?
Sorma ki, o saya keçmişim nerdə?
Bu qədər sadəlik olmaz bəşərdə!
Keçmişin üzünə, yadında yoxmu,
Tarix necə çəkdi bir qara pərdə?!

Sənə ağangildə xırda uşaqlar
Dedi: "Biz olmasaq, səni kim saxlar?"
Bir gün atan gəlib dedi: "Dur gedək,
Bağlanan qapını açar bu fələk!"
Xanım bilirdi ki, bu şişpapaqlar
Onun busatını dağıdacaqlar.
Söylənib deyirdi: "Hökumət olmuş,
Allah, bu kürkləri yağlı pasaqlar!"

Ah, bu forslu xanım nə acıdildir!..
Uçub indi, Səhər, aləmə bildir!
Aləmə bildir ki, yağlı pasaqlar
Qolunda kürənin hökmünü saxlar.
Uç bacım, hər anın bir şanlı ildir.
Sənin bu sürətin, sürət deyildir...
Sən bir dəmir qala, onlarsa bu gün
Quru bir həyula, boş bir şəkildir!

Bir yeni qəlb çarpır, bu gün sinəndə,
Bir sərxoş kimiyəm nəşənlə mən də.
Nəşəm həqiqətdir, sanma xəyaldır,
Al, bu üfüqlərə məni də qaldır!
Apar, bu arzuma, nazlanma sən də,
Apar, istəsən də, istəməsən də.
O mühəndis qıza, bu doktor qıza
Mən də şeir yazım keyfim gələndə!

Yaşarkən dünyada qorxa-qorxa sən,
Bir uçuş fəxrisən indi xalqa sən.
Sən ey insanlığın böyük yarısı,
Anası, bacısı, qızı, qarısı!
Yarınkı qovğada bizə arxasan,
Dönərsən, uçunca Qərbə, Şərqə sən,
Sehribaz adilə oda yaxılan
Gözəl çoban qızı Janna d'Arqa sən.

Tarix şəninizi etməkdə təqdis,
Ey İskit elinin anası Tomris!
Ah, Key Xosrov sizə yandan baxdısa,
Gözəl oğlunuzu oda yaxdısa
Onun da başını kəsib həmən siz,
Qanlı bir dərəyə diyirlətdiniz,
Dediniz: "Sağ ikən qandan doymadın,
İndi doyunca iç, sən ey müftəris!"[1]

Tarixdə azmıdır böylə qadınlar?
Dostlarım keçmişi varaqlasınlar.
Türk qızı Tahirə nələr yapmadı?
Yazıq, şəriətin əbus cəlladı
Verdi edamına bir axşam qərar.
Şərqin qadınlığı gullü gülüzar,
Anıb Tahirəni, qara baxtıma
Göydə bulud kimi ağlasın zar-zar!

---

[1] *Müftaris* – yırtıçı

Yetər, süslədiyin daş salonları,
Qapansın ömrunün pavilyonları!
Yadına düşməsin hərəmxanələr,
Nələr çəkmiş başın, ey qadın, nələr!
Yetər oynadığın dərd oyunları,
Ey sevimli ana, unut onları!
Fəqət keçmişinə dalıb xatırla,
At minib, yay çəkən Amazonları.

Yetər, xatırlama Yunanıstanı,
Gözəllik tanrısı Afroditanı.
Oxucum, tarixi qarşında susdur,
Nə şeir pərisi, nə də Venosdur
Bizim dünyamızın bu qəhrəmanı;
Özgə bir dastandır onun dastanı!
Bizim gözəlləri, bizim qızları.
Ürəyindən tanı, işindən tanı!

Uç, qadın, uç, qadın, bu nə büsatdır!
Çaldığın qolmudur, yoxsa qanaddır?
Sən ki, bir ov kimi torda yaşardın,
Bilməm bu uçmağı necə başardın?
Sənə zəif demək – cəfəngiyatdır.
Bir az keçmişini ara, aratdır!
Səni müti edən, səni qul edən
Əski məişətdir, əski həyatdır!

Həyat köhnə kəndə saldı yeni dəb,
Bir dağın döşündə açıldı məktəb.
Könüllər açıldı, gözlər açıldı,
Yaşmaq götürüldü, üzlər açıldı.
Etdi məktəb səni atandan tələb,
Bilindi inqilab, bilindi mətləb.
Hər axşam kurslara gedərkən sənə
Təkcə molla Cəbi baxırdı çəp-çəp.

Budur dərsin, işin, budur futbolun,
Doğrudur məqsədin, doğrudur yolun.
Ay Səhər, nə gözəl oxuyursan sən!

Özünü iclasa toxuyursan sən!
Onlara deyirsən: komsomol olun,
Bunlara deyirsən: məktəbə dolun.
Düşünmə boş yerə, ay Qoşqar kişi,
Qızının canı sağ, yoxsa da oğlun!

**IV**

Həyat köhnə kəndə saldı yeni dəb,
Bir dağın döşündə açıldı məktəb.
Yaşmaq götürüldü, üzlər açıldı,
Etdi məktəb səni atandan tələb,
Bilindi inqilab, bilindi mətləb.
Hər axşam kurslara gedərkən sənə
Təkcə molla Cəbi baxırdı çəp-çəp.

Budur dərsin, işin, budur futbolun,
oğrudur məqsədin, doğrudur yolun.
Ay səhər, nə gözəl oxuyursan sən!
Özünü iclasa toxuyursan sən!
Onlara deyirsən: komsomol olun,
Bunlara deyirsən: məktəbdə dolun.
Düşünmə boş yerə, ay Qoşqar kişi,
Qızının ccanı sağ, yoxsa da oğlun!

Səhər, illər keçdi, boy atdın deмək,
Atana əlini uzatdın demək.
Bildin həyat nədir, bildin iş nədir,
Bu gəliş, bu gediş, bu gərdiş nədir.
Atanın dadına tez çatdın demək,
İxtiyar başını ucaltdın demək.
Keçincə könlündən bir incə duyğu
Sevdanın könlünü qanatdın demək.

Şaqraq çocuqluğu yendin, devirdin,
Sən gözəl könlünü bir gəncə verdin.
Vermədin əlindən ixtiyarını!
Gənclik kitabının yarpaqlarını

İki il onunla birgə çevirdin;
Sən onu canından artıq sevirdin.
Qızların içində onun söhbəti,
Onun məhəbbəti olmuşdu virdin.

Sevdaya düşməyən bir həyat heçdir.
İç onu, gör necə sərin atəşdir!
İç onu, iç onu, könlün şən olsun;
Həyatın rəngbərəng bir gülşən olsun
Sevgi gözəlliklə ayrılmaz əşdir,
Biri aydır onun, biri günəşdir.
Sevgini işinə, qəlbinə bağla,
Ömrümüz onunla şəndir, güləşdir!

Cahan bir bağçadır, insan ağacdır,
Məhəbbətsə ona sudur, əlacdır.
Düşün ki, ibtila, dünyada ancaq,
İnsanı eyləmiş donuzdan alçaq,
İnsan məhəbbətə daim möhtacdır.
Tək sanma cismani bir ehtiyacdır.
Ürək bir qönçədir onun başında,
Sevgi şən-şən ötən bir sindivacdır.

Uç, Səhər, uç, Səhər, bizim ölkədə
Aramaz eşqini qadın kölgədə.
Uzaq üfüqlərin altında lakin
Ehtiyac etmədə qadını miskin;
Məhəbbət ləkədə, könül ləkədə;
Həyat ən çıxılmaz bir təhlükədə.
Siyasi dərsində bu həqiqəti
Müəllim söyləmiş sənə bəlkə də.

Artıq, Səhər, səni sevmək qolaydır,
Bir suyun günəşdir, bir suyun aydır.
Tərifin söylənir ellər içində,
Adın şirin-şirin dillər içində.
Deyirlər quzu tək olduqca naydır,

Elçilər qapıda alay-alaydır.
Bir aşiq də səni görüb soruşdu:
"Sənə bu gözəllik haqdanmı paydır?"

**V**

Çəkilib irəli sən də sonrası,
Seçilib olmuşdun bir kənd şurası.
Atılıb iclasda söz danışanda,
Danışdığın sözü düz danışanda,
Qalxardı salonun ura-urası,
Sellərin, suların orkestrosu
Coşarkən bu zaman sənin adına,
Ömrünün xoşuma gəldi burası.

Səhər, gənclik kimi mövsüm də yazdır,
Gündüz sərin keçir, gecə ayazdır.
Axır sellər, sular, bulanır, axır,
Dağların başına dolanır, axır.
Quzeylər hələlik qardır, bəyazdır,
Yaşıl dağ döşləri mehmannəvazdır.
Çobanın çaldığı dağ başında ney,
Aşığın yamacda çaldığı sazdır.

Bu yaz dağda gül, bənövşə içində,
Beş-altı qızdınız nəşə içində.
Ah, o gün nə qədər sevimli gündü!
Birdən qarşıda bir atlı göründü,
Əsdin bir qorxulu rəşə içində,
Qırıldı bir zərif şüşə içində.
Yıxıldın, sabahı özünü gördün
Bir dar mağarada, meşə içində.
Kənd öylə sanırdı, Səhər, o gün sən,
Bəylərlə qoşulub qaçan özünsən.
Sevdiyin Qara da öylə sanırdı,
Hirsindən gözləri alovlanırdı.
Bilməzdin nolacaq, heç kəndə dönsən,

Qaranın gözünə bir də görünsən.
Gör sən nə haydasan, el nə haydadır,
Elinki qiybətdir duysan, düşünsən.

Səni əsir edən Bəylərdi, ay qız!
Sən çəkə bilməzdin bu dərdi, ay qız!
Bəylər, o qolçomaq Ağanın oğlu,
Ürəyi kin dolu, intiqam dolu,
Baxışı sanki bir nəştərdi, ay qız!
O sənə ər olmaq istərdi, ay qız!
Bir yandan iltifat, bir yandan qorxu,
Sənə min bir sifət göstərdi, ay qız!

Atıldı üstünə Bəylər harınca,
Alma yanaqların döndü narınca.
Əlindən sıçrayıb çıxdın quş kimi,
Baxdı bir az sana qudurmuş kimi.
Dedin, qollarını təkrar sarınca:
“Məni sel aparsın sana varınca.
Çəkil, nə istərsən ətəklərimdən,
Ehtiras çölündə gəzən qarınca.”

Duyğusuz, qanına sanki qanıqdı,
Bu zülm deyildi, bu bir yanıqdı.
Dedin: “Ey yaramaz, bu da vicdanmı?
Bədənimdə gəzən qamçı ilanmı?”
O səni yumruqla torpağa yıxdı.
Bütun duyğuların sonuna çıxdı;
Bilmədi heyvanlar, bilmədi quşlar.
Ormanda çəkdiyin nə qışqırıqdı.

Bu qədər qorxulu duzaq olurmu?
Yollar da bu qədər uzaq olurmu?
Ağaran dan yeri bir gümüş kimi,
Sənsə günbatana gömülmüş kimi.
Bu yerdə qol-qanad açmaq olurmu?
Bir qartal olsan da uçmaq olurmu?

İstər dağ qarısı, istər insan ol,
Bu qara zindandan qaçmaq olurmu?

Bir gün Bəylər səni qoymuşdu yalnız,
Çırpınır, dururdu qəlbin aramsız.
Bu vəhşi ormandan uçmaq dilərdin,
Bu qara zindandan qaçmaq dilərdin.
Neyləsin bu yerdə zavallı bir qız!..
Tapdın, bir çobana etdin dil-ağız.
Hardansa bulmuşdun qırıq bir qələm,
Yazırdın qarşında parça bir kağız.

Deyirdin: "Ey qələm, təhrirə gəl, gəl!
Ey quruyan dilim, təqrirə gəl, gəl!"
Ürəyin nə isə çox tələsirdi,
Yazırdın, əlində qələm əsirdi.
Yazırdın: "Ey Qara, tədbirə gəl, gəl!
Bağlanmış kimiyəm zəncirə, gəl, gəl!
Qulağım səsdədir, gözüm yoldadır,
Salma yardımını təxirə, gəl, gəl!

Mənim sevgilimə bircə sözüm var,
Yansam da, qəlbimdə hələ dözüm var;
Od suya düşəndə sızıldamazmı?
Mənim də göz yaşım, atəşim azmı?
Nə gecəm gecədir, nə gündüzüm var,
Başqasında deyil, səndə gözüm var.
Nə qədər əssə də çoşqun küləklər,
Sovda yollarında yenə izim var!

Gözləyərəm sizin sarıdan haray,
Ey sevgimdə məni yarıdan, haray!
Bəylərin əlində bir dustağam mən,
Hələ ölməmişəm, hələ sağam mən.
Haray, haray mənə anrıdan, haray!
Yenə keçdi gecəm yarıdan, haray!
Bilirsən, gözləmək hədərdir indi
Pirdən, peyğəmbərdən, tanrıdan haray!"

## VI

Bəylər öküz kimi yatmışdı sərxoş,
Paltarilə yerə sərilmişdi loş.
Bir daş bulaq kimi qanın qaynadı,
Çəpərdə quş kimi gözün oynadı.
Dedin öz-özünə: “Bu fürsət nə xoş
Əhə, al nağanı ehtirasla coş,
Öldür bu alçağı, çıx bu dərədən,
Bu sirli meşədən azadlığa qoş!”

Sürahi qəlbinə dolmuşdu bir kin,
Əski şərab qədər qüvvətli, kəskin.
Dayandın Bəylərin səssiz yanında,
Acıq atəşləri axdı qanında.
O, xor-xor yatırdı yerində çirkin,
Öldürmək istədin sən onu ilkin,
Qəlbində silməyə həmən bu hissi
Kim sana söylədi titrəyib çəkin?!

Titrədin, silahın düşdü əlindən,
Heç bir şey çıxmadı bu əməlindən.
Nə yaxşı, yuxudan qalxmadı Bəylər,
Qəzəblə üzünə baxmadı Bəylər;
Yoxsa yapışaraq ipək telindən,
Keçirərdi səni bir qan selindən.
Olardı bir üzün şimşəkdən qara,
Bir üzün payızın qəm xəzəlindən.

Ay, Səhər, Bəyləri niyə vurmadın?
Neçin əsdi sənin qolun, qanadın?
Neçin öldürmədin yağını, Səhər?!
İçirmədin ona ağını, Səhər?!
O, aldı ömrünü yenidən satın,
Bu dönüş yolunda niyə axsadın?
Bir bıçaq ağzına düşən quş kimi,
Ürəyin titrədi neçin, ey qadın?!

Düşün, quduz kimi birdən qudurdu,
Böyük rəhbərini bir qadın vurdu.
Ağların qadını böylə yaparkən,
Çaxmağı çaxmadın, bilməm neçin sən?!
Neçin bu həmlədən əllərin durdu,
Duyğun düşüncəni göyə sovurdu?
Səni aciz edən sadə zəiflik,
Onu çırpındıran möhkəm şüurdu.

Çox keçməz, ay Səhər, sən də bəşərsən,
Bu acı səhvini başa düşərsən!
Bilərsən bu döyüş, bu həyat nədir,
Nədir dünyadakı partapart, nədir,
Sən də yavaş-yavaş möhkəmləşərsən,
Döyuş meydanında yaxşı bişərsən.
İşdir, bir qolçomaq əlinə keçə,
İpini gizlicə özün eşərsən.

## VII

O qədər vermədən ara, gözəl qız!
Çatdı harayına Qara, gözəl qız!
Artıq nə iztirab, artıq nə qorxu
Ağalıq etməsin qəlbinə qorxu!
Baxma, düşdünsə də dara, gözəl qız.
Tapıldı, dərdinə çara, gözəl qız!
Söylə, öz gülünü cahan bağında
Bulbül tapşırarmı xara, gözəl qız?!

Qaçmışdı qorxudan üzünun qanı
Əyilib yenidən aldın nağanı,
Səhər, ürkə-ürkə baxıb arxana,
Əlvida eylədin, həmən zindana.
Səmada ulduzlar göz yaşın sanı,
Gördün nur içində bütün dünyanı.
Çıxarkən dişarı ürək dolusu
Qucaqladın səni sevən Qaranı.

Yatırdı hər şeydən Bəylər xəbərsiz,
Qoydunuz üstünə atın yəhər siz.
Minincə sel kimi çıxdı ovuqdan,
Sürəti şimşəkdən, ayağı oxdan,
Dırnağı dəymədən torpağa, yersiz,
Keçdi ömür kimi tozsuz, kədərsiz;
Kölgəniz düşmədən deyirlər yerə,
Keçdiniz, getdiniz burdan, Səhər, siz.

Kopüklər axaraq atın yalından,
Ulduz qığılcımlar qopdu nalından.
Bir qıvrım dumandı, bir qıvrım alov,
Deyirdin Qaraya: "Qov, dalımca qov!
Bəylər hey yağdırsın güllə dalından,
Çıxarmı mindiyin bu at halından?
Külək rəftarını görmüş olaydı,
Kimsə söz açmazdı öz xəyalından.

Demək, sürdun atı Qaradan gözəl,
Olmadı qarşında yoxuşlar əngəl,
Qalmadın sevdiyin Qaradan geri.
Burax, Şərqin, Qərbin alimcikləri
Erkəyi qadına yazsınlar bədəl,
Sən tovla qamçını göydə mükəmməl,
Sanki at üstündə sən bir dumandın,
At sənin altında bir sarı məşəl.

Bir kərə altında büdrəmədən at,
Ay Səhər, mənzilə çatdın salamat.
Mənzilə çatanda sən bilirsən ki,
Bir şərqli karvanın susmada zəngi,
Sənin çarpan köksün durmadı fəqət,
Ürəkdə döyüntün çoxaldı qat-qat.
Bu döyüşdən çıxan kinli köksünün
Telləri çalırdı min bir muğamat.

Sonra kimdi o qız əsəbi, titrək,
Kolxozçu kütləyə yol göstərərək,
Çovğun bir gecədə dağlara çıxdı,

Acıqla qundağı döşünə sıxdı?
Ona salam verdi əsib keçərək,
Dağların başında hayqıran külək.
Kimdi qaçaqlara, kimdi Bəylərə,
O gecə əmr edib yedirən kötək?!

Yapan bu şeyləri səndin, ay Səhər!
Nə qədər o gecə şəndin, ay Səhər!
Bəylərin əlini, qolunu sardın,
Bir baxışla onun bağrını yardın.
Demək, qart yağını yendin, ay Səhər!
Üstünə dağ kimi endin, ay Səhər!
Nə olur, bir az da məndə olaydı
Sənin siyasətin, fəndin, ay Səhər!

Nəşəli səsində qəmli bir ahəng...
Sevincdən göz yaşın axdı rəngbərəng.
Dolambac yollardan çıxdın bir düzə,
İztirablı gecən döndü gündüzə.
Dan yeri alnına hördü bir çələng,
Artıq həyat sənə göründü qəşəng,
Ellər, bir duyğusuz erkək arslanı
Yendi, söyləyiniz, dişi bir pələng!

Könül, keçmişləri hey xatırla sən,
Hey bu yay köksümdən çıxıb fırla sən.
Hey çırpın, hey döyün, hey gül, hey ağla!
Səhərin dastanı sığmaz bu nağla!
Yox, könül, onunçun oxu, yırla sən[1],
Sözlərdən bir yeni mif hazırla sən.
Sözün mənası var, sözün dərdi var,
Gəl bir qılınc oynat, hər satırla sən!

Sən də yüksəl, qadın, bu nə deməkmiş,
Guya saçın uzun, ağlın gödəkmiş...
Zəifmiş deyirlər balıq ətlərin,

[1] *Yırlamaq* – ötmək

Duyduğun dərdlərin, müsibətlərin
Fəqət kim bir dəfə adını çəkmiş.
Guya sənin işin bəzək-düzəkmiş.
Xəbər vermək üçün başarığından,
Oktyabr kimi bir gül gərəkmiş.

Gərəkmiş Leninin çağırışları,
O mətin dühanın hayqırışları.
Onun urəyindən qopan atəşlər,
Ey qadın, üfqundə yaxdı günəşlər!
Yazıq, bir taleyin ələm xışları
Açarkən alnında qəm qırışları.
Nə bilim bir düha doğuraçaqmış,
Hüquqsuz ömrünun acı qışları..

Uç, qadın, uç, qadın, sən nə mələksən;
Nə altun qanadlı bir kələbəksən!
Səni, düşgünlüyə uyanlar ancaq
Ehtiras əlində etdi oyuncaq.
Sən nə hərcayi quş, nə şux çiçəksən!
Nə bizə tor quran bir hörümçəksən!
Sən ey insanlığın ilk əkinçisi,
Dünyanı şənlətmiş, şənlədəcəksən!..

Ey Səhər, qəm basar dünyamı sənsiz,
Tükənər şairin ilhamı sənsiz.
Ey Səhər, ey ana, ey gözəl qadın,
İnan, özün qədər şirindir adın.
Sürdülər o keçən əyyamı sənsiz,
Pozuldu dünyanın nizamı sənsiz.
Keçirmək olurmu, ey yaxşı yoldaş,
Gələcək möhtəşəm bayramı sənsiz!

Ey cəbhə yoldaşım, ey can yoldaşım!
Vaxtilə meydandan qaçan yoldaşım.
Qadın hər cəbhədə böyük qüvvədir,
Bu söz rəhbərimdən bir vədiədir.

Ey göy dənizlərdə uçan yoldaşım,
Ömur yelkənini açan yoldaşım.
Bu uçuş, bu qanad, bu firuzə göy
Sana verilmişdi haçan, yoldaşım?!

Mən səni almadım sadə xülyadan,
Mən səni öyrəndim bizim dunyadan.
Ey böyük həqiqət, ey şirin xəyal,
Ey nazlı göyərçin, ey güclü qartal!
Nə ölüm xofudur qəlbində yağan,
Nə şəhvət qurdudur səni oyatan!
Mənin qəhrəmanım seçilsin gərək
Həm Kleopatradan, həm Ofelyadan!

**VIII**

Doğrudan, nə qədər gözəldir payız,
Ona söyləməyin vərəmli bir qız.
Onun da sevimli bir halı vardır,
Bəlkə bir nəşəli məlalı vardır.
Dostlar, əlinizdən çıxdı yayınız,
Bu gün təbiətdən budur payınız.
Baxarkən göylərə, bir gənc şairin
Buludlu uzünü xatırlayınız...

Solğun təbiətdə bir ayrılıq var,
Baxır yarpaqların ardınca dallar.
Dönmüş kəhrəbaya sular xəzəldən,
Əlində cam tutmuş ruzgar xəzəldən,
Məst olub özünu ətrafa çarpar.
Bəzən də hirsindən buludlar ağlar.
Yaman yerdə çıxdı əlindən, ey gənc,
Eşinlə gəzdiyin kölgəli bağlar.

Bir payız fəslində sən də bir səhər
Kəndindən ayrıldın axır birtəhər.
Gözün hər addımda dala baxırdı,

Lakin içində bir arzu axırdı:
"Görəsən necədir, deyirdin, şəhər?"
Atılıb mindiyin dəmir bir kəhər
Gətirib çıxartdı səni Bakıya,
İlk dəfə şəhəri gördün, ay Səhər.

Bu şəhər Bakıdır, yaxşı bax, ay qız!
Atsın baxışların qol-budaq, ay qız!
Bir bax, nə möhtəşəm mənzərədir bu,
Şərqə ilk açılan pəncərədir bu.
İnqilab yurdudur bu ocaq, ay qız!
Dünyanı eyləmiş çilçıraq, ay qız!
O vermiş, o verir zor nəhənglərə
Ehtişam, dəbdəbə, təmtəraq, ay qız!

Uğulda, ey xəzri, çalxan, ey Xəzər!
Canlansın qonağın qəhrəman Səhər.
Sevirəm qorxulu uğultunuzu,
Coşqun musiqili gurultunuzu.
Ah, məndə olaydı sizdəki təpər,
Görün göstərərdim necə bir hünər!
Bu yaxında bizə gərək olacaq
Şaxlanan dalğalar, qalxan küləklər.

Sevirəm səni mən, ürəyim, qanım,
Düşüncə şimşəyim, duyğu tufanım,
Həvəs çağlayanım bütün sənindir,
Mənim şirin canım bütün sənindir.
Sənindir, ey Bakı, şerim, divanım,
Can evim, can bağım, canlar bağbanım.
Mətin xəyalları üstə döydüyüm
Köküs dedikləri şeir zindanım.

Sevirəm, nə çapuq hərəkətin var,
Xəyala sığmayan əzəmətin var.
Sevirəm, asfaltlı küçələrini,
Sevirəm, ulduzlu gecələrini.

Sənin qaranlıqla ədavətin var,
Hələ bundan sonra qiyamətin var.
Yeni bir əfsanə, yeni bir mifin,
Yeni bir dünyaya məhəbbətin var.

Sevirəm, sevgimin varmıdır sonu,
Fiklrli qızını, alim oğlunü.
Xalqa can deyərək iş görənləri,
Gözəl kəndimizə ruh verənləri.
Sevirəm, mənə çox görməyin bunu,-
Şirvana çəkdiyin şose yolunu,
Belinə sırmalı bir kəmər kimi
Yarın sarılacaq Kürün qolunu.

Sevirəm gördüyün böyük yarını.
Uzun gecələrin iclaslarını,
Tarixdə açılan yeni devirdən,
O böyük plandan, Mingəçevirdən
Öncə xəbər verən el cuvarını,
Güləş insanlığın şən baharını,
Bizim dağ parkında gəzməyə çıxan
Totuqlu gəlini, qızı, qarını.

**IX**

Nədir bu qarşımda yüksələn kulub,
Önümdə heyrətlə boşalıb dolub?
Sevirəm doğrulan həyatınızı,
Ey şura qadını, ey şura qızı!
Bu fağır sözləri ürəkdən bulub,
Neyləyim, olmuşam hissimə məğlub.
Yar məktubu kimi ovcunda sıxsan,
Qəlbimin qanını sızar bu üslub!

Ay Səhər, heyrətlə süzmə kulubu!
Dəyişir həyatın burda üslubu.
Bu sənət ocağı, elm ocağıdır,

Əski yaşayışı vurub dağıdır.
Əli Bayramovun adınadır bu...
Neçin bir heyrətin oldun məğlubu?!
Nələr öyrənməmiş burda, ay Səhər,
Minlərcə Tükəzban, minlərcə Tubu?!

Dəyişdi fəsillər, dolandı illər,
Axdı gah bulaqlar, gah duru sellər.
Burda dərs oxuyub qazandın bilik,
Dedin: "Nə gözəldir təyyarəçilik!"
Bu gözəl sənətə salıb meyillər,
Səhər, üfüqlərə uzatdın əllər.
Siz də böylə olun, böylə yüksəlin,
Səhərdən dərs alın, ellər, ay ellər!

Uç, Səhər, bu uçuş həvəsin gözəl,
Göylərdən duyulan şən səsin gözəl.
Quş kimi müəlləq vuruşun xoşdur,
Gərib qanadını, duruşun xoşdur.
Şair bu barədə nə desin gözəl?
Hər düşüncən gözəl, hər hissin gözəl!
Qoy bilsin bu dünya: çarşaf deyil də
Sənin buludlardır, qəfəsin, gözəl!

Qoy sənin adına qopsun alqışlar!
İnsanlığı sevən səni alqışlar.
Alqışlar sənin də istedadını,
Alqışlar ananı, sevər qadını.
Vüsalınla yazlar, hicrinlə qışlar
Qəlbini həyata, eşqə bağışlar.
Nədənsə ruhuma toxunur bir az:
"Vərəmli çöhrələr, məhzun baxışlar."

Qadın tarixini bir yaxşı yoxla,
Səni kim eylədi əlində kukla?!
Satdın varlığını sadə ət kimi,
Dolmuşkən köksümuz məhəbbət kimi

Ən gözəl, ən təmiz, ən saf duyuqla.
O qəlbi kim vurdu bir acı oxla?!
Kim sənin bükülməz boynunu bukdu
İncidən yapılmış boyunduruqla?!

Uç, yayılsın səsin min bir diyara,
Qəbrində duşməni bassın bir qara!
Qadına dünyada dörd şey gərəkmiş:
Məbədmiş, çocuqmuş, evmiş, bəzəkmiş.
Sən bu laqqırtıya vermə bir para.
Uç, Səhər, Hitler də qalsın avara.
O bayquş bir dəmir xarabalıqdan
Deyir: "Qadın hara, siyasət hara?!"

Uç, Səhər, müstəqil həyatın gözəl!
Qırılmaq bilməyən qanadın gözəl!
Xoşdur bərabərcə əməyin sənin,
Dəyir dünyamıza köməyin sənin.
Yaslıda bəslənən övladın gözəl!
Dəbdəbən, təntənən, büsatın gözəl!
Yeni ailəyə şənlik gətirən
Məhəbbətin gözəl, muradın gözəl!

Siz, ey döyuşlərdə aşıb-daşanlar,
Dostluq məclisində qucaqlaşanlar!
Səhərçin gurlasın hər sevinciniz,
Onunçun yüksəlin ən birinciniz!
Siz, ey "bir az daha" deyib çoşanlar,
Dağ-dağ buludları keçib aşanlar!
O da öylə sanır, onundur bütün
Bu aylar, günəşlər, bü kəhkəşanlar!.

Sanır ki, bu dunya yeni yaranmış.
Bu ulduzlu fəza yeni yaranmış;
Yer günün başına yeni dolanır.
Ay yeni parlayır, gün yeni yaranır.
Sanır Adəm, Həvva yeni yaranmış,

Məhəbbət, macəra yeni yaranmış.
Şair dediyi bu canlı duyğu,
Bu maraqlı məna yeni yaranmış.

Uç, Səhər, uçuşun yeyin olsun qoy!
Qalxdığın fəzalar əngin olsun qoy!
Çalış, uçurumdan çıxar özünü,
O tozdan, qurumdan çıxar özünü.
İşlə, qanadların gərgin olsun qoy!
Cəmiyyət daha da zəngin olsun qoy!
Həyat suya düşən, aynaya düşən
Bir şən işıq kimi rəngin olsun qoy!

Qaşlardan qaşlara süz, romantikam!
Könül sularında üz, romantikam!
Bu əngin sənindir, bu yer sənindir,
Ulduzlar sənindir, güllər sənindir.
Çırpınsın şövqünlə söz, romantikam,
Ey mənim könlümə göz, romantikam!
Bu zəngin varlığı bəzəsin, burax,
Mənim öz xəyalım, öz romantikam!

***1935***

## SINDIRILAN SAZ

### PROLOQ

Mənim qəhrəmanım bir gənc aşıqdı,
Çox acı günlərdə araya çıxdı.
Bağrına basdımı sədəf sazını,
Çəkərdi ölkənin, elin nazını.
Həyat səslənirdi onun səsində,
Üçtelli sazının coşqun səsində
Silsilə dağların suları çağlar,
Bəzən qərib-qərib bir könül ağlar.
Bəzən şaqır-şaqır bir quş ötərdi,
Aşıq olan yerdə elin nə dərdi?!

### I

Yazdır, təbiətdə coşqun bir ahəng,
Dərələr rəngbərəng, dağlar rəngbərəng.
Hönkürub ağlayır göydə buludlar,
Yerdə gülümsəyir çiçəklər, otlar.
Baharın eşqilə çırpınır hər gənc,
Yazdır, gəlin kimi bəzənmiş Xələnc.
Havalar ılıqdır, sınmış soyuqlar,
Çıxmış seyrəngaha qızlar, çocuqlar,
Hər kəsin əlində bir gül dəstəsi,
Sağalar qoxlasa illər xəstəsi.
Qüssə buludları baxışlarında,
Bir söyüd altında, çay kənarında.
"Belə ayrılığa dözmək olurmu,
Bu qədər insanı üzmək olurmu,
Görən bu dağlardan Duman enərmi,
Mənimlə bir yerdə kölgələnərmi?"
Deyə, ürəyində düşünür Sərin,
Fikri qarşıdakı ormandan dərin.
Onun seyrangahı çayın qırağı,
Sular aynasıdır, yellər darağı.
Arxadan bir addım səsi yüksəlir,
Duman tövşüyərək tələsik gəlir.

D u m a n

Sərin, ay qız, Sərin!

S ə r i n

Sənmisən, aman!
Gün günorta çağı, ayıbdır, Duman,
Çıx get!

D u m a n

Qorxma, Sərin, bir kimsə yoxdur,
Bu qədər ürəyin niyə soyuqdur?

S ə r i n

Ayıbdır, ay Duman, görən nə söylər?
Bilsə anam məni, abırdan eylər.

D u m a n

Mən neçin tələsik bura yüyürdüm?

S ə r i n

Yetər ki, bir qədər uzünu gördüm.

D u m a n

Bəs haçan göruşək?

S ə r i n

Gecə gələrsən,
Burda, burda səni gözləyərəm mən.

Ey baba torpağı, ey köhnə Bərmək,
Çətindir şerimdə ruhunu görmək.
Düşmuş kitablara hansı mənzərən,

Bir sirr sandığıdır hər məchul dərən.
Xilqətin füsunlu həyəcanları,
Sevda məhəlləri, görüş anları,
Can kimi sevməli, görməli qızlar,
Gözləri binadan sürməli qızlar,
Gənclər ki, ruhları dağlar qarından,
Hissləri günəşin işıqlarından,
Həsrətli gundüzlər, sonsuz xülyalar.
İşıqlı gecələr, dadlı röyalar,
Göylərə sığmayan parlaq diləklər,
Ulduzdan ulduza uçan mələklər,
Bu ana torpaqdan uzaqlaşmalar,
Göylərdə ətirli qucaqlaşmalar,
Səhər yoldaşlara açılan yuxu,
Dağlara, daşlara saçılan duyğu,
Çoban bayatısı, Kərəm türküsü,
Bir öpüş üstündə bağlanan küsü,
Göz-gözə dəyəndə dəyişən hallar,
Yaxıcı hicranlar, sərin vüsallar,
Ələmdən, nəşədən axan göz yaşı.
Soyuq yanaqları yaxan göz yaşı.
İlk sevda cilvəsi, incə gülüşlər,
Uzaq ulduz kimi qönçə gülüşlər,
Yorğun maral kimi sakit baxışlar,
Bir öpüşdən daha kəskin baxışlar,
Dadlı əfsanələr, gerçək səhnələr,
Səndə nələr yoxdur, nələr, ah, nələr!..
Sən də açılmamış bir dəfinəsən,
Açarı qeyb olan bir xəzinəsən.
Yaranır incilər suda yağmurdan,
Almaz daş kömürdən, radi çamurdan.
Sənin də sərt qışın, yumşaq yazın var.
Oxuyan aşığın, deyən sazın var.
Gecədir, uyuyur dağlar, yamaclar.
Titrəyir yarpağı şehli ağaclar.
Ay göyün üzündə olduqca göyçək,
Parlayan hər ulduz sarı bir çiçək.

Almış təbiəti şirin bir yuxu.
Çağlayır havada səssiz bir qoxu.
Bir xəfif qanadlı ruzgar əsincə
Bu şirin yuxudan səksənir gecə.
Ötürüb köksünü Duman dərindən,
Dünyanın işıqlı cilvələrindən
Ruhlanıb, heyrətlə baxır göylərə,
Bu nə təntənədir, bu nə mənzərə!..
Dalmışkən seyrinə gözəlliklərin,
Burdən qarşısında boylanır Sərin.

D u m a n

Camalını görən, aya dalarmı?
Ulduzlar gözlərin kimi olarmı?
Gözlərin bəzənib süzməsin məni,
Bu qədər süzülüb üzməsin məni.
Qəm kəsib sinəmi budamaqdadır,
Neçin gözəl yarım bu damaqdadır?

S ə r i n

Mən səndən küsmüşəm, orda-burda
Niyə hər yetəni tərifləyirsən?

D u m a n

Ay Sərin, gözümdə, könlümdə sənsən,
Ulusum, oymağım, elim də sənsən!
Hər gün and içdiyim əziz başındır,
İlk bahar dediyim dolğun yaşındır
Mədh etdiyim çinar boyundur sənin,
Büllur axan sular soyundur sənin.
Dan yeri söyləsəm, açıq yaxandır,
Şəfəq – yanağında işıqlı qandır.
Qönçə gül dediyim gül dodağındır,
Yasəmən dediyim ağ buxağındır.

Gözəlsən, gözəldir hər işin sənin,
Əsən dan yelləri yerişin sənin.
Mən səni sevmişəm dünyada yalnız,
Sazımın telləri zülfündür, ay qız!
El də bilir Duman sevir Sərini,
Kim bəyənməz bu mehriban pərini?
Ağıllıdır, duyğuludur, gözəldir,
Başdan-başa bayatıdır, qəzəldir.
Kim əl çəkər bu dünyada yaxşıdan?!
Sarı Nəbi əl çəkdimi Yaxşıdan?!.
Hər aşiqin bir canana meyli var,
Hər Məcnunu dağa salan Leyli var.
Sinəsində məhəbbətin dağları,
Şirin dedi Fərhad çapdı dağları.
Yazıq Kərəm alış deyə, yan deyə,
Od içindən əl uzatdı Əsliyə.
Qərib irdi Şahsənəmə, şad oldu,
Yerlər, göylər dad ustündən, dad oldu!

**II**

Payızdır, bağçalar xəzələ dönmüş,
Təbiət bir solğun gözələ dönmüş.
Təbiətdir bizə şeir söylədən,
Yarpaqlar seçilməz sarı şölədən.
Bir kiçik nəfəs də onlara bəsdir,
Yaranmışın sonu bircə nəfəsdir.
Göy qəm dəryasına batmış sanırsan,
Buludlar qaşını çatmış sanırsan.
Gənclərin sevdiyi gözəl bahardır,
Fəqət hər mövsümün bir dadı vardır.

Xırmanlar döyülüb, yığılmış taxıl,
Fələk dedikləri o namərd paxıl,
Çiləyib yağışı, tökməmiş qarı,
Yarımdır çoxunun buğda anbarı.
Bir kəndli qəmlidir, bir kəndli şaddır,
Yenə bir tərəfdə toydur, büsatdır.

Qovuşmaq istəyir çünki yar yara,
Zurna-qaval səsi düşür dağlara.
Buna həsrət çəkir çox tamarzılar;
Biri başqasına övlad arzular.
Bir ana o birnə deyir qayğısız:
“Oğlundan, qızından görəsən, ay qız!”

Axşamdır, yolları bürümüş naxır...
Kölgəli yollarda toz göyə qalxır.
Axşamdır, ürəyi uçur Xaləncin,
Hər soyuq qocanın, hər isti gəncin
Çalıb-oynamağa şövqü, meyli var.
Çoxu qızışdırıb yenə söhbəti,
Toydur bu axşamkı çənə söhbəti.

Gəl, mənim aşığım gəl,
Məclis yaraşığım gəl!
Səsində el gücü var,
Yel gücü, sel gücü var.
Arxan elə bağlıdır,
Bülbül gülə bağlıdır.
Sözümün başı sənsən,
Gözümün yaşı sənsən.
Dağ məndə, duman səndə,
Dərd məndə, dərman səndə
Mənim ötkün səsimsən,
Ney olsam, nəfəsimsən.
El sədəfdir, sən inci,
Pis günümün sevinci.
Yanğın vardır, suya get!
Toydan çıxdın toya get!

Toğlular kəsilmiş, bir soyhasoydur.
Bu necə büsatdır, bu necə toydur?
Canım, çalan hanı, oxuyan hanı?
Kəsalət qaplayır burda insanı,
Yerində buz kimi donmuş qonaqlar,
Şəklənmiş mollaya sarı qulaqlar.

Deyir Molla Nəcəf tanrıdan, dindən,
Yeddi qat fələkdən, yerin dibindən,
Əlinin, Vəlinin şücaətini,
Həsənin, Hüseynin müsibətini,
Sayır ağladıqca, yaxıcı səslə,
Məclis də dinləyir onu həvəslə.
– Başımız getdi ki, ağzı yumulmuş...
Hardan gəlib çıxdı bu qara bayquş?
Çana doyduracaq bizi axırda.
Altdan-altdan bizə hələ baxır da,
Sanki marıtlayıb oğru bir pişik.
Biz toya gəlmişik? Yasa gəlmişik?
– Ay qız, yum ağzını, eşidər.
– Burax!
Uzun danışmasın bəlkə bu sarsaq,
Bu necə toydur ki, deyib-gülən yox?
Can kimi sallanıb bir suzulən yox?

Qızlar böylə deyir. Eyni zamanda.
Hirsindən qovrulur gənclər bu yanda.
Mollanı duymayır, neyləsin çoban,
Zorlamı ağlasın zavallı insan?
Buna qurddan danış, qoyundan danış,
Başına gətrilən oyundan danış.
Nağıl aç köpəklə qurdun bəhsindən,
Danış sahiblərin haq kəsməsindən...
Danış yalnız keçən geçələrindən,
Anlasın dərindən, duysun dərindən.
Onun düşunduyü həyatı çağır,
Çıx, dağlar başından bayatı çağır.
Aşıq məclisinə çağır çobanı,
Ömrü yalnız keçən fağır çobanı.
Gəl, mənim dağımdan, dərəmdən danış,
Əslinin yolunda Kərəmdən danış,
Ürəyi kövrəlib, gözləri dolsun,
O da xəyalında yansın, kül olsun!

Budur, gənc aşığım girdi içəri,
Bərəldi mollanın paxıl gözləri.
"Bəli, bəli" deyib kəsdi sözünü,
Suçlu adam kimi boğdu özünü.
Yığıb abasının ətəklərini,
Zillədi bir səmtə bəbəklərini.
Dinib danışmadı tutulduğundan,
Çıxınca aşığın saz qoltuğundan
Dəyişdi qəlblərin həyəcanları,
İrişdi canana sanki canları.

B i r i

Aşıq, boş durmağın vaxtı deyildir.
Çalış, öz gücünü bu toyda bildir!

D u m a n

O şənlikdə, bu şənlikdə
Şirin-şirin dil mənimdir!
Ötmə, bayquş, çəmənlikdə
Mən bulbüləm, gül mənimdir!

Sənsiz könlüm ağlar mənim,
Göz yaşlarım çağlar mənim,
Fərhad olsam dağlar mənim,
Məcnun olsam çöl mənimdir!

Duman uymaz sarsaq sözə,
Məhəl qoymaz axmaq sözə,
Kim nə deyir bu sağ sözə,
Mən elinəm, el mənimdir!

Könül dənizləri dalğa-dalğadır,
Sanki sazın səsi bir qasırğadır;
Yelkən xəyalları almış önünə,

Sürür bir əsrarlı sonsuzənginə.
Bu coşqun səsləri eşitməyən yox,
Bizdə, bilən bilir, bu səslər ən çox
Oyadır eşqini ölümsüzlüyün,
Həyatda bir qədər olunca küskün.
Bu səslər ürəyin ovunsun deyə,
Sürükləyir bizi əbədiliyə.
Bir də saz əzəli sənətimizdir,
Elin ruhu kimi səsi təmizdir.
Bunu saz səsinə dalanlar bilər,
Aşıqla baş-başa qalanlar bilər.

Ay keçir, il keçir, dolanır zaman,
Düşməyir kimsənin dilindən Duman,
Cana can eşidir o hər tərəfdən.
Kənd soyumuş kimi Molla Nəcəfdən,
Hörməti azalır el arasında,
Təkdir bayquş kimi xarabasında.
Evindən yığılıb gecə söhbəti,
Onun danışığı, bunun qiybəti.
Deməyir Kərbəla müsibətindən,
İndi insanların məhəbbətindən,
Qəlbindən dəm vuran aşıq Duman var,
İndi hər yığnaqda saz var, kaman var.
El də duyur, görür özünü bunda,
O, can çürütmüşdür sənət yolunda!
Şeirdir ömrünün şirin laylası.
Şeirdir düyünü, şeirdir yası.

Məndən sormayınız nəçidir Nəcəf,
Burda olmalıyam bir az bitərəf:
İşi, – bilən bilir, – miras yeməkdir,
Ara çaxnaşdırıb yalan deməkdir.
Fikri hər gələni qələmə vermək,
Pulunu gizlicə sələmə vermək.
Qışın çilləsində gəlir yazlığı,
Xalqa bəlli deyil danosbazlığı.

Buğdası anbarda bir neçə xalvar,
Zahirdə dövlətdən, maldan nəyi var:
Bir qarğı qələmi, bir qələmdanı,
Əlvan mürəkkəbi – göyərçin qanı.
Kaftar dərisinə duadır yazır,
Hər gun xəyalında bir qəbir qazır.
Ona söhbət açın elin şərindən,
Xoşdur vay xəbəri toy xəbərindən.
Onun yasdan yasa çəkilir adı,
Gözəllər telinə yazaraq cadı,
Yazıq ərkəklərə qurd yağı sürtür,
Hər açıq dəliyə başını dürtür.
Oxuyur arpaya ürəkdən isim,
Düzür hər küpəyə bir dürlü tilsim.
Durmuş fırıldaqla xalqın başında,
Piylənmiş göbəyi xeyrat aşında.
Yamandır son zaman Nəcəfin halı,
Dumanın hər yerdə ötkəm xəyalı
Çıxaraq yoluna bir əngəl kimi,
Durur qarşısında bir heykəl kimi.
Bu qara paltarlı, ağ başlı şeytan,
İtirmiş başını öz qorxusundan.

## III

Qarlı, fırtınalı bir qış axşamı,
Sərinin atası yazıq Bayramı
Salmış molla Nəcəf dili altına:
– Bir yazığın gəlsin öz övladına,
Söylə, zurnaçıya qız verilirmi?
Bütün çalğıların kimsə bilirmi
Günah olduğunu? Cavab ver, cavab!
Özünə yaraşan bir kürəkən tap!
Ağzından süd iyi gələn bir uşaq,
Arvad saxlayacaq? Axmaqsan, axmaq!
Qızının layiqi ağa Dadaşdır.
Varlıdır, səxidir, hər yerdə başdır,

B a y r a m

Qızın meylini də sormaq gərəkmi?
Kim bilir, Dadaşı istəyəcəkmi?
Onun istədiyi, məncə, Dumandır.

N ə c ə f

Kökündən kəsərək atmaq asandır
Bir dal ki, sallana çölə divardan,
Qan çıxır o dalın verdiyi bardan.
Bir də ki, sən fağır, o, qolçomaqdır;
Verməsən, bir əngəl çıxaracaqdır.

B a y r a m

Xoşdur iki başdan olsa məhəbbət,
Bir başdan olursa, olur əziyyət.
Bir də hampa Dadaş bizdən uzaqdır;
Dadaş sərt adamdır, Sərin uşaqdır.
Eh, görək nə olur!..
Nə olacaqdır?
İşlər öz yoluna qoyulacaqdır.
Budur, Molla Nəcəf qarlı yolları
Qovdurub atını, eyləmiş yarı.
Gedir görüşməyə hampa Dadaşla
Gedir məsləhətə min bir təlaşla.
Eşib bığlarını Dadaş dinləyir,
Hirsindən qovrulub qəlbi inləyir.

D a d a ş

Məni rədd eyləmək, cürətə bir bax!

N ə c ə f

Qaçırmaq gərəkdir qızı, qaçırmaq!
Yoxdur bu işlərin başqa çarəsi,

Yoxsa kəndimizin o mehparəsi
Qismət olmayacaq sənə, yaxşı bil,
Yada Bayram kişi qız verən deyil.

**IV**

Camaat yuxudan erkən ayılmış;
Bəs bu xəbər nədir kəndə yayılmış?
Deyirlər: "Bu gecə bir atlı dəstə
Tökulmüş qəflətən Xələnçin üstə.
Bir qız qaçırmışlar? Kimin qızını?
"Aşığın mehriban adaxlısını,
Sərini, Sərini..." Nə yaman xəbər!

Nəcəf götürmuşdür yaxşı ölçülər,
Çağırıb Dumana verir məsləhət:

N ə c ə f

Al bu tapançanı, cəsarətlə get!
Öldür düşmənini, çıx bu ölkədən,
Bəlkə təmizlənsin adın ləkədən.
Hər yetən namusun qədrini bilməz,
Anadan keçilər, yardan keçilməz.
İnsanın qeyrəti hər şeydən başdır,
Sərini qaçıran hampa Dadaşdır.

D u m a n

Quşçulu Dadaşmı?

N ə c ə f

Bəli, quşçulu.

D u m a n

Ah, sənin... Bihəya, binamus oğlu!

N ə c ə f

Topla hövsələni, ağır ol bir az!
Özünü üzməklə heç bir şey olmaz.
Dadaşın əlində adaxlın əsir,
Bu halın hər kəsə etməkdə təsir.
Bu axşam Xələnçi tərk elə, get, get,
Harda düşmənini görsən, həlak et!

Dərd boğur, öldürür qoca Bayramı,
Getdi son ümidi, son sərəncamı.
Əməl bəslədiyi bir qızı vardı,
Onu da qaçırıb Dadaş apardı.
“Bir daha yaşamaq mənə ölümdür,
Bu nə vəhşilikdir, bu nə zülümdür?” –
Deyərək ağlayır zavallı Bayram,
Kimi var, Dadaşdan alsın intiqam?!
Yalqızlıq... hər dərddən bu dərd yamandır!
Qohumu-qardaşı ancaq Dumandır.

O kimdir, bu gecə atın belində,
Xızı dağlarının qarlı çölündə,
Yol kəsir ən iti bir xəyal kimi,
Əyilir, düzəlir beli dal kimi?
Sınırlı sovuruq, acıqlı çovğun
Onun duyğusuna, fikrinə uyğun.
Bir bax, mina kimi donuq göylərə,
Sınıb parça-parça tökülür yerə.
Yel əsir, qar yağır, qaranlıq yağır,
Nədir təbiətdə bu çığır-bağır?!
Onun bu qaçmadan nə dərdi varmış?
Gözündə qorxu yox, yaman çaparmış.
O çapır, qəlbində çılğın həvəslər.
Köhlənin ağzından çıxan nəfəslər
Havada buzlanır qırovlar kimi;
Köhlənin gözləri alovlar kimi.
O da külək kimi sovurur qarı,

Dərin dərələrdən çıxır yuxarı,
Qoy çapsın atını, intiqam alsın.
Qarı düşmənini yenib, kam alsın!
Kəndin mollası da ona get demiş,
Get öz düşmənini həlak et demiş.
O gedir, o çapır, o baxan deyil;
Kəlləsinə vuran qara qan deyil,
Qəlbinin qırılmış ilk sevdasıdır,
O bütün varlığa indi asıdır.

İndi aşığımın günahsız yarı,
Qolçomaq Dadaşın qabalıqları
Qəhrində əriyib sönür şam kimi,
Səhəri dumanlı bir axşam kimi...
Onu istəmədən gətirmiş Dadaş,
O zaman qiyamət edirmiş Dadaş.
Analar əlindən fəryada gəlmiş,
Bacılar diz çöküb, imdada gəlmiş.
Kimsəyi saymamış, vurmuş-dağıtmış,
Başları bədəndən qoparıb atmış.
İndi də aşığın qıymış yarına.
Keçirmiş Sərini ixtiyarına.

Dadaşın evində Sərin əsirdir,
Bu ev nəzərində zindanla birdir.
Şənlikdə olsa da qəlbi bağlıdır:
Bağrı lalə kimi qara dağlıdır.
Köküs qəfəsində kədərli bir quş
Döyünub, çırpınıb artıq yorulmuş.
Dumanın Sərini burada təkdir,
Qəlbi zəncirdədir, dili gödəkdir.

Xızının üstündən görünür Quşçu,
Dağların başında bir kənddir ki, bu,
Bu saat qar basmış, görünməyir heç;
Nolur, gözəl bahar gələcək er-gec,
Yenə şənlənəcək dağlar, dərələr.

Nə borandan əsər, nə qardan əsər,
Aləm məst olacaq gül qoxusundan,
Hər şey oyanacaq qış yuxusundan.
Sərinin bəxti də oyanacaqmı?
Altun şəfəqlərə boyanacaqmı?

Duman gecəyarı Quşçuya girdi;
Güclü qar sovurur, külək əsirdi.
Gəldi bir komanın önündə düşdü,
Yoldaşı Aydınla aşıq görüşdü.
– Bu gəlişim sənə bəllidir, Aydın...
Şübhəsiz, yerimdə sən də olsaydın,
Alardın Dadaşdan öcunü, əlbət,
O mənə göstərdi gücünü, əlbət.
Mən də öz gücümü göstərəcəyəm;
Onun bu zülmünə son verəcəyəm!
O mənim sonamı qapdı gölümdən.

İndi hampa Dadaş mənim əlimdən
Bir dağ olsa belə qurtula bilməz!
Allah da bilir ki, bu dərd çəkilməz!
Mənim qız Sərinim gəlin olsa da,
Bu dərdi daşımaq çətin olsa da,
Əzrayıl hökmü var könlümdə mənim,
Dadaş ölməlidir əlimdə mənim! –
Deyə səhər tezdən Duman geyindi,
Quş kimi sıçrayıb atına mindi.
Hər tərəfdə boran, hər tərəfdə qar,
Uçuşur qanında odlar, alovlar.
Ağzında natamam söz qırıqları,
Boğulur qəlbində hıçqırıqları.
Şərəfi tarimar, qəlbi tarimar,
Üzündən, gözündən ehtiras damar!

Dadaş atlı gedir aşağı kəndə,
Gedir kəndliləri salmağa bəndə.
Gedir verilməyən sələm dalınca,
Gedir lakin onun ədəm dalınca.

Bu işdən Dadaşın xəbəri yoxdur,
Üzündə bir təlaş əsəri yoxdur.
Budur, qarşıladı onu bir nəfər,
Qorxudan Dadaşı basdı vəhmələr,
Əl atmaq istədi yanına, ancaq,
Duman "Al!" deyərək açıldı çaxmaq.
Dadaş at üstündən özünü atdı.
Duman "Al!" deyərək, bir də boşaltdı.
Dadaş səndələyib yıxıldı yerə,
Vəhşi gözlərini yumdu göylərə.

Duman kəndə tərəf atını çəkdi;
O indi Sərinə yetişəcəkdi.
Sərinin Dadaşdan xəbəri yoxdur,
O ürəyidaşdan xəbəri yoxdur.
Bir dustaq nə bilir çöldə nələr var?
İndi əlçim-əlçim təpələyən qar
Burümüş Dadaşı bir kəfən kimi.
Dumanım Quşçuya yetişən kimi
Aydınla bir qədər edib məsləhət,
Sərini yanına gətirdi xəlvət.

D u m a n

Sərin, danış, Sərin! Ah, sənmi gəldin,
Ulduzdanmı düşdün, göydənmi gəldin?
Mehriban nişanlım, göyçək nişanlım,
Vəhşi ceyran kimi ürkək nişanlım,
Tuzağın necədir, genişmi, darmı?
Burdan qurtarmağa ürəyin varmı?
Sərinin əndamı əsdi yel kibi;
Döndü göyərçinə, titrədi qəlbi.
Əydi gözəl-gözəl qərib başını,
Süzdü gözlərinin büllur yaşını.
Köksü dalğa kimi qalxıb enərək,
İpək kirpikləri incilənərək,
Sızladı ürəyi bir kaman kimi,
Dağınıq saçları bir duman kimi...

D u m a n

Gedirsənmi?

S ə r i n

Aşıq, bu nə sorğudur?
Mənim də ən böyük diləyim budur.
Ancaq qorxuram ki, bir əngəl çıxar.

D u m a n

Bu fikri könlündən, Sərin, gəl çıxar!
İndi hampa Dadaş qar altındadır,
Buzlanmış qarların alt qatındadır.

S ə r i n

O, səhər getmişdi aşağı kəndə.

D u m a n

Bəli, vurdum onu yoldan keçəndə,
Bu gecə gedirik, kimsə bilməsin.
Bura gəlməyin də hiss edilməsin.

S ə r i n

Hara gedəcəyik?

D u m a n

Yaradan bilir.
Neçin gözlərindən yaşlar sərpilir?
Dağlara, daşlara, çöllərə doğru;
Burdan uzaq-uzaq ellərə doğru.
Qalın meşələrin, boz dumanların,
Kahların, suların və yarğanların
Qoynunda tanrının azmıdır yeri,
Dəyərmi görməyə bu dinsizləri?

Hər iki mehriban Xələncə çatdı;
Aşığım ölmədi, diri qayıtdı.
Döşünə düşmədi mollanın bu iş,
Dedi: "Zalım oğlu yamanca şeymiş!"
Dedi: "Nə eybi var, gedər sürgünə,
Bir ölumdən daha betər sürgünə.
Nə qədər soyuqdur darısqal qəbir,
O qədər soyuqdur o geniş Sibir".

"Duman, doğrudan da cəsarətin var.
Quvvətin, qudrətin, məharətin var.
Bil ki, şəriətlə qız Dadaşındı;
Neyləyim, sənin də can yoldaşındı.
Sizə kəbin kəsmək doğru deyildir,
Burda etməlisən azacıq səbir".
Deyərək, Dumanı rahat edərkən,
Yazdı pristava bir kağız erkən.

Baxınız, Quşçuda böyuk bir təlaş...
Duman tərəfindən vurulmuş Dadaş.
Mahal pristavı, şişman kəndxuda,
Dadaşın qardaşı, qohum-əqrəba.
Sürdulər atları Xələncə sarı.
Acıqlı gözləri, sərt baxışları
Yanırdı, cəhənnəm kimi yanırdı,
Hirsli ürəkləri alovlanırdı.
Duman tutulmuşdur. Qoca Bayramın
Koması önündə kinli bir yığın.
Dadaşın qardaşı çıxmış özündən,
Gəlir qan qoxusu hər bir sözündən.
Bayram dil çıxarıb yalvarır ona:
– Uşaqdır, Sərini bağışla mana.
O, qız xaylağıdır, günahı varmı?
Tifil bir insanı vurmaq olarmı?
Təkəm, Sərinədir ümidim ancaq;
Məni öldürünüz Sərindən qabaq!
Pristav qabağa atılıb həmən:
– Canım, ölmüşləri öldürməklə sən

Adını batırma, bəri gəl, bəri,
Vurub zingildətmə bu köpəkləri,
Deyərik, Bayramdan həzər etdilər.
Aşığı qabağa salıb, getdilər...

Mehriban aşığım, hara gedirsən?
Hansı iqlimlərə səfər edirsən?
Neçin, neçin sənin bağlıdır qolun?!
Uzaqmı səfərin, uzunmu yolun?
Bizim dağlarımız qalsa Dumansız,
Olmazmı nəşəsiz, olmazmı cansız?!
Sənin bu firqətin kədərlidir çox,
Dalınca su atıb, güzgü tutan yox!
Lakin hönkür-hönkür ağlayır bir kənd,
Kəsilmiş ruhları ney kimi bənd-bənd.
Çox keçmədən yenə gələcək bahar,
Əriyəcək qarlar, coşacaq sular.
Onlar da səninçün ağlayacaqdır,
Lalələr köksünü dağlayacaqdır.
Darğın bənövşələr boynu burulu,
Əlvan çiçəklərin gözləri dolu,
Onlar da jalədən yaşlar tökəcək,
Quşlar ağaclarda fəğan çəkəcək.
Güllərin üstündə bülbülün ahı
Şeh kimi donacaq hər yaz sabahı.
Sular daşdan-daşa başını vurub,
Söyüdlər küsküncə boynunu burub,
Hicran dumanları çöküb dağlara,
Həsrət kölgələri düşüb bağlara,
Əsrarlı ormanlar düşünəcəkdir,
Qəlbi buludların döyünəcəkdir.
Gecə ay doğacaq, rəngi sapsarı,
Göylərin sayrışan şux ulduzları
Buluddan buluda süzüləcəkdir,
Sənsiz taqətləri uzüləcəkdir!
Düşərkən gecələr bu yerdən qaçaq,
Gunəş yaxasını yırtıb çıxacaq.
Göylərin yolçusu durna qatarı

Suzəcək suzdüyün dumanlıqları.
Tərlanlar qonaraq daşlı dağlara,
Kəkliklər yığışıb gur bulaqlara,
Sonalar çaylarda səni anacaq,
Yanacaq, hamının içi yanacaq.
Sızlayıb axacaq yetim dərələr,
Səni axtaracaq bu mənzərələr...

– Getdi, yaman getdi, dərbədər oldu;
O çox zaman mənə dərdi-sər oldu.
On il! Bir igidin ömrüdür on il.
O ki bir də geri qayıdan deyil, –
Deyə Molla Nəcəf gülümsəyirdi.
Ötürüb köksünü "Getdi!" deyirdi.

Ey baba torpağı, ey köhnə Bərmək!
Çətindir şerimdə ruhunu görmək.
Sənin də hər dağda bir macəran var,
İşıqlı baxtın var, sönən çıran var.

Ömrün səksəkəli keçən uyğusu,
Yaşayış həvəsi, ölüm qorxusu,
Sənin də çəkdiyin ağır zülümlər,
Haqsız işgəncələr, haqsız ölümlər,
Sənin də içdiyin qan piyaləsi,
Qulaq asmadığın bacı naləsi,
Sənin də qaynayan ehtirasların,
Bitib-tükənməyən uzun yasların,
Yarımçıq toyların, düyünlərin var,
Ağır qandalların, surgünlərin var.

**V**

Bu dağlardan Duman getdi,
Yaman gəldi, yaman getdi.
Hansı uzaq bir diyarda
Yastığı buz, döşəyi qar,
Qapısını tufan açar.
Ata, ana, qardaş, bacı

Yol gözləyir acı–acı,
Hamı küsmüş sevincinə,
Ana dönmüş göyərçinə.
Yol üstünə qonar, ağlar.
Dərdlərini sanar, ağlar.
Gələn çoxdur, Duman yoxdur.
Gəlməyinə güman yoxdur.
Hələ Sərin, hələ Sərin,
Ürəyində dərdi dərin.
Canı tordur, özü avçı,
Savçı gərək burda, savçı!..
O zamandan üzü gülməz,
Tor çürüyür, tərlan gəlməz.

Ağlama, ağlama, Sərin, ağlama!
Gününü xoş keçir, qara bağlama!
Böyük bir sabaha bəslə umudlar,
Nədəndir başında oynar buludlar?
Gözündən mirvari yaşları süzmə,
Dumandan boş yerə əlini üzmə!
Ya bu gün, ya sabah gələcək Duman,
Dumanın gəldiyi yollara qurban!
Gələcək, səsində ellərin səsi,
Dağların, daşların, sellərin səsi.
Gözdən getməyəcək bir xəyal kimi,
Uçacaq dağlarda bir qartal kimi.
Gələcək, qəlbində yeni duyğular,
Yeni döyüntülər, yeni arzular,

Bayramdır – çarlığın üç yüz illiyi,
Hər yanda vəhşətin əzazilliyi.
Bu gün səadətə bir qara gündür,
Bu gün fəlakətə toydur, dügündür.
Tikənlər açılıb, çiçəklər solmuş,
Qonmuşdur bülbülün yerinə bayquş.
Bu gün ümidlərin söndüyü gündür,
Şərbətin ağıya döndüyü gündür.

Kamanlar ürəkdir, ürəklər kaman,
Ölum hökmürandır, zulüm qəhrəman.
Bu gündən zəncirlər döyülmüş mətin,
Sağlığın əsli yox, əminlik çətin.
Cəhlin əllərində qılınc görürsən,
Ağlın ayağında qara bir tikən.
Ayaqlar altında sərt bir uçurum,
Başların üstündə toz, duman, qurum...
Bayramdır – çarlığın üç yüz illiyi,
Hər yanda vəhşətin əzazilliyi.
Duman bu bayramda azad olundu,
Quş qəfəsdən uçub çəmənə qondu.

Bir gün Duman gəldi çıxdı,
Yenə işi aşıqlıqdı.
Nə işi var onda-bunda,
Bir sazı var qoltuğunda.
Qəlbi sədəf, sözləri dür,
Dinləyəni düşündürür.
El içində adı şirin,
Söhbətinin dadı şirin.
Candan keçir bu məclisdə,
Bu məclisdə, o məclisdə.
Sözündə yox saxta, boya,
Toydan çıxıb, gedir toya,
Eşqə gəlir, çoşa gəlir,
Söylədiyi xoşa gəlir.
Uşaq kimi özü oynaq,
Sazı oynaq, sözü oynaq.
Birdən keçir saz boynuna,
Heyran qalır baxan buna.
Sinəsi dəftər kimidir,
Sözləri xəncər kimidir.
Cahan onda, can ondadır,
Tor onda, tərlan ondadır.
Hər sorğuya cavabı var,
Hər ürəyə xitabı var.

Ayrılıq aradan çıxıb sovuşmuş,
Dumanım Sərinə artıq qovuşmuş.
Fəqət bu vüslətdə bir acılıq var,
Xəzan bağçasından bir dərdli ruzgar
Keçib inildərkən solğun bir budaq,
Yaxud çatır-çatır yanıb bir ocaq
Sızlarkən, ağlayıb Duman hönkürür,
Sanır ki, bu saat Sərin öksürür.
Dumanın Sərini vərəmli, əvət,
Yemiş ürəyini çəkdiyi həsrət.
Sormayın, Sərini incitdilərmi?
Sərinin çəkdiyi başa gələrmi?!
Uzaq təbiətdən, uzaq günəşdən,
Uzaq ürəyində yanan atəşdən,
Sevərkən duyduğu sövdadan uzaq,
Dirilikdən uzaq, dünyadan uzaq,
Hər göz qədəhindən bir zəhər içdi,
Hər zaman üzündə ağladı, keçdi.
Onun siyah saçı buludlar kimi,
Sürdü gəncliyini ixtiyar kimi.
Uzun illər boyu acı qorxular,
Dərin faciələr, ağır uyğular.
Onda, zavallıda can qoymamışdır,
Solğun yanağında qan qoymamışdır.

## VI

Bu axşam Nəcəfə qonaqdır Duman,
Yenə söhbət gedir dindən, tanrıdan.
Məclisdə Xələncin ağsaqqalları,
Ruhlarda qiyamət ixtilalları.

N ə c ə f

Duman, burax sazı, deyirəm buraq!
Yamanca sənətdi bu, gözdən iraq.
Neçə yol demişəm, deyirəm yenə;
Çox da bu dünyanın uyma rənginə.

Düşün, bu sənətin yaman sənətdir;
Bu sənət tanrıya bir məsiyətdir.
Bundadır çəkdiyin bunca müsibət,
Ver sazın yerinə ruhuna ziynət.
Qorxun yoxmu sənin məhşər günündən?
Bu şeytan işini burax bu gündən;
Bir az da axirət qayğısına qal.
Peyğəmbər demişmi Quranda: saz çal?
Onda ki, mizrabı telə vurursan,
Əlinin üzünə sillə vurursan.
Mən bilirəm, sənin gözəl təbin var,
Hərgah ürəyində bir mətləbin var,
Otur mərsiyə de məhərrəmidə.
Cəhənnəm qəmi də, cənnət qəmi də
O zaman büsbütün fikrindən çıxar;
Onsuz da behiştdə nə istəsən var:
Mehtab, rübab, çəmən, min bir fərişqə,
Kim getmək istəməz belə behiştə?!
Büllur qədəhlərdə şərab dalğası,
Eh, bu dünya nədir, sərab dalğası!
Keçək cəhənnəmə, "ləzzət" burda var!
Bir yanda əjdaha, bir yanda şahmar.
Qızğın alovların qələyanları,
Əməlləri saleh olmayanları
Orda özün kimi üryan görərsən,
Qaynar tiyanlarda büryan görərsən.
Yasaq əməllərdən qəlbin pak olsun.
Yaxan haqq yolunda çaki-pak olsun!
Burax, Duman, burax bütpərəstliyi,
Bu məlun sənəti, bu sərməstliyi!
Ürəyin tanrıdan niyə xalıdır?
Bu şeytan əməli qırılmalıdır!

Bir qoca

Aşıq, gözəl düşün, molla haqlıdır.
Onun bu sözləri çox maraqlıdır.
Oğlum, sənin hələ doludur başın,

Qiyamət günündən yoxdur təlaşın.
Bizim dövranımız qəflətlə keçdi,
Məsiyətlə keçdi, zillətlə keçdi.
Çıxdıq anlamadan haqqın yolundan,
Qaçdıq şəriətin qaravulundan.
Nəcəf deyən kimi, bu sazı unut,
Namazını qılıb, orucunu tut.
Bizim boynumuzda günah bir yığın,
Barı olsun sənin o dünyalığın.

N ə c ə f

Bir də eliyirəm məsləhət sənə:
Burda dar keçəcək məişət sənə.
Yenə düşmənlərin axtarır məqam,
Qorxuram alalar səndən intiqam.
Yığış, get şəhərə, yoxsa Dadaşgil
Əl çəkib yaxanı buraxan deyil.

Dumanın məclisə: – Çox gözəl! – deyə,
Başladı ürəyi bərk döyünməyə,
Boynunu buraraq çıxdı dişarı,
Gecənin son bahar qaranlıqları
İçindən keçərək evə yetişdi,
Özü bilməyirdi bu iş, nə işdi.
"Şəhərə getməkmi?" – Soraraq Duman,
Düşünür qəlbində...
                    Ey aşıq, dayan!
Şəhərdə işmi var? Şəhər müztərib;
Dolaşıb şəhəri sən qərib-qərib,
Qara qış qapını aldığı zaman,
Boran pəncərəni çaldığı zaman,
Şaxtalar havanı qoyunca darda,
Sular asılırkən navalçalarda,
Qara, sıxıntılı gecələr boyu,
Almaq istədiyin şirin yuxuyu
Vurub dağıdacaq bir qarlı çovğun,
Ərşə çəkiləcək soyuqdan yuxun,

Dişin bir-birinə çarpıb dəyincə,
Gömgöy ayaqların gizildəyincə,
Bir odun parçası tapmayacaqsan.
Orda da bir yuva yapmayacaqsan!
Yapsan da vücudun mərmərlənərkən,
Onu pəncərəndən içəri girən
Gecə nurlarilə canlatmaq olmaz,
Dərdini deməklə anlatmaq olmaz!

Çəkilib xəlvətə Duman ağlayır,
Sanki dağ döşünə duman ağlayır.
Ağlayır, Sərini çünki can verir,
Məhəbbət yolunda imtahan verir.
– Bağışladı sizə ömrünü Sərin, –
Derkən molla Nəcəf, ürəkdən dərin
Bir ah çəkib Duman, qəlbi sıxıldı,
Özündən gedərək yerə yıxıldı.

Köhnə məzarlıqda bir ağlaşma var,
Qazılır ortada bir dərin məzar.
Çəkdiyi dərdləri, musibətləri,
Uzun həsrətləri, məşəqqətləri
İndi yerli-dibli unutmuş Sərin;
Ölüm dərmanıdır ağır dərdlərin.
Həmən molla Nəcəf, ağ başlı şeytan
Oxuyur əlində bir zərli Quran.
Dumansa ağlayır səssiz kənarda.
Sərinin xəyalı batır sularda:

"Yenə könül düşdü dərdə,
Böylə imiş yazım mənim.
Uçdu getdi, daha bir də
Qayıtmaz şahbazım mənim!

Məni hicran aldı yenə,
Yanar oda saldı yenə.
Ürəyimdə qaldı yenə
Sözüm mənim, arzum mənim!

Duman deyər, haqqa sığın,
Onsuz heçdir insanlığın.
Gunahım var yığın-yığın,
Qoy qırılsın sazım mənim!”

Deyə, ürəyində aşıq yanırdı,
Yandıqca gözləri yağmurlanırdı.

**VII**

O, yatmaq istəyir, yata bilməyir.
Bir xəyal gözündən heç çəkilməyir, –
Mollanın tanrıya yaxın xəyalı.
Duşünur yataqda, dəyişir halı,
Bir zindan kəsilmiş ruhuna dünya,
Gəmirir beynini bir qara xülya.
Payız küləyi də döyür qapını,
Bir əl ürəyinin qırır sapını.
Vəhmə basır onu, tər basır onu,
Ağır düşüncələr əzir ruhunu.
Qalxaraq yandırır qara çırağı,
Qorxusundan əsir əli-ayağı.
Divardakı saza ilişir gözü,
“Doğrudur, doğrudur mollanın sözü.
O mənə çox demiş, çox söyləmişdir,
Bu haqqa üsyandır, bu, günah işdir”, –
Düşünüb xəyala dalır bir ara;
“Bir də, bir də mənə Sərindən sora,
Söhbət nə gərəkdir, saz nə gərəkdir?!
Ürəkdən çıxmayan söz nə gərəkdir?!.”
Deyə, alıb sazı dişarı çıxdı,
Onun xəzəl kimi rəngi qaçıqdı.
Sanki işləmişdi böyük bir günah,
Qopdu ürəyindən bir yanıqlı ah
Daldan qopan sarı bir yarpaq kimi;
Alışdı gözləri bir çıraq kimi.
Bir göylərə baxdı, bir saza baxdı,

Ruhunda bir açıq şimşəyi çaxdı.
Üzündə, gözündə dərin bir həzər,
Baxıb saldı saza acı bir nəzər.
"Doğrudan beləmi? Saz yasaqmıdır?
Yarın sorğu-sual olacaqmıdır?
Əlbəttə, olacaq, buna sözmü var?"
Başında dolaşıq böyük suallar,
Gözundə çəhənnəm-cənnət qorxusu,
İnkirin-minkirin çətin sorğusu...

Amandır, sazını sındırma, aşıq,
Onu bir yar kimi bağrına bərk sıx!
Səni aldatmasın sözü mollanın,
Səni götürməyir gözü mollanın.
O, xalqın ruhudur, ona toxunma,
Elin təmiz duyğusuna toxunma!
Ürək tellərıdir onun telləri,
Güldürən, ağladan odur elləri.
Xəstələr can bulur onun səsindən,
Bir şəfəq süzülüb hər nəğməsindən,
Qaranlıq ruhları işıqlandırır,
Hər sönük baxışda bir od yandırır...
Həyatın ahəngi ahənginlə bir;
Düşün ki, mollanın gördüyü tədbir
Həm sənə, həm elə böyük ziyandır,
O gözəl sazını qırma, amandır!
Onu "qır!" deyənin insafı yoxmu?
Bu yazıq ellərə bir saz da çoxmu?!

Tutub əldə sazı düşünür aşıq,
Onun ruhu kimi gecə qaranlıq.
Anlaya bilməyir öz kədərini,
Ay yırtır gecənin ətəklərini,
Sazın üzərinə bir işıq düşür.
Aşıq baxır saza, üzü pörtüşür.
Ağaclar səslənir, küləklər əsir,
Baxıb donuq-donuq, onu dərd kəsir.

Xışıldayan dallar deyir: “Xoş deyil,
Mollanın öyudü sənə boş deyil”.
“Boşla başındakı bu düşüncəni,
Aldatmasın qara fikirlər səni!” –
Səslənərkən keçən yaxındakı çay
Axıb şırıl-şırıl deyir ki: “Hay, hay...
O gözəl sazını qırma, xoş deyil,
Mollanın öyüdü sənə boş deyil!”
Göyün qapıları açılır tay-tay,
Göstərir üzünü sarı saçlı ay,
O da sanki ona gülüb çəkilir.
Aşığın gözləri saza dikilir.
Xayır, o saf qəlbli, məhzun xəyallı
Aşığım bu saat qəmli, məlallı.
Sazı sındıracaq bir hala gəlmiş,
Fəqət ruhunda bir əziz titrəyiş,
Onun qarşısında bir iri daş var,
Uçur gözlərində qorxunc xəyallar.
Sındırmaq istədi, yenə bir sual
Gözündə, könlündə dayandı dərhal:
“Neçin!” Neçinlərə artıq məhəl yox.
“Sənin günahın çox, məsiyətin çox”.
Düşündü bir qədər, daldı bir qədər,
Qəlbində qorxulu ağır bir kədər.
“Eh!” deyib, sazını daşlara çaxdı,
Sonra həzin-həzin göylərə baxdı.
Sağır göy altında gələrək vəcdə,
Sonsuz bir heçliyə eylədi səcdə.
Ey baba torpağı, ey köhnə Bərmək!
Çətindir şerimdə ruhunu görmək.
Sənin də torpaqda qaynayan dizin,
Acıqlı lənətin, alovlu qeyzin,
Şeytanın, mələyin, üzrün, günahın,
Yer üzundə ağan, göydə Allahın,
Sənin də dərd çəkən insanların var,
Qırılan sazların, kamanların var!

O gündən bir mahal qaldı aşıqsız,
Könüllər işıqsız, gözlər işıqsız.
Xələncdə kədərli bir hərəkətlə
O gündən məscidə üz qoydu kutlə.
O gundən Nəcəfin könlü açıldı,
Gözlərdən od kimi yaşlar saçıldı.
Nəcəfin məclisi boşaldı, doldu;
Kəndlilər büsbütün aşıqdan oldu.
O gündən sarıqlı çıxdı ərsəyə,
Yaxşı rəvac tapdı növhə, mərsiyə.
Hətta pul yığaraq, tədbir tökdülər,
Yenidən bir gözəl məscid tikdilər.
Ellərin şənliyi keçdi aşıqsız,
Könüllər işıqsız, gözlər işıqsız?

**VIII**

Uçdu oylağından tərlanım mənim,
Çəkildi dağlardan Dumanım mənim
Gəldi, iş dalınca şəhərə gəldi,
Ağır dərdlərindən xəbərə gəldi.
İşlədi Naftalan mədənlərində.
İşçi dostlarına günün birində
Danışdı dərdini aşığım mənim,
Yenidən parladı işığım mənim.
“Biçarə, sadədil, zavallı aşıq,
Danışma bu sözü, danışma artıq!
Mollanın sözünə niyə uyurdun?
Niyə öz sazını daşlara vurdun?
Məqsədi bəllidir onun bu işdə,
Yaxşı qazanmışdır məlun bu işdə.”
Deyərək aşığı başa saldılar,
Yenidən Dumana bir saz aldılar.
O gündən gəzərək ellər içində,
Dəyişib bu uzun illər içində,
Dağlardan aşığın gəlir avazı,
İşçilər diriltdi ölən bir sazı.

Bir az, qəhrəmanım, məni də dinlə!
Mən ki əzəl gündən dostam səninlə.
Müzlüm ümmanından çıxdın o kəndin;
Sən onu vaxtilə sevdin, bəyəndin.
Çayır quşlarına döndü düşüncən,
Sənlə faydalandı hər gəlib keçən.
Sən bunu bilmədin, sonra anladın:
Saya keçmişini söyüb, danladın.
Sonra onlar sənə gör nələr etdi;
Sevgilin də getdi, sazın da getdi.
İndi qabaqdadır yeni döyüşlər,
Çağırır sazını, səni doyüşlər!
Yenə haraylayır təbiət səni,
Həyat, mübarizə, məişət səni.
Sazını qaytardı işçilər sana,
Aşıq, oxusana, aşıq, çalsana!
Aşıq, işçilərin sazıdır bu saz,
Döyüşlərdən çıxan bu saz qırılmaz!..

## EPİLOQ

Mənim saz dediyim o deyil fəqət,
O, təhqir olunan bir mədəniyyət,
Qırılan bir könül, dərdli bir xəyal,
İnsanın çəkdiyi dərin bir məlal,
Çeynənən bir şərəf, susan bir ağız,
Ayrılan qurbanı – vərəmli bir qız,
Bir ana şivəni, bir el qayğusu,
Bir el şairinin təmiz duyğusu
Və onunla gedən bir öcəşmədir,
Bir quru səhradan çıxan çeşmədir.

*1936*

## BURUQ ADAMI

### I

Buruqları göylərə boy atan bir diyarın,
Uzümüzü dünyada ağardan bir diyarın
Bir təsadüf üzündən gedib yolçusu oldum.
            Onu seyrə qoyuldum.

Gecəydi... Yox, ətrafı görən gündüz sanırdı,
Baş ucumda gözlərim kimi alovlanırdı
Kiçik-kiçik günəşlər bir dərin ehtirasla,
            Bir sərin ehtirasla.

Qışqırıqlar çıxırdı qazılan quyulardan,
Dirəklərin ucundan asılan quyulardan.
Ən davamlı qatları dişləyirdi baltalar.
            İşləyirdi baltalar.

Hərləndikcə bir dəmir sütun vəlvələsilə
Arayırdı, məndəki bir həycana vəsilə.
Bu dəhşəti uzaqdan alaymı sandın, könül?
            Qolaymı sandın, könül?

### II

Buruğun içində beş-altı fəhlə,
Həpsi bir-birilə vermiş əl-ələ.
Həpsi nəşəlidir öz əməyindən,
Bu yerdə nişan yox həsəddən, kindən
Bu yerdə çınlamaz boş danışıqlar,

Gözlərdə parlayır xoşbəxt işıqlar,
Həpsi əməkçidir, həpsi zərbəçi;
Həpsinin maraqla çalxanır içi.
Görüncə bunları köksüm qabardı,
Duyğum qanadlandı, hissim qabardı,
İstər yaşıl göylər, istər şəhərlər
Durmadan irəli qoşsa da əgər,
Yenə də mədəndə bir başqalıq var,
Burda hərəkət var, qalabalıq var,
Doğru, şəhərlərdə gediş-gəliş çox,
Zəhmət, əziyyət çox, sürətli iş çox.
Fəqət köhnə hayat lövhələrindən,
Sürgün bir aləmin səhnələrindən
Hələ şəhərlərdə nişanələr var,
Ürək bulandıran əfsanələr var.

İştə bax, bir yanda şubay buruqlar
Doğurur başımda süslü duyğular.
O yanda sırayla işçi evləri
Bəsləyir içində həyat divləri.
Bax, ordan – kulubdan çıxdı bir yığın,
Həpsi bir dalğalı sel kimi daşğın,
Daldıqca bu insan nəhirlərinə,
Yeni sosializm şəhərlərinə
Uzaqdan uzağa gözüm sataşdı,
Ürəyim oynadı, xəyalım çaşdı.
Mədəndə dalğasız mazut gölləri
Açır qoxusilə dar könülləri.
Dirəklər başında yanan çıraqlar,
Alışıb-yanmağı qanan çıraqlar.

Sərdikcə göllərə nurdan bir xalı,
Dəyişir göylərin büsbütün halı.
Ulduzlar saralır paxıllığından,
Rəng verir, rəng alır paxıllığından.
Əgər sorsan: – Həyat hansı yerdədir?
Derim: – Zavodlarda, mədənlərdədir.

## III

Şura mühəndisi yanımda durmuş,
Bəlli, təbiətə bir kələk qurmuş
Mühəndis danışır açarçısilə;
Dondum açarçının açdığı dilə.
Başım çıxmayırdı söhbətlərindən,
Bunların qarışıq lüğətlərindan.
Bir sütun ortada hərlənmədəydi,
Zəncirli təkərlər hirslənmədəydi
Qəfəsdə çırpınan bir arslan kimi,
Bəzən də qıvrılan bir ilan kimi.
Qorxunc bir uğultu, qorxunc bir səda
Çınlayıb, dururdu əsən buruqda.

## IV

Yanımda bir işçi pək həyəcanlı,
Dodaqları basıq, gözləri canlı;
Baxmada həsrətlə işləyənlərə,
Həvəslə, cürətlə işləyənlərə,
O, bir il vardı ki, açarçılıqdan
– Bəlkə istəmədən – olmuşdu azad...
Ayırdılar bir gün onu buruqdan,
Qurdu kəndisinə başqa bir həyat.
İyirmibeş bahar, iyirmibeş qış
Buruqlar içində açdı gözünü.
Bir gün qopdu ona iclasda alqış.
Başqa bir vadidə gördü özünü.

Keçirtdilər onu demək bir axşam
Cismani zəhmətdən, əqli zəhmətə,
Sönmədi ondakı əski ehtişam,
Ürəklə girişdi yeni xidmətə.

Əlli yaşı vardır, hala bu sində,
Yorulmamış onun əmək şəhpəri

Mədəni maarif vəzifəsində
Çalışır, çarpışır o gündən bəri.
O, səssiz baxmada.. fəqət yerində
Başqa bir işçinin durmuş əlləri.
Qalın qaşlarının ətəklərində
Axmada simsiyah mazut selləri.

– Bax, – deyir, – ömrümün çox zamanları
Rəngin lövhələri keçmiş bu yerdə.
Bu yerdə ömrümü etmişəm yarı,
Bu yerdə batmışam nəşəyə, dərdə.

İidi ayrı işdə çalışmaqdayım.
Bilməm bu mədəndə nə var ki, daim
Burada ürəyim döyünmək istər,
Boylu buruqlarla öyünmək istər.

Bu saat, qarşımda qopan vəlvələ
Mənə bir musiqi qədər xoş gəlir.
Sardıqca dövrəmi qorxu, zəlzələ
Köksüm qanadlanır, duyğum yüksəlir.

Bax, mənim vəzifəm açarçılıqdır;
İllərcə feyz aldım mən bu gedişdən.
Bilməyirəm məndə bu nə qılıqdır
Ki, xoşlanmayıram heç qeyri işdən.

Mənimlə çalışan çox işçilər var
Ki, həpsi çəkilmiş irəli, onlar,
Onlar çalışırlar ağıllı-başlı;
Həpsi zərbəçidir, həpsi təlaşlı.

Fəqət mənim könlüm bu ehramların
Üstündə çırpınıb, seyr etmək istər.
Ordan səhərlərin və axşamların
Çapqın həyatını seyr etmək istər.

Mədəndən çıxmağım qət edilirkən,
İclasda bilsəniz necə sıxıldım!
Fikrim qanadlanıb uçmaq dilərkən,
Sanki göy üzündən yerə yıxıldım.

Mənim işim budur: cismani zəhmət;
Başqa zəhmətlərə bənzəməz, əvət.
Mənə qoldan danış, biləkdən danış,
Durmadan döyünən ürəkdən danış!

**V**

O susdu. Mən ona heyran kəsildim,
Təbii, onunla şərik deyildim
Bəzi ayrı-ayrı məsələlərdə.
Ona sual verdim durduğu yerdə:
– Bəlkə işin səni çox yordu, əmi?
– Xeyra, iş o deyil, mən vəzifəmi
Olduqca yerinə yetirməkdəyim,
Mənfəətsiz deyil hələ əməyim.
Fəqət mədənlərə gəldiyim zaman,
Yüksəlir başımda yüngül bir duman
Torpağın ödünü yaran buruqlar,
Yerin damarını soran buruqlar
Dəyincə gözümə, dəyişir halım,
Dolanır, başımda dönür xəyalım.
Hələ istəyirəm – elə birbaşa –
Soyunub girəyim yenidən işə.
Rahat zamanlarım, yorğun günlərim,
Dalğalı günlərim, durğun günlərim
Bu yerdə keçmişdir. Odur ki, daim,
Daim bu şənliyi aramaqdayım.
Fəqət bir məsələ... çünki mən bu gün,
Bu gecə, maraqla baxıb gördüyün
Şubay buruqlara heyran kəsildim,
Özümü bir başqa aləmdə bildim.

Sanki gözlərimə pərdə çəkildi,
Hissim şüuruma hakim dikildi.
Ancaq bu gün məni irəli çəkən
Qardaşım işçilər bilsinlər ki, mən,
Nə qədər gəlməmiş yorğunluq çağım,
Hər bir vəzifəni daşıyacağım.
Bu yeni işimdə qalacağam mən,
Mədəni bir işçi olacağam mən.

İşçimiz sözünü bitirdi getdi,
Məni həyəcana gətirdi getdi.

***1930***

## COĞRAFİYA

Əhməd, Güllü, Sara, Bəbir
Dərslərini yaxşı bilir.
Bunlar üçün coğrafiya
Dərsləri bir böyük bəla...
Axır sülüs imtahanı
Gəlmiş... hazırlaşan hanı?
Girmiş müəllim sinifə
Hamsı qalmış baxa-baxa...
Müəllim söyləyir: – Sara,
Kür nəhri tökülür hara?
– Kür nəhrimi? Ağ dənizə,
Tökülmədə gəzə-gəzə.
Müəllim söyləyir: – Güllü,
Haradadır Göycə gölü?
Güllü barmaq qaldıraraq,
Xəritəyə baxmayaraq,
– Moskvanın yanındadır.
Əhməd deyir: – Xayır-xayır,
Göycə gölü İtaliyada...
İçində vardır bir ada.
Demək bu da bilməyirdi,
Bəbir dəxi əsnəyirdi.
Müəllim də səslənərək,
Dedi: – Bəbir, söylə görək
Kazbek dağı harda olur?
Bəbir haman məğrur-məğrur:
– Kazbek dağı Himalay
Dağlarının arasında
Olan böyük bir təpədir.

Hey səyyahlar gəlir-gedir.
Yoxdur çıxan zirvəsinə,
Onun qarlı təpəsinə.
– Əhməd! Sən də Naxçıvanı
Haydı bizə göstər hanı?
Baxdı Əhməd xəritəyə,
Getdi çıxdı Fransaya.

Qış qocaldı, gəldi bahar,
Çiçəkləndi, çəmən gülzar,
Güllər açdı, çiçəkləndi
Kələbəklər bənəkləndi.
Aydınlaşdı göyün üzü,
Yaşıllandı dağın düzü.
Göy üzündə uçan quşlar
Başqa yerə köçən quşlar;
Dəstə-dəstə gəlib bizə,
Səs saldılar dağa, düzə.
Tətil vaxtı gəldi demək,
Tələbələr dincələcək.
Yayılmışdı böylə xəbər.
Amma bu il tələbələr
Çıxacaqdır səyahətə.
Uşaqlar oldu dörd dəstə.
Kür qırağın gəzdi Sara;
Bildi Kür axır Xəzərə.
Güllü dəxi İravana
Getmiş idi qana-qana.
Bilirdi ki, Göycə gölü
Nə yerdədir, bizim Güllü.
Bəbir dəxi gəzə-gəzə
Gedib çıxmışdı Tiflisə;
Gəzib gürcü torpağını
Bilmişdi Kazbek dağını.
Əhməd dəxi bir dəstəylə
Getmiş idi Naxçıvana.
Bahar gedib, gəlmişdi qış.

Hamı məktəbə toplanmış.
Əhməd, Güllü, Sara, Bəbir
Dərslərini yaxşı bilir.
Xüsusilə çoğrafiya
Dərsindən aldılar əla!

***1929***

## MƏKTƏBLİ ŞƏRQİSİ

Bizik maarifin güləş ordusu!
Aydınlıq ordusu, günəş ordusu!

Bizim nə tanrımız, nə qulumuz var,
Sosyalizmə çıxan bir yolumuz var,
Dərsimiz, işimiz, futbolumuz var,
Bizik maarifin güləş ordusu!
Aydınlıq ordusu, günəş ordusu!

Qələm silahımız, səngər sıramız,
Yarasa düşməni basmış qaramız,
Dəmir, beton kimi sıxdır aramız,
Bizik maarifin güləş ordusu!
Aydınlıq ordusu, günəş ordusu!

Birinci dərsimiz – İnternasyonal!
İkinci dərsimiz – burjuya siqnal...
Üçüncü dərsimiz – ölür kapital...
Bizik maarifin güləş ordusu!
Aydınlıq ordusu, günəş ordusu!

Bizimdir kainat, bizimdir həyat,
Bizimdir yuksəliş, bizimdir qanat,
Bizimdir mətanət, bizimdir səbat.
Bizik maarifin güləş ordusu!
Aydınlıq ordusu, günəş ordusu!

***1933***

## ZƏHRA ÜÇÜN[1]

İləri qoş, ilərii,
Ey mənim gözəl qızım.
Qalma həyatdan geri,
Oxu mükəmməl, qızım.

Uca dağlardan atlan,
Hər çətinliyə qatlan,
Bir quş kimi qanatlan,
Göylərə yüksəl, qızım!

Mehriban ol insana,
Bir yuxarı baxsana,
Göydən günəş, ay sana,
Eyləyir "gəl, gəl", qızım.

***1934***

---

[1] Vaxtilə M.Müşfiqin şagirdi olmuş tibb elmləri doktoru Zəhra Salayeva beşinci sinifdə oxuyarkən sevdiyi müəllimlərinə xatirə üçün avtoqraf yazdırarmış. 11 mart 1934-cü ildə Müşfiq dərsə gələrkən Zəhra utana-utana ona da belə bir xahişlə müraciət edir. Müşfiq albomu gözdən keçirərək:

– Yaxşı, qızım, sən get sinif jurnalını gətir, mən də səninçün bir şey yazaram, – deyir.

Zəhra müəllimlər otağından jurnalı gətirənəcən şair də bir neçə dəqiqənin içində həmin şeri yazır.

## QAYA

### B A Ş L A N Ğ I C

Dostlar, gəlin sizə mən bir həyatdan,
Başqa bir aləmdən, bir kainatdan
Açım bir maraqlı, həqiqi səhnə.
Endir, ey xəyalım, ey fikrim, yenə
Özünü həyatın dənizlərinə!
Ordan dəyərli bir sədəf yerinə
Əlinə keçsə də bir çınqıl daşı, –
Sevindirmək üçün yarı, yoldaşı, –
Bu da bir əməkdir, bu da bir işdir,
Tarix ki, duz-çörək itirməmişdir.
Döyün, ey ürəyim, döyün dəmbədəm!
Alovlan, ey kağız, alış, ey qələm!

### I

Yirmi üçüncü il, mayis günləri...
Göylərin yosması o gözəl pəri
Odlu baxışlarla axır, süzülür,
Axşamkı ayazın canı üzülür.
Olduqca nəşəli bir incə gündüz,
Sabir bağçasında bir neçə öksüz...
Yayılmış aləmə Qayanın səsi.
Nə qədər şirindir bu el nəğməsi!

Q a y a

Gözəl səhər, gözəl hava,
Zalım ovçu çıxdı ova.
Ceyranımı qova-qova,
Atdı vurdu, qan eylədi,
Çatdı vurdu, qan eylədi.
Ceyranımın gözü şəhla,
Onsuz keçər günüm ahla.
Zalım ovçu min günahla

Vurdu ürkək ceyranımı,
Ruhu ipək ceyranımı.

Ay pusquda yatan ovçu,
Yaman güllə atan ovçu,
Əli qana batan ovçu,
Artıq yetər, qan eyləmə,
Bu qədər tufan eyləmə!

O xalq müəllimi, qoca qəhrəman,
Keçərkən bağçadan daldı bu səsə.
O bilik mədəni, o böyük insan
Daldı düşüncəyə, qapıldı hissə.
Oturdu ən yaxın bir iskəmləyə,
Onlara bir dərin həsrətlə baxdı.
“Sonu nə olacaq bunların?” – deyə,
Həsrətlə, diqqətlə, heyrətlə baxdı.

Qaya oxuyurdu, Mişka çalırdı,
Biri oynayırdı şirin “Qaytağı”.
Müəllim bir acı ləzzət alırdı,
Nədənsə tutqundu qaşı-qabağı.
O, bir heykəl kimi durmuş yerində,
Keçirir gözündən qorxunc şəkillər.
Sonsuz fəlakətin dənizlərində
Bu əl-ayaq çalan kiçik səfillər,
Sən ey çocuqluğun şanlı rəhbəri,
Yoxsa var bunlara sualın sənin?
Qarşında çırpınan bu tifilləri
Haraya çəkməkdir xəyalın sənin?
Hankı bir həvəslə ey bilik əri,
Bunlara könlünü verməyə gəldin?
Bu başsız, bu sınıq təknəcikləri
Hankı bir sahilə sürməyə gəldin?..
Bayaqdan oynayan, qışqıran, çalan,
Çılğın nəğmələri göyə ucalan,
Bu dəstə tərpənib qalxdı yerindən,
Müəllim onları süzdü dərindən.

M ü ə l l i m

Bala, o şərqini söylə, mən yazım.
Rica eyləyirəm.

Q a y a

Rica nə lazım?

*(Yoldaşlarına)*

Uşaqlar, siz gedin, mənim işim var.
Lakin son yeriniz olmalı bulvar!

*(Qaya bir-bir dedi, yazdı müəllim.)*

M ü ə l l i m

Başqa bir nəğmən də varmı?

Q a y a

Nə bilim...

M ü ə l l i m

Yaxşı o nəğmə də qalsın sonraya
Sənə bir sualım vardır, ay Qaya!
Atadan, anadan söylə nəyin var?

Q a y a

Çoxdan gömülmüşdür torpağa onlar,
Üzlərini belə görməmişəm mən.

M ü ə l l i m

Harda yaşayırsan, nə iş görursən?

Q a y a

Bir az yaxşı deyil işimin adı,
Bir cür keçirirəm mən də həyatı.

M ü ə l l i m
Məktəbə getməyə həvəsin varmı?

Q a y a
Ay əmi, heç onu soruşarlarmı?
Bax, mənim məktəbim bu küçələrdir.
Aldığım təlimsə sizə zərərdir!
Mənim teatroya çox marağım var!
Böyük çarpışmalar, qızğın davalar
İnsan sürdüyü ömrü andırır,
Adamın qanını alovlandırır.
Yenə keçən gecə "İblis"ə getdim,
Bilsən nələr gördüm, nələr eşitdim!
Orda bəyəndiyim bir yaxşı söz var:
"Biz dağlara hökm edən krallar".
Mən kiməm? Küçələr kralı Qaya.
Aşiqəm kinoya, həm teatroya.

M ü ə l l i m
Səni teatro qəmləndirirmi?

Q a y a
Mənim bu ürəyim daşmı, dəmirmi?
Mən də bir insanam, qəlbim, qanım var.
Vücudumda sel-sel həyəcanım var.
Bir gün yolum yenə düşdü "Aydın"a,
Bir kimsə qalmamış onun qaydına.
Məni doğrudan da ağlatdı Aydın,
Sən də dayanmazdın, orda olaydın.
Eh... Aydın dəlidir, o lap uşaqdır,
İşi gecə-gündüz sızıldamaqdır.
Tökür acığını makinələrə!
Sıxıb yumruğunu vuruş bir kərə!
Onun qapıldığı boş-boş xəyaldır,
Məncə, Dövlət bəyin qanı halaldır.
Əkşi, qurban olum bolşeviklərə!
Onların ipini eşdi bir kərə.

M ü ə l l i m

Sən ki bu şeyləri bilirsən, niyə
Bir son qoymayırsan bu səfilliyə?

Q a y a

Mən öz ürəyimi sıxa bilmirəm,
Bir tordur düşmuşəm, çıxa bilmirəm.
Bir də yoldaşlarım, yaranlarım var,
Onlarla əhdim var, peymanlarım var.
Bilirəm bu yolun sonu qazıqdır,
Bu yol yolçuları hamsı yazıqdır.
Nəysə, bir şey bizi yeyir qurd kimi,
Ömrümüz tez keçən bir bulud kimi.
Bu yolun sonu bir qorxunc enişdir,
Bu da bir həyatdır, bu da bir işdir.

M ü ə l l i m

Heç savadın varmı?

Q a y a

Bir azacıq var.
Qoymadı artırım bizim bu dostlar.
Bir gun bu Kommunist küçəsində biz
Gördük dövrəmizdə iki-üç milis,
Surüylə qabağa saldılar bizi;
Çocuqlar evinə aldılar bizi.
Bilirsən, insanlar başqa-başqadır;
Ordan öncə qaçan bizim Mişkadır.
Bu aləm olmuşdu bizlərə zindan,
Bir neçə yoldaşım qaçdı sonradan.
Mən qaldım iki il, oxudum bir az,
Deməklə hamsını qurtarmaq olmaz;
Sonra yoldaşları böylə görüncə,
Əkildim oradan mən də bir gecə.

M ü ə l l i m

Ay oğul aləmə yaxşı nəzər qıl,
Sən gəl bu dəstədən biryolluq ayrıl!
Onların gözünə görünmə bir də.

Q a y a

*(düşünərək)*

Bir gün çürüyəcək ömrüm Sibirdə.
Bilirəm bu həyat, bilirəm nədir,
Bir qanlı meydandır, acı səhnədir.

M ü ə l l i m

Bilirsən, uzaq ol, axırın heçdir.
Topla iradəni, sanma ki, gecdir.
Bax, mən müəlliməm, dinləsən məni,
Aparıb qoyaram məktəbə səni.
Bu çirkin işlərə bir son qoyarsan,
Orda həm işlərsən, həm oxuyarsan.

Q a y a

Qoy bir fikirləşim.

M ü ə l l i m

Yaxşı, fikirləş.
Ancaq yaxşı düşün, yaxşı fikirləş!
Adresim də budur... bizə gəl sabah.
Açarkən mən sənə bir yeni şəhrah,
Böyük insanlara qarışacaqsan,
Onlarla həyatda yarışacaqsan.
Qızğın səfalətin çoraq çölləri,
Dalğa-dalğa axan bu selləri.
Çox çəkib özünə məhv eyləmişdir,
Həyatda çoxları səhv eyləmişdir.
Xəta əl verməmiş bu insanlığa,

Sürükləmiş onu pərişanlığa.
Oğul, al əlinə ixtiyarını,
Bu müdhiş aləmin kabuslarını
Əlinlə, ağlınla sil gözlərindən,
Həyatı düşünüb anla dərindən.
Sabah gəl mənimlə gedək bərabər,
Qaranlıq yoluna doğsun günəşlər.

## II

Müəllim gözlədi, Qaya gəlmədi.
Deyən faydasını yenə bilmədi.
Müəllim gözlədi, kim bilir, Qaya
Qapılmış hankı bir qara sevdaya.
Nə qədər gözləsin müəllim yazıq?
Edir gövdəsinə qəlbi ağırlıq.
Müəllim gözlədi, bir ay gözlədi,
Qayanın özündən haray gözlədi,
Dil-dil ötən Qaya, düşünən Qaya
Deyən müəllimi almadı saya.
Müəllim keçdiyi yollara baxır,
Qayanın həsrəti könlünü yaxır.
O, on beş yaşında nələr bilməyir?
O hansı sahədən xəbər bilməyir.
Bilir işlədiyi xətasını da,
Bilir bu dünyanın mənasını da.

Ovlamış Qayanı böyük oğrular,
Böyük oğrulara olmuş əlaltı.
Yaxşı gəliri var, yaxşı pulu var.
Pul içində üzür onun həyatı.
Şəhərin ən dərin bir bucağında
Yaşayır bu kiçik səfil bəxtəvər.
Onu bir mum kimi tifil çağında
Keçirmiş əlinə pərgar həriflər,
Onun ürəyində bir ikilik var,
Qəlbi qüssələnir bu ikilikdən.

Bilir bu aləmə tanış olanlar,
Onun iradəsi sərtdir bu çəlikdən.
Bir dəfə özünə desəydi: "Əl çək!"
Bilirəm, bu yola düşməzdi bir də.
Gülərdi üzünə böyük gələcək,
Dərdini çəkməzdi onun şair də.
Yeni insanlardan uzaqdır Qaya.
Gündüz "iş"dən çıxıb, uzun gecələr
Gedərkən kinoya, ya teatroya,
Evə qayıtdımı, nə bilməcələr,
Nə hisslər almayır onun ruhunu?..
Gördüyü səhnələr, şəkillər həmən
Şanlı bir aləmə çağırır onu.
Deyir öz-özünə: "Nə alçağam mən!"

### III

Qayanın böylə bir keçmişi vardı:
Xızı dağlarında onlar yaşardı.
Deyirlər, atası kənddə çobanmış,
Nədənsə hirsindən bədəni yanmış.
Sürüdən üç qoyun satmış bir dəfə,
Yoldaşlı dağlarda dalmışdır kefə,
Bu işdən ağası xəbər tutunca,
Üzünü, gözünü çox turşudunca,
"Haqqımı satmışam" – deyə köpürmüş.
Ağası ondakı üsyanı görmüş,
Ordaca bir güllə çaxmış başına,
Qıymış bu dağların can yoldaşına.
Qaya gəlməmişdi onda dünyaya,
Buludlar qoynunda bənzərdi aya.
Köməksiz anası tökərdi qan-yaş.
Bir sabah ruhunda duydu bir təlaş:
Qaya bir dürr kimi doğdu dənizdən,
Bir yardım görmədi keçmişimizdən
Kimsə anasına əl uzatmadı,
Fəryada yetmədi, dada çatmadı.

Qaldı qapılarda qadın, ağladı.
Axırda ürəyi vərəm bağladı.
Zavallı körpəsi əllərdə qaldı,
İtkin maral kimi çöllərdə qaldı.
Bu həyat Qayanın ilk həyatıdır,
Bu səfil insanın ilk həyatıdır.

**IV**

Tufanlı bir gecə, qarlı bir gecə,
Toplanmış bir evə yenə gizlicə
Mehriban səfillər, kefləri çağdır,
Kart masa üstundə daraq-daraqdır.

Q a y a

Ürəyim sıxılır, uşaqlar, artıq
Gəlin yığışdıraq, bəsdir oynadıq,
Burdanca bərabər gedək kinoya.

M i ş k a

Zəhləmizi tökmə, bəsdir, ay Qaya!

Q a y a

Teatro necədir?

M i ş k a

O, bundan da pis.
Görürsən qızışıb yenicə məclis!

P o l a d

Pul çıxar!

M i ş k a

Ver bangi!

P o l a d

Pul çıxar. Birdən qızışma!

M i ş k a

Deyirəm sənə, ver!

*(Mişka uduzmuş,*
*Boğazı qurumuş, dili qurumuş,*
*Çıxmışdır gözləri hədəqəsindən.)*

P o l a d

Qızışma, bu adam qorxurmu səndən?
Şaraq... Guruldadı bir acı sillə.
Düşdü məclisə bir dərin vəlvələ,
Şaraq... bir mis səsi çınladı yenə.
Dostlar bir-birinin düşdü üstünə,
Parladı bıçaqlar, zağlı finkələr;
"Aman, zalım!" – deyə düşdü bir nəfər.
Bu vuruşanları aralayandı,
Bıçaq sinəsinə heçdən dayandı.
İndi məclisdə bir dərin hüzün var,
Fəqət sanmayınız barışacaqlar.
Bunların acığı göylərə sığmaz.
Polad da quşbazdır, Mişka da quşbaz.

Ağlama, dərdini çəkdiyim Qaya.
Nə çıxar boş yerə bu ağlamaqdan?
Bir pərdə çəkməsən sən bu dünyaya,
Oda düşəcəksən bir gün nahaqdan.
Səni də gözləyir belə bir bıçaq,
Səni də gözləyir bir qəmli dəstə.
Alacaq səni də bu qara torpaq,
Həyata doymadan sinəsi üstə.
Sizin ki, daima gülsəniz belə,
Bir matəm süzülür sevincinizdən.
Sizi ki, bir ölüm iztirabilə
Bir qurd gəmirmədə öz içinizdən.
Ölümlə qurtaran bu gecəsindən,
Bu səfil həyatın nəticəsindən
İyrənib evinə qayıdan Qaya,

Dalmış bir uğurlu dərin qayğıya.
Həmən müəllimi yadına salmış,
Başını möhtəşəm xülyalar almış.
“Kişini gözlətdim o zaman”, – deyə,
Qapılmış çox dərin bir bədbinliyə.
Anır bu can deyən yoldaşlarını,
Sonra qan-qan deyən yoldaşlarını.
Anır, bu aləmə nifrət eyləyir,
Nifrəti getdikcə şiddət eyləyir.
Anır, ürəyinə başqa şey gəlir;
Görürsən gözündən onun hey gəlir
Keçir yığın-yığın belə səhnələr:
Fitnələr, ölümlər, nələr, eh nələr...
Qaya öz-özünə düşünür ağlar,
Onu bu dəhşətə bağlayan bağlar
Görəsən, bir kərə qırılacaqmı,
Qaya bu dəstədən ayrılacaqmı?

**V**

Qaya, səfil Qaya tutulmuş artıq;
Xəyalı çalpaşıq, fikri dağınıq.
O, bəzən özünü boğmaq istəyir,
“Bu rəzil həyatdan nə çıxsın?” – deyir.
Xayır, ey küçələr kralı Qaya!
Ey yorğun, qanadı yaralı Qaya!
Bir dəfə əl çəkib sən keçmişindən,
İslahat evində olan işindən
Bərk yapış, o səni hər düşüncədən,
Əzabdan, qayğıdan və işgəncədən,
Qurtarar. Bu gözəl, geniş dünyaya
Bir yeni ürəklə gəlib, ay Qaya,
Yaşarsan mehriban bir insan kimi,
Böyük qurğu quran bir insan kimi.
Qovdu ruzgar kimi illəri illər,
Dəyişdi zamanlar, döndü fəsillər.
Bir gün bahar oldu, bir gün qış oldu;

Qaya o dəstədən ayrılmış oldu.
İşlədi, oxudu, Qaya yüksəldi.
Bir gün müəllimlə üz-üzə gəldi.

Q a y a

Görünür ki, məni tanımadınız,
Günah sizdə deyil, məndədir yalnız.
Mən səfil Qayayam, qoca müəllim!
Ey adı göylərdən uca müəllim!
Xatırında varmı, neçə il əvvəl
Olduqca nəşəli, olduqca gözəl,
İlıq oxşayışlı bir bahar günü,
Sabir bağçasında açıb könlünü
Dedin: "Bu dünyaya yaxşı nəzər qıl,
Gəl sən bu dəstədən biryolluq ayrıl!"
İndi o həyatdan ayrılmışam mən,
Qından qılınc kimi sıyrılmışam mən.

**VI**

Bir gün bir döngədə bir neçə yoldaş
Yenə şirin-şirin aşıq atırlar.
Hamsının ruhunda dərin bir təlaş,
"Cay!" – deyib, "Cuy!" – deyib
marçıldayırlar.
Gəncliyin o gözəl, ilk yaşlarında,
Bunlar səfalətin qurbanlarıdır.
Sərsəm ruhlarında, dik başlarında
Qaynayan keçmişin yadigarıdır.
Ayağı altında bu adətlərin
Həqir torpaq kimi əriyir onlar.
Tutub ətəyindən fəlakətlərin
Bir ölümə doğru yürüyür onlar,
Bunların başçısı köhnə Mişkadır.
Ucaboy, qaraşın bir oğlandır o,
Hər ipdə oynayan, hər şeyə qadir,
Qaya kimi böyük bir tufandır o.

Budur, yanlarından keçdi bir nəfər,
Qoltuğunda qalın, qiymətli cildlər.
Onun şimşək kimi çaxan gözləri,
Uzaq xəyallara baxan gözləri
Parlaqdır göylərin çiçəklərindən;
Birdən Mişka durub qalxdı yerindən;
– Ay uşaqlar, Qaya!..
– Kim?
– Bizim Qaya!..
Hamı təəccüblə baxdı o taya.
Atılan aşıqlar qaldı yerində,
Hamsının heyrətli nəzərlərində
Çırpıntı bir maraq, uçdu bir maraq.
Vardı bu heyrətdə böyük təmtəraq.
Mişka bir quş kimi sıçradı qaçdı,
Köhnə həmdəminə ruhunu açdı.

M i ş k a

Mən ölüm, bəri gəl, Qaya, ay Qaya!
Bu qədər xor baxma bizim dünyaya.
Bunlar bütün sənin yarın, yoldaşın,
Mərdümgirizlikdən biryolluq daşın!
Yenə gəl, yenə get, ayrılma bizdən,
Bu saat nə keçir ürəyinizdən,
Deyiniz, hazıram!

Q a y a

Mişka, çox sağ ol!
Artıq bambaşqadır tutduğumuz yol,
Artıq aramızda bir uçurum var.
Mənim ayrı dərdim, ayrı yolum var.
Daha mən sizinlə barışa bilməm!
Sizin sıranıza qarışa bilməm!

M i ş k a

Neçin?

Q a y a

Neçinlərin cavabı çətin,
Mən sizi çulğayan bu fəlakətin
Bir zaman üzərək çirkablarında,
Səfalətlərində, əzablarında.
Nələr eşitmədim, nələr görmədim?
Orda yaxşılıqdan əsər görmədim.

M i ş k a

Canım, nə yaxşılıq, budur yaxşılıq...
*(Əlini cibinə vurur.)*

Q a y a

Xayır, keçmiş ola bu şeylər artıq,
Siz onu özünüz qazandınızmı?
Heç onu çalarkən utandınızmı?
Bu, bir işdən çıxan sinəsi tərli,
Keçmişi zəncirli, paslı, kədərli
Sevincək evinə dönən dulundur;
Ya əli qabarlı bir oğulundur.
O səni qarğıyır bu saat evdə,
Sən bu səfaləti ürəklə sev də,
Baxalım nə olur sonu?

M i ş k a

Ay Qaya!
Bu qədər bənd olma çox da dünyaya.
Bu sabah girimə düşmüşdü bir "yağ",
Hələ görməmişdim böylə bir "ayağ",
Nəhayət soyaraq buraxdım onu.
Soyulmaq deyilmi həyatın sonu?
Mişkanın əlindən varmı bir qaçan?
Sonradan əlimə keçdi bir "siçan",
Bəlkə bu son sözü unutmuşsunuz,
Çünki siz bambaşqa yol tutmuşsunuz.

Müxtəsər, bu şirin bir ixtilatdır.
Bu da öz yolunda bir cür həyatdır.
Beş günlük ömründə kefə bax, kefə,
Kim gəlmiş dünyaya ikinci dəfə?!.

Q a y a

Sizin çəkdiyiniz bu kef zəhərdir,
Sizi içinizdən yeyir, əridir.
Neçin boş baxalım beş günlük ömrə?
Bir anlıq həyat da ölümə görə,
Məncə qiymətlidir, məncə dadlıdır.
Həyatın hər anı quş qanadlıdır.
Sizə bu nəşəni, zövqü verən də,
Sizi sərxoş edən, əyləndirən də
Həyatda çırpınan diləkdir, fəqət
Bu dilək kirlidir, bu dilək səqət!
Qaranlıq çökürkən gözlərimizə,
Dostlar ağlayaraq, baxarkən bizə,
Güclə ayrılırız bu şən dünyadan,
Ulduzlu dünyadan, gülşən dünyadan.

M i ş k a

Qaya, yadındamı, vaxtilə sən də,
Bizimlə birlikdə keflər çəkəndə,
Bir gözəl yanıqlı şərqi oxurdun?

*(Qaya məlul düşünür.)*

Neçin fikirləşib don kimi durdun?
Xatırında yoxmu?

Q a y a

Xeyir.

M i ş k a

Bu saat.
Çağırım oxusun qoy cunquş Murad.

*(Mişka Muradı çağırır.)*

M u r a d

Gözəl səhər, gözəl hava,
Zalım ovçu çıxdı ova...

M i ş k a

Ay çanım, onu yox, o birin oxu,
O qədər ruhumu oxşamayır bu.

Q a y a

Neçin bu mahnıya xor baxırsınız?
Görünür ki, sizi dünyada yalnız,
Ölümlü kəlmələr maraqlandırır,
Qan deyən nəğmələr maraqlandırır.
Öyləmi?

M i ş k a

Arxadaş, öylədir, öylə.
Hər günüm keçməsə bir vəlvələylə,
Gen dünya başıma dar gəlir mənim,
Sanki baharıma qar gəlir mənim.
Oxu, Murad, oxu, o birin oxu!
O qədər ruhumu oxşamayır bu!..

M u r a d

Mən bir quşam, yox vətənim,
Yoxdur sevib istəyənim.
Atam-anam kimdir mənim?
Bu dünyada, bu dünyada,
Dərd əlindən gəldim dada.

Bir oğlanam, güclü, qoçaq,
Qoltuğumda qanlı bıçaq.
Məni öz dostum satacaq,

Bu dünyada, bu dünyada
Dərd əlindən gəldim dada.

Q a y a

Əvət, öz dostunuz satacaq sizi,
Qana döndərəcək ürəyinizi.
Siz öz içinizdən çürüyürsünüz,
Bir axşam döyünən polad köksünüz
Bir bıçaq altında əriyəcəkdir.
Sizi bir heçliyə sürüyəcəkdir
Tutduğunuz bu yol, bu dəhşətli yol,
Bu sonu uçrumlu, fəlakətli yol.

*(Əl verib küsküncə ayrılır.)*

B i r i

Ay canım, bəri gəl, o bir kənəkdir,
İşi molla kimi vəz eyləməkdir.
Sən də ki, günahkar bir uşaq kimi...
Əsirsən önündə bir yarpaq kimi,

M i ş k a

*(hayqıraraq)*

Beş günlük ömründə kefə bax, kefə,
Kim gəlmiş dünyaya ikinci dəfə?

## VII

Çox zaman şəhərin küçələrində,
Bəzən axınların toplu yerində.
Həmən mişkalara yoldan keçəndə,
Oxucu, baxırsan diqqətlə sən də.
Hər məchul səhnədə oynayır bunlar,
Həyatın ruhunda qaynayır bunlar.
Sanki bizim lisan onlara dardır,
Özlərinə görə dilləri vardır.

Mişkanın mənzili qır tiyanları,
Qaynayan şəhərin dar dalanları.
Çocuq həyatını bu yolda sürdü.
O gah tutulurdu, gah döyülürdü.
Bir dəfə Mişkanı tutdular yenə,
Apardılar onu çocuq evinə.
Pozuq azadlığa alışdığından,
Zavallı ruhuna bir qara zindan
Kimi dar göründü tərbiyə evi,
Saxlamaq olmadı bu yetim devi.
Bir axşam qəfəsi qırıb da qaçdı,
Qaş-daş həyatını alıb da saçdı
Bu boş azadlığın çamurluğuna.
Bəzi yoldaşları uymadı buna.
Onlar oxudular, adam oldular,
Bir kəhkəşan kimi cığır buldular.
Oxucu, dediyim sanma xəyaldır,
Buna qəhrəmanım Qaya misaldır.
İndi gəncliyini keçirir Mişka,
Zənnimcə yaşlıdır Qayadan bir az.
Onun yolu başqa, bununku başqa,
Biri tələbədir, digəri quşbaz.
Yenə də Mişkanın qanı qaralmış,
Uçmuş, qayıtmamış bir göyərçini;
Rəngi heyva kimi solmuş, saralmış,
Yeyir ürəyinin bütün içini.
Bu gün xəbər tutmuş filan yerdədir,
O, söylənən yerə gəldi sevincək,
Onun quşcuğazı yad əllərdədir,
Bilir ya verəcək, ya verməyəcək.

M i ş k a

Mənim göyərçinim uğramış sizə.

P o l a d

Bəli, göyərçinin uğramış bizə.

M i ş k a

Verin!

*(Polad gülür kinayələrlə.*
*Mişkanın ürəyi yanır kədərlə.)*

Gülmə arvad kimi, ver göyərçini!

*(Bu sözlər Poladın kəsir içini.)*

P o l a d

Get burdan, əcəlin tamam olmamış!

M i ş k a

O yan-bu yan etmə, ağıllı danış.
Çox da öz-özünə havalanma sən!
Yanımdan yel olub ötə bilməzsən.

P o l a d

Çənə döyüşdürmə mənimlə, get, get!

M i ş k a

Gəlmişəm, kişisən, nə bilirsən et!

P o l a d

Qan tutmasın səni, sovuş başımdan!

M i ş k a

Çox uzun danışma, bu sən, bu meydan!

(*Poladın gözləri iki ocaqdı,*
*Bıçaq şimşək kimi əlində çaxdı.*)

P o l a d

Al bu göyərçinin, al daha bir də
Sənə qonub gələr quşun qəbirdə,

Saplandı yazığın bıçaq içinə,
Mişka qurban getdi bir göyərçinə.
Mişkanı aldılar xəstəxanaya,
Ordaca qaraldı gözünə dünya.
O kimdir Mişkanın başı üstündə?
Bir kədər buludu gəzir üzündə.
Könlündə çırpınış, gözlərində yaş,
Xəyalında təlaş, ruhunda təlaş.
O kimdir varlığı qüssəli, yaslı?
O ruhu titrəyən, o ağ libaslı,
Təcrübəyə gələn tələbə kimdir?
O bizim Qayadır, yarın həkimdir.
Bu axşam olduqca qəmlidir Qaya,
Əcəba, yenə də düşünür nələr?
Yenə dalmış kimi dərin xülyaya,
Dolanır gözündə hansı səhnələr?
Edir gövdəsinə başı ağırlıq,
Muztərib dolaşır öz otağında.
Yandırıb paprosu çəkmədə sıq-sıq,
Bir xəyal dolaşır qaşqabağında.
Bu xəyal ömrünün ilk sarvanıdır,
Ona bir deyəcək sözü var kimi,
Gəlib keçmişini ona tanıdır.
Tutulur çöhrəsi son bahar kimi.
Bayaqkı səhnəmi bu hala salmış
Ürəkdən sevdiyim bu qəhrəmanı?
Neçin ovlağından enib dolanmış
Bu yeni dünyanın nəşə tərlanı?
Ay Qayam, adına yaraşmayır heç,
Bağrını əridən acı dalğalar.
Gəl bu düşüncədən, bu qayğıdan keç,
Könlünü döyməsin bu qasırğalar,
Bir də bu qurduğun evə-eşiyə,
Bu əlvan otağa yaraşmaz kədər.
Nədir salan səni bu ilişiyə?
Nədir alnındakı qəmli ləpələr?
Xəyal göllərində yorma kəndini,

Bir sərab kimidir acı keçmişin.
Yersiz xülyaların qır kəməndini,
Əlində natamam qalmasın işin.
Haydı, hünərini dostlara bildir,
Sənin bir uğurlu gələcəyin var.
Qurduğun qurğuya əngəl deyildir
İçindən çürüyən, ölən mişkalar.

## SON

Ey keçən dostlarım, yazıq səfillər,
Mən də sizin kimi bir neçə illər
Ümmanlar üstündə başsız, pərişan,
Acı dalğalarla yersiz çarpışan
Bir qərib təknəyə bənzər kimiydim,
Qayəsiz yollarda gəzər kimiydim.
Nə ata çağrışı, nə ana səsi,
Bunların gül kimi lətif busəsi
Ruhuma ətrini saça bilmədi.
Mənim çocuq dərdim heç əksilmədi.
Ah, nələr çəkmədi bu qərib başım,
Dəydi daşdan-daşa müztərib başım,
Bir sabah əlimə keçdi bir kitab...
Aldı çaynağına məni inqilab.
Nə üçün baxalım bir də arxaya?
Sinəmdəki dağın biridir Qaya!

*1935*

## ŞƏNGÜL, ŞÜNGÜL, MƏNGÜL

Biri varmış, biri yoxmuş,
Məzlumların dərdi çoxmuş.
Saqqallı bir keçi varmış,
Gəzdiyi yer qayalarmış.
Dağdan-dağa atlanaraq,
Hər zəhmətə qatlanaraq
Yaşarmış öz əməyilə,
Başqasının köməyilə
Dolanmaqdan utanarmış,
Onun üç yavrusu varmış:
Biri Şəngül, biri Şüngül,
Biri də balaca Məngül.

Şəngülun gözləri qara,
Bənzəyirdi ceyranlara.
Şəvə tükü buruq-buruq,
İncə baldır, qısa quyruq.
Yeni çıxmış buynuzları,
Buxağında qotazları.
Bir yaşında maral çəpiş,
Bacaqları bir dal çəpiş.

Şüngülün gözləri nərgiz,
Sanki dünyadan xəbərsiz.
Gecə-gündüz oynaqlardı,
Anasını qucaqlardı.
Yuxa tükü bəyaz, yumşaq,
Qulaqları sanki zanbaq.
Alnındakı qaşqa gözəl,
Yoxdu bundan başqa gözəl.

Hələ bircə Məngülə bax,
Ayağında səkilə bax.
Yoxdur böylə gözəl çəpiş.
Nazlı çəpiş, təpəl çəpiş,
Yumşaq tükü ala-bula,
Tamamilə başa bəla!

Hər sabah, gün doğar-doğmaz,
Qaranlığı boğar-boğmaz,
Keçi yatağından durub,
Şəngülün halını sorub,
Şüngülə nəzər salardı,
Məngüldən öpüş alardı.
Qapıları gülə-gülə
Bağlayıb çıxardı çölə.
Yamaclarda otlayaraq,
Qayalardan atlayaraq,
Dərələrdən su içərdi,
Yoxdu qəmi, yoxdu dərdi.
Otlamaqdan qayıdarkən,
Çağırardı keçi birdən:
– Şəngülüm, Şüngülüm, Məngülüm,
Açınız qapını mən gəlim.
Ağzımda su gətirmişəm,
Döşümdə süd gətirmişəm,
Buynuzumda ot gətirmişəm.
Bu sözləri eşidincə,
Mələşərdi incə-incə,
Yalnız qalan bu çəpişlər.
Hər üçü sevinər, gülər,
Tez qapını açardılar,
Qanadlanıb uçardılar.
Anaları süd gətirmiş,
Buynuzunda ot gətirmiş.
Yeyərdilər, içərdilər,
Bilməzdilər qüssə, kədər.
Çəpişlərin anaları,

Öpüb xırda balaları,
Qapıları gülə-gülə
Bağlayıb çıxardı çölə.
Bu dağ mənim, o dağ sənin,
Yem toplardı yeyin-yeyin.
Döşlərinə süd yığardı,
Buynuzuna ot yığardı.

Qış getmişdi, yaz olmuşdu,
Elin kefi saz olmuşdu.
Bəzənmişdi dağlar, daşlar,
Gecə-gündüz uçan quşlar,
Göy üzünü dolanırdı,
Daşqın çaylar bulanırdı.
Ala qarlı uca dağlar,
Qış dərdini çəkən bağlar,
Geyinmişdi yaşıl köynək,
Hər yan güldü, hər yan çiçək.

Ana keçi, hallı keçi,
Məmələri ballı keçi
O dağlardan, bu dağlardan,
Durna gözlü bulaqlardan,
Yeyib, içib ətə dolur,
Məmələri südə dolur.
Ana keçi, ana keçi,
Qurban olum sana, keçi!
Səni gözlər Şəngül, Şüngül,
Yuxa tüklü gözəl Məngül,
Səni gözlər çəpişlərin,
Sular axır sərin-sərin,
Şirin otlar dalğalanır,
İnsan baxır, havalanır.
Darəyə en, dağlara çıx,
Yerlər açıq, göylər açıq.
Fəqət bir gün hər tərəf çən,
Görünməzdi gəlib keçən.

Girəvə düşmüşdü qurda,
Dolaşırdı orda-burda.
El içində bir məsəl var:
"Qurd dumanlı gün axtarar".
Qurd çox gəzdi, çox dolaşdı,
Dərələr, təpələr aşdı,
Xatırladı Şəngül, Şüngül,
Yuxa tüklü gözəl Məngül
Yataqda yalnızdır, çapdı,
Gəldi çəpişləri tapdı.

Yazın bu çənli günündə
Durdu yatağın önündə.
Bir az duruxdu yerində,
Od parladı gözlərində.
Səsini dəyişdirərək,
Qurddur, tanınmasın görək,
Dedi: – Şəngülüm; Şüngülüm!
Ey ceyran gözlü Məngülüm!
Ağzımda su gətirmişəm,
Döşümdə süd gətirmişəm,
Başımda ot gətirmişəm.
Tez olun açın qapını, –
Çəpişlər eşitdi bunu.

Yazıq çəpişlər sevincək
Anaları zənn edərək
Gəlib qapını açdılar,
Qurdu görüncə çaşdılar.
Ah, bu zalım, ağzı qara,
Hüçum etdi yazıqlara.
Şəngülü, Şüngülü yedi,
Məngülü tapa bilmədi.
Kefi, duru, damağı çağ,
Qapını açıq qoyaraq,
Çıxdı qaçdı bu qaniçən,
Bürümüşdü ətrafı çən.

Ana keçi dağda-daşda,
Gah o başda, gah bu başda,
Gah dərədə, gah ormanda,
Gah o yanda, gah bu yanda,
Sıldırım dağlar başında,
Qayaların dik qaşında,
Doyunca ot yedi gəldi,
“Balalarım!” – dedi gəldi.

Gəldi yatağın yanına,
Titrətmə düşdü canına.
Görüncə qapını açıq,
Yerində duruxdu yazıq.
Durmayıb içəri girdi,
Ətrafına göz gəzdirdi.
– Şəngül, Şüngül, hardasınız?! –
Gördü bir bucaqda yalnız
Məngül qısılıb oturmuş,
Yazıqca boynunu burmuş.
Anasını görən kimi
Dəyişdi halı, görkəmi.
Tez ayağa qalxdı Məngül,
Anasına baxdı Məngül,
Dedi: – Ana, səndən sonra
Bir duyğusuz, ağzı qara
Gəldi girdi evimizə,
Yamanca toy tutdu bizə.
Şəngülü, Şüngülü yedi,
Mənisə tapa bilmədi.

Keçinin ürəyi yandı,
Öz-özünə acıqlandı.
Ansızın çıxdı bayıra,
Bilmədi ki, getsin hara,
Çünki fikri dağınıqdı.
Gəzdi, gəzdi, gəldi çıxdı
Dovşan damının üstünə.

Söydü ona dönə-dönə.
Bacasından bir daş atdı,
Ayağını tappıldatdı.
Dovşan qalxıb, çıxdı dama,
– Neçin söyürsən adama? –
Deyə ona verdi sual,
Ana keçi coşdu dərhal:
– Şəngülümü, Şüngülümü,
Ah, sən yemisən, öyləmi?
Dovşan dedi: – Bağırma çox,
Mənim bundan xəbərim yox!
Haydı get tülküdən soruş,
Get onunla dalaş, vuruş.

Keçinin ürəyi yandı,
Öz-özünə acıqlandı.
Yumruğunu sıxdı, sıxdı,
Gəzdi, gəzdi, gəldi çıxdı.
Tülkü damının üstünə.
Söydü ona dönə-dönə.
Bacasından bir daş atdı,
Ayağını tappıldatdı.
Tülkü qalxdı, çıxdı dama,
– Neçin söyürsən adama? –
Deyə ona verdi sual.
Ana keçi coşdu dərhal:
– Şəngülümü, Şüngülümü,
Ah, sən yemisən, öyləmi?
Tülkü dedi: – Bağırma çox,
Mənim bundan xəbərim yox!
Gedib canavardan soruş,
Get onunla dalaş, vuruş..

Keçinin ürəyi yandı,
Öz-özünə acıqlandı.
Yumruğunu sıxdı, sıxdı,
Gəzdi, gəzdi, gəldi çıxdı

Canavar damı üstünə.
Söydü ona dönə-dönə.
Bacasından bir daş atdı,
Ayağını tappıldatdı.
Qurd asmışdı südlü aş,
Daş gəldi düşdü birbaş
Qazançanın içinə.
Canavar dedi: – Bu nə?
Kimdir məni dolaşdıran?
Qazançanı bulaşdıran?
Dam üstündə gəzən kimdir?
Ürəyimi üzən kimdir?
Kimdir dəng edən başımı?
Kimdir tozlayan aşımı?
Keçi dedi: – Coşan mənəm,
Dam üstündə qoşan mənəm.
Buynuzlarım qoşa-qoşa,
Hünərin var, çıx savaşa.
Öz-özünə dedi: "Nə var?!" –
Çölə çıxdı tez canavar.
Ana keçi coşdu dərhal,
Canavara verdi sual:
– Şəngülümü, Şüngülümü,
Ah, sən yemisən, öyləmi?
Qurd keçini aldatmaq,
İşi boynundan atmaq,
İstədisə, olmadı,
Zülm yerdə qalmadı.
Söz qoydular, gedəlim,
İşi ayırd edəlim.

Qaş yenicə qaralırdı,
Günəş solur, saralırdı.
Şövqü düşürdü dağlara,
Çəkilirdi uzaqlara.
Ağ buludlar dəstə-dəstə
Göy üzündən dağlar üstə

Yüngül kölgə salırdılar,
Parçalanıb qalırdılar.
Obanın da mal-qarası
Heç kəsilmədən arası
Dönürdülər kəndə sarı.
Obanın gözəl qızları
Əllərində, badya, qazan,
Nə qədər varsa süd sağan
Gözləyirdilər naxırı,
Deyil sözümün axırı.

Az getdilər, üz getdilər,
Dərə, təpə, düz getdilər.
Yaxında bir qazı vardı,
İnsafsız və tamahkardı.
Ana keçi dala qaldı,
Canavar bir quzu aldı.
Gəldi qazının yanına,
Başladı öz yalanına.
Sovqat qazıya xoş gəldi,
Keçisə əliboş gəldi.
Qazı dedi: – Nə var, keçi?
Doğru yoldan kənar keçi...
Yenə nə var, nə deyirsən?
Qazıdan nə istəyirsən?..
Keçi dedi: – Dərdim çoxdur,
Heç halıma yanan yoxdur.
Bunu, aydın bilir hamı,
Qurd yemiş iki balamı.
Qazı dedi: – Yalan demə,
Özgəsinə böhtan demə...
Sən özün çox tərs keçisən,
Keçilərin ən bicisən.
Sən Allahı unutmusan,
Bambaşqa bir yol tutmusan.
Verməyirsən xüms-zəkat,
Hanı gətirdiyin sovqat?

Hər şey anlaşıldı tamam:
“Mən sovqatsız işə baxmam!”
Keçi dedi: – Ey canavar,
Yaxında bir dəmirçi var,
Onun yanına gedəlim,
İşləri ayırd edəlim.

Az getdilər, üz getdilər,
Dərə, təpə düz getdilər.
Dəmirçiyə çatdı onlar.
Dəmirçi soruşdu: – Nə var?
Keçi dedi: – Bilir hamı,
Mənim ikicə balamı
Zülümkar canavar yemiş,
Hər kəsə bəllidir bu iş.
Qardaş dəmirçi, yaxşı bil,
Yalnız mənimkini deyil,
Obanın qoyunlarını,
Kəndin gözəl davarını
Parçalayan, yeyən budur,
“Mənəm-mənəm!” deyən budur.
Bunun hər bir işi qandır,
Bizimlə köhnə düşmandır.
Dəmirçi çox acıqlandı,
Qurdun hiyləsini qandı.
Dedi: – Gərək indi siz
Vuruşub döyüşəsiniz –
Buraxdı öz işlərini,
Dedi: – Ay qurd, dişlərini
İtiləyim sənin gərək!
Qurd dedi: – Tez elə görək.
Dəmirçi bir mıxçıxaran
Kəlbətin alaraq haman
Buraxıb öz işlərini,
Çəkdi qurdun dişlərini.
Nağılçılar bilir bunu, –

Keçininsə buynuzunu
Yaxşı-yaxşı itilədi,
– Haydı, vuruşunuz! – dedi.

Keçi qızğın, qurd əsəbi,
Parıldadı şəvə kibi –
Keçinin də buynuzları.
Qurd gəldi keçiyə sarı.
Keçi gəlmişdi cana,
Qurd atıldı meydana.
Vuruşdular doyunca,
Keçi kəllə vurunca
Qurd bulaşdı al qana.
– Aman, aman, qursağım!
Cırıldı bağırsağım!
Aman, aman, aman, vay,
Öldüm, öldüm, ay haray!
Keçi güldü qurda bir az,
Dedi: – Zülüm yerdə qalmaz..
Balalarımı yeməyəydin,
Vay qursağım deməyəydin!

***1934***

## KƏNDLİ VƏ İLAN

Qaranlıq örtulərin
İçində dərin-dərin
Uyuyan yorğun gecə
Xoruzlar ötüşüncə,
Diksinərək oyandı,
Yandı dan yeri, yandı.
Ulduzlar axdı keçdi,
Həsrətlə baxdı keçdi.
Kirəmidləri bayquş
Qanadından qoyulmuş
Daxmalar üzə çıxdı,
Yollar gündüzə çıxdı.
Ağaclar sərin-sərin
Əsən xəfif yellərin
Titrədi nəfəsiylə.
Quşların nəğməsiylə
Ətirlədi hər yeri
Sabahın çiçəkləri.
Kənddə ucaldı səslər;
Qalxdı, alçaldı səslər.
Həyat bir qanad çaldı,
Kəndi səs-səmir aldı.
Qalxdı çoban ayağa,
Sürünü yaydı dağa;
Çaldı bir incə bəstə.
Kəndlilər dəstə-dəstə
Kənddən uzaqlaşdılar;
Əkinə yaxlaşdılar.
Fəqət əkin, nə əkin...
Hamının ruhunda kin...
Oraq keçməyir işə,
Hamı düşmüş təşvişə:
“Bu il aclıq olacaq,
Gül yanaqlar solacaq”.
Deyə söhbət edirlər,

Tez-tez fikrə gedirlər.
Sünbüllər qarış-qarış..
Hər nəzərdə yalvarış...
“Allaha pənah” deyə
Baxırlar sağır göyə.
Ordan bir səs gəlməyir;
Ruhları yüksəlməyir.
Hamı kədərli, həzin...
Sürünüb dizin-dizin
Yolurlar sünbülləri;
Qabarlanmış əlləri.
Getdikcə göydən günəş,
Yağdırır yerə atəş.
Hamı qan-tər içində,
Dərin dərdlər içində.

Boyda-buxunda uca,
Çolpan adlı bir qoca
Buraxdı tarlasını;
Gələcəyin yasını
Qəlbində duya-duya,
Başında qara xülya,
Bir az dincəlsin deyə
Endi sərin dərəyə.
Əvət, gözəldir dərə,
Gözəldir bu mənzərə.
Gözəldir çağlayaraq
Qıvrılıb axan irmaq.
Gözəldir bu çiçəklər,
Bəzəkli kəpənəklər.
Gözəldir bu ötən quş –
Bir çiçəyə vurulmuş.
Gözəldir yerdə otlar,
Göy uzündə bulutlar.
Gözəldir dağ, daş, orman,
Gözəldir, əvət, hər yan.
Fəqət Çolpan qəmlidir,

Baxışı şəbnəmlidir.
Bu gözəlliklər onu,
Onun sınıq ruhunu
Aça bilməyir fəqət.
Onun bu il təbiət
Kəndli qəlbini sıxmış;
Əməyi boşa çıxmış.
Çolpan bir az dincəldi,
Yenə tarlaya gəldi.
Sürünüb dizin-dizin,
Çalışdı həzin-həzin.
Nə gördü birdən, aman!..
Qarşısında bir ilan...
Bir az geri çəkildi.
Baxışları dikildi
Heyran-heyran ilana,
Adam vuran ilana.
İlan onu görüncə,
Qıvrıldı incə-incə.
Çolpan vurmaq istədi,
Ürəyində "yox!" dedi:
Vaz keçdi acığından,
Sonra dağarcığından,
Aldı bir parça çörək,
Əsərək, titrəyərək,
Atdı ilana sarı.
İlan da ona sarı
Atdı böyük bir qızıl,
Çolpanın parıl-parıl
Yandı solğun gözləri;
Yaşla dolğun gözləri
Oynadı sevincindən.
Taxılların içindən
Parlayıb işıl-işıl,
Sürünüb xışıl-xışıl,
Qayıtdı getdi ilan,
Gör, nələr etdi ilan...

Artıq günəş üfüqdə,
Sarı, solğun boşluqda
Gülürdü lalə kimi,
Qızıl piyalə kimi.
Buludlar dəlik-dəlik,
Qürubda bir pənbəlik...
Üfüq çox düşüncəli,
Xilqətin gizli əli,
Yerə yayır kölgələr;
Dumanlanır ölkələr...
Sakitdir şəffaf sular,
Gümüş kimi saf sular.
Tutularaq kədərə,
Dalğınlaşır dağ, dərə.
Bu axşam Çolpan ancaq
Üfüqlərə dalaraq,
Gözü, könlü sevincək,
Evə dönür gülərək.

Sabah adəti üzrə
Şəfəq altun tüllərə
Bürünüb gülən zaman
Ayağa qalxdı Çolpan.
Yenə getdi biçinə;
Əkinlərin içinə
Girərək həzin-həzin,
Sürünüb dizin-dizin,
Yolurdu sünbülləri,
Qabarlanmış əlləri...
Günəş qızınca yenə
Çolpanın gözlərinə
Haman ilan göründü.
Yavaş-yavaş süründü
İlan Çolpana sarı.
Çolpan da ona sarı
Qorxa-qorxa əsərək,
Atdı bir parça çörək,

İlan qıvrıldı birdən,
Çolpana atdı həmən,
Bir parça sarı qızıl.
Çolpanın parıl-parıl
Yandı gözləri, yandı.
Xəyalı işıqlandı.
Parlayıb işıl-işıl,
Sürünüb xışıl-xışıl,
Qayıtdı getdi ilan,
Gör nələr etdi ilan...
Ha belə bir neçə gün
Sirrini düşündüyün
İlan ilə Çolpanın,
Çolpan ilə ilanın
Sevdası davam etdi,
Bunu hər kəs eşitdi.

Bir gün Çolpanı artıq
İşdən qoydu xastalıq.
Xəstəliyi ağırdı;
Öz oğlunu çağırdı.
Dedi: – "Mehriban oğlum,
Sözümə baxan oğlum!
Sabah sən get əkinə.
O ilan gəlsə yenə,
Saqın, toxunma, çünki
Evimizə bugünki
Şənliyi verən odur,
Bizi güldürən odur.
Gəlsə, çörək verərsən,
Gülər üz göstərərsən".
Sabahı, bilsəydiniz,
Onun oğlu
Necə gəldi biçinə,
Say yoxdu sevincinə.
Sonra çıxdı dağlara,
Baxdı şən irmaqlara.

Ətrafı seyrə daldı,
Bir müddət orda qaldı.
Yerlər, göylər açıqdı;
İlan yuvadan çıqdı;
O, qızmış, qıvrılırdı,
Yazıq oğlanı vurdu.
Gün keçdi, axşam oldu,
Hər şeyin rəngi soldu;
Hər tərəf kölgələndi,
Qaranlıq endi, endi.
Eldəniz harda qaldı?
Hankı diyarda qaldı?
Xəstə atası Çolpan
Ürəyində həyəcan
Baxdı uzun yollara,
Qərib, məhzun yollara.
Qaranlıq endi, endi,
Atası şübhələndi...
Ay doğdu çiçək-çiçək,
Ulduzlar titrəşərək,
Gecəyə can verdilər,
Bir həyəcan verdilər...

Qoca Çolpan bir neçə
Kəndliylə getdi tezcə
Əkinlərinə sarı.
Göyin işılqanları
Ətrafı parlatırdı,
Onun qəlbi atırdı.
Eldənizdən xəbər yox,
İzindən bir əsər yox...

Bu gecə qoca Çolpan
Ruhunda cahan-cahan
Ayrılıq sitəmləri,
Bir cür açdı səhəri.
Erkəndən həzin-həzin

Dərdilə Eldənizin
Sinəsi qalxdı, endi,
Gəzdi bir neçə kəndi.
Eldənizdən xəbər yox,
İzindən bir əsər yox...

Dağ başında bir çoban;
“Yazıq, zavallı Çolpan
Görsə, ürəyi çatlar”,
Deyərək, çəkdi bir car.
Kəndlilər dəstə-dəstə
Dırmandı qaya üstə.
Gəldi təlaşlı Çolpan,
Gözləri yaşlı Çolpan.
Başladı fəryadına,
Sarıldı övladına.
İşini bilən ilan
Çıxmadı yuvasından.
Çolpanın qəlbi yandı,
Bir ocaq kibi yandı,
Dedi: – “İlan ilandır,
İnsanlığa düşmandır.
Ağı bir, qarası bir...
Hamsının yarası bir...”

Sonra bir sabah erkən
Bu dəhşətdən göynəyən
Kəndlilər dəstə-dəstə
Çıxdılar qaya üstə.
Ürəklərində təlaş,
Əllərində yaraq, daş...
Qıvrılaraq bu ilan
Çıxarkən yuvasından,
Tez üstünü aldılar,
Başına daş saldılar.
Doğradılar, əzdilər,
Tək görə bilməzdilər

Əlbəttə ki, bu işi.
Bağırdı Çolpan kişi:
– “Qayanı yıxmalıyız,
Ağ günə çıxmalıyız”.

Çarpışıb haftalarca
Qayanı parça-parça
Doğradılar, tökdülər,
Yerli-dibli sökdülar;
Üzə çıxdı xəzinə.
Kəndlilərin gözünə,
Yeni bir işıq gəldi;
Şadlıq səsi yüksəldi;
Sevindilər, güldülər,
Xəzinəni böldülər.

Çox zaman Eldənizin
Dərdilə həzin-həzin
Yanıb inildədilər,
Nifrət olsun, – dedilər,
Zəhərli ilanlara,
Xalqı aldadanlara!
Coşdular, titrədilər,
Nifrət olsun, – dedilər, –
Yoxsulları aldatan,
Ömrünə xələl qatan,
Şahlara, sultanlara,
Dövlətli ilanlara!

***1935***

## MÜNDƏRİCAT



## ŞEİRLƏR

### 1926



### 1927



### 1928

**Böyük işlər**



**Həyəcan**

**1931**



**1932**



**1932–1933**

**1933**



**1935**



**1936**

## 1936–1937



## Hafizələrdə gələn şeirlər



## Müxtəlif illərin şeirləri

## POEMALAR



## Mənzum oçerk



## Uşaqlar üçün şeirlər



## Mənzum nağıllar

